İBRAHİM MƏMMƏDOV

# Azərbaycana qarşı
# SUMQAYIT TƏXRİBATI
## «Qriqoryanın işi»







BAKI – 2013

*Azərbaycan Milli Elmlər Akademiyası*
*A.A.Bakıxanov adına Tarix İnstitutu Elmi Şurasının*
*qərarı ilə çap olunur.*

**Ön sözün müəllifi**
**və elmi redaktoru:** **Ramiz Mehdiyev,**
*Azərbaycan Respublikası Prezidenti*
*Administrasiyasının rəhbəri,*
*AMEA-nın akademiki*

**Məmmədov İ.**
**M 52** **Azərbaycana qarşı Sumqayıt təxribatı – «Qriqoryanın işi».**
Bakı, «Təhsil», 2013, 336 səh.

Bu kitab Azərbaycan xalqının yaxın tarixində qaranlıq mərhələ təşkil edən Sumqayıt hadisələri haqqında jurnalist təhqiqatının məhsuludur. Ciddi araşdırmalar aparan müəllif faktlar və sənədlər əsasında sübut edir ki, 26-sı erməni və 6-sı azərbaycanlı olmaqla 32 nəfərin ölümünə səbəb olan bu hadisələr erməni fitnəkarlarının və SSRİ DTK-nın Azərbaycana qarşı çox qəddarlıqla düşünülmüş təxribatı, ermənilərin tarixən qonşu xalqlara, birinci növbədə, Qafqazın türk-müsəlman əhalisinə qarşı həyata keçirdikləri təcavüzkarlıq siyasətinin mühüm həlqələrindən biridir.

**M $\frac{4306020600}{053}$ 2013**

**© «Təhsil», 2013**

***BU KİTAB AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ CƏNAB İLHAM ƏLİYEVİN TƏŞƏBBÜSÜ İLƏ YAZILIB VƏ NƏŞR OLUNUB.***

***«1988-ci ilin fevralında Sumqayıtda baş vermiş hadisələr, əslində, Azərbaycan xalqına qarşı törədilmiş təxribatdır. Ona görə də hazırda mənim göstərişimlə bu məsələ haqda cinayət işi yenilənib. İstintaqın hədəfi təxribatın təşkilatçılarını müəyyənləşdirməkdir. İstintaq hərəkətləri tam başa çatdıqdan sonra bu hadisəyə siyasi qiymət veriləcək. Azərbaycan dövləti bu cinayətin açılmasında və təşkilatçıların müəyyənləşməsində maraqlıdır və bu işdə əməkdaşlıq etmək istəyən şəxslər, təşkilatlar və dövlətlərlə əməkdaşlığa açıqdır».***

**İLHAM ƏLİYEV,**
*Azərbaycan Respublikasının Prezidenti*

## MÜNDƏRİCAT

## ÖN SÖZ

**Ramiz Mehdiyev,**
Azərbaycan Respublikası Prezidenti
Administrasiyasının rəhbəri, akademik

*Sumqayıt hadisələri Ermənistanın Azərbaycana qarşı təcavüzünün, Dağlıq Qarabağın Ermənistana ilhaq edilməsi strategiyasının ilkin mərhələsidir. Əlbəttə, həmin dövrdə Sovetlər birliyi formal şəkildə mövcud idi, lakin öz əvvəlki qüdrətini itirmiş və daxili problemlərlə üz-üzə qalmışdı. Sovet rəhbərliyinin daha çox ikili standartlardan irəli gələn mövqeyi, onun Dağlıq Qarabağ məsələsində separatçılara gizlin mənəvi, siyasi dəstəyi ittifaqın gələcəyi haqqında qeyri-müəyyən fikir və düşüncələrin mövcudluğu, erməniпərəst qüvvələrin Moskvada mühüm mövqeyə malik olması ilə izah edilir. Hələ 1987-ci ildə M.Qorbaçovun müşaviri Abel Aqanbekyan Fransaya səfəri zamanı erməni diasporunun nümayəndələri ilə görüşmüş və Dağlıq Qarabağın statusuna, federativ respublikalar arasında inzibati sərhədlərə yenidən baxılmasına söz vermişdi. Burada iki amili xüsusilə qeyd etmək lazımdır: əvvəla, bütün bu fikirlər səslənən zaman Azərbaycanın Moskvada yeganə dayağı olan Heydər Əliyev ermənilərin canfəşanlığı sayəsində M.Qorbaçov tərəfindən hakimiyyətdən uzaqlaşdırılmışdı. Bununla da, ermənilərin Azərbaycana qarşı ərazi iddialarının yenidən gündəmə gətirilməsi üçün şərait yaranmış və opportunizm pəncərəsi açılmışdı. Bundan başqa, Azərbaycana, Gürcüstana və Türkiyəyə qarşı ərazi iddiaları artıq ABŞ və Avropada yaşayan erməni diaspor təşkilatlarının əsas fəaliyyət istiqaməti kimi təyin edilmişdi. Dağlıq Qarabağ məsələsi prioritet olaraq Qafqazda ilkin cəbhə kimi nəzərdən keçirilmiş və bütün diqqət bu istiqamətə yönəlmişdi.*

*Lakin beynəlxalq ictimaiyyəti inandırmaq və sovet rəhbərliyini vadar etmək üçün ilk olaraq erməni xalqının məzlum obrazını gündəmə gətirmək*

*lazım idi. Regionda azərbaycanlı və ermənilərin birgə dinc yaşaması isə bu iddiaların əsaslandırılmasına mane olurdu. Belə bir şəraitdə erməni ideoloqları qonşu respublikalara, o cümlədən Azərbaycana qarşı ərazi iddialarının gerçəkləşməsinə nail olmaq üçün ilk əvvəl ermənilərin, guya ki, azərbaycanlılar tərəfindən sıxışdırılması fikrini yayaraq millətçi hislərinin gücləndirilməsinə çalışdılar. Bir çox Avropa tədqiqatçıları, haqlı olaraq, qeyd edirlər ki, erməni millətçiliyi digər sovet xalqlarından fərqli olaraq, sovet hakimiyyət orqanlarına qarşı mübarizədə deyil, məhz Azərbaycan xalqına qarşı, onun düşmən obrazının yaradılması əhvali-ruhiyyəsi kontekstində formalaşmışdır. Hələ 1984-cü ildə Zori Balayan «Ocaq» kitabında Azərbaycan əleyhinə kəskin çağırışlar etmişdi. O zamankı sovet ideologiyası ilə ziddiyyət təşkil edən, millətçi hislərin oyanışına yönəlmiş həmin kitabın nəşri bu gün də böyük suallar doğurur: nə üçün bu çağırışlara lazımi qiymət verilmədi?*

*1988-ci il fevral ayının 26-da Sumqayıt şəhərində baş verən iğtişaşlar rəsmi məlumatlara əsasən 26-sı erməni və 6-sı azərbaycanlı olmaqla 32 nəfərin ölümünə səbəb oldu və ermənilərin ərazi iddialarının yeni mərhələyə keçidini şərtləndirdi. Bu fakt ermənilərin XX yüzillikdə törətdikləri yeganə cinayət deyil. Ona görə də Sumqayıt hadisələri daha geniş müstəvidə təhlil edilməli, ermənilərin məqsədyönlü şəkildə zorakılığa və qarşıdurmanın güclənməsinə olan meyillərinin səbəbləri araşdırılmalıdır. Lakin qısa bir ön sözdə bütün bunları əhatə etmək qeyri-mümkündür. Bu səbəbdən Sumqayıtda baş verən iğtişaşların mahiyyətini tam anlamaq üçün əsas konseptual xarakterli ideyaları qeyd etməklə kifayətlənəcəyik. İlk əvvəl nəzərdən keçirmək lazımdır ki, nəyə görə ermənilərin strategiyası gərginliyin artmasına yönəlmişdi. Bu baxımdan qısa olaraq dörd məqama diqqət yetirmək lazımdır:*

*Birincisi, ermənilər anladılar ki, hüquqi çərçivədə xalqların öz müqəddəratını təyinetmə hüququna istinad etməklə Dağlıq Qarabağın statusunun dəyişdirilməsinə nail ola bilməyəcəklər. Buna bir neçə səbəb mane olurdu:*

- *sovet hakimiyyətinin ilk vaxtlarında inqilabi hərəkatın genişlənməsi üçün nəzərdə tutulan və geniş təbliğ edilən xalqların öz müqəddəratını təyinetmə hüququ siyasi kontekst və məzmun baxımından zəhmətkeşlərin birgə yaşamaq istəyinə əsaslanmış və ilkin anlamdan daha fərqli interpretasiyaya məruz qalmışdı;*

*– mahiyyət etibarilə xalqların müqəddəratı hüququnun federativ respublikalara şamil edilməsi nəzərdə tutulmuşdu. Xalq, əlbəttə, ümumi qəbul edilmiş tərifin olmadığı üçün geniş müzakirələrə səbəb olan məfhumdur. Lakin sovet ideologiyası onun xüsusi interpretasiyaların obyektinə çevrilməsinin qarşısını almışdı;*

*– ərazi dəyişikliyi və yaxud sərhədlərin dəyişdirilməsi məsələsi yalnız federativ respublikaların qarşılıqlı razılığı əsasında həyata keçirilə bilərdi;*

*– Dağlıq Qarabağ erməniləri Azərbaycan daxilində mövcud olan milli azlıqdır və bu baxımdan azlıqlara şamil edilən hüquqlar çərçivəsində fəaliyyət göstərirlər.*

*İkincisi, Dağlıq Qarabağın erməni əhalisinə qarşı ayrı-seçkiliyin olması, regionun iqtisadi baxımdan zəif inkişaf etməsi, erməni əhalinin süni yollarla muxtar vilayətin ərazisindən uzaqlaşdırılması kimi arqumentlər inandırıcı görünmürdü. Regionun iqtisadi göstəriciləri və sovet rəhbərliyinin bəyanatları iqtisadi xarakterli iddiaların əsassız olduğunu təsdiqlədi. Eyni zamanda keçən əsrin 70 və 80-ci illərində Dağlıq Qarabağda yaşayan ermənilərin sayı kifayət qədər artmış, təxminən 120000-dən 150000-ə qədər yüksəlmişdi.*

*Üçüncüsü, sovet mərkəzi hakimiyyət orqanları açıq şəkildə bildirmişdilər ki, Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi istiqamətində atılan birtərəfli addımlar qeyri-leqaldır. Çoxmillətli Sovetlər İttifaqında sərhədlərin dəyişdirilməsi ilə nəticələnən hər hansı milli azlığın hüquqi statusunun dəyişdirilməsi «Pandora yeşiyi»nin açılmasına və gözlənilməz nəticələrə gətirib çıxara bilər.*

*Bütün bu səbəblər qarşısında Ermənistan rəhbərliyi və erməni millətçi qrupları qərara gəlmişdilər ki, mövcud vəziyyətin dəyişməsinin və sərhədlərin yenidən nəzərdən keçirilməsinə nail olmağın yeganə yolu güc vasitələrindən istifadə və zorakılıqdır.*

*Göründüyü kimi, Ermənistanın Dağlıq Qarabağla bağlı siyasəti daxili siyasi qüvvələrin və xarici diaspor nümayəndələrinin birgə hazırladığı strategiya əsasında mərhələli şəkildə həyata keçirilmişdir.*

*Bundan sonra hadisələrin inkişaf trayektoriyasını əvvəlcədən təxmin etmək mümkün idi. Erməni diaspor təşkilatları və Moskvada bəzi dairələr tərəfindən himayə olunan erməni millətçi qrupları və rəsmiləri Dağlıq Qa-*

*rabağda və Ermənistanda azərbaycanlılara qarşı zorakılıq hallarının təşkil edilməsində birbaşa iştirak etdilər. Hadisələrin sonrakı axarı bir daha sübut edir ki, bütün bunlar proqramlı şəkildə həyata keçirilmişdir.*

*1988-ci il fevralın 12-də Ermənistanda yaşayan azərbaycanlılara qarşı zorakılıq aktlarından sonra təqribən 4000 nəfərdən ibarət ilk qaçqın ordusu öz ata-baba yurdlarını məcburi şəkildə tərk edib Azərbaycana üz tutmuşdu. 1988-ci il fevralın 20-də Dağlıq Qarabağ Muxtar Vilayətinin Ali Sovetinin erməni deputatları regionun Ermənistana birləşdirilməsi ilə bağlı qərar qəbul etmişdilər. Ayın 24-də isə erməni millətçiləri Dağlıq Qarabağ Muxtar Vilayətinin Əsgəran rayonunda 2 gənc azərbaycanlını qətlə yetirmiş və 19 nəfəri yaralamışdılar.*

*Azərbaycan rəhbərliyi sayıq olmalı, hadisələrin qısa zaman ərzində belə kəskin xarakter almasından həyəcan təbili çalmalı, sovet rəhbərliyinin və beynəlxalq ictimaiyyətin diqqətini bu məsələyə cəlb etməli idi. Sırf nəzəri baxımdan həmin dövrdə hər iki xalq arasında münasibətlərin gərginləşməsinin, etnik münaqişə xarakteri almasının və regionda sabitliyin pozulmasının qarşısını almaq mümkün idi. Lakin rəhbərlik daha çox Moskvanın müdaxiləsinə ümid edib, passiv və faktiki olaraq seyrçi mövqe nümayiş etdirirdi. Bu isə sonda hadisələrin nəzarətdən çıxıb, erməni millətçilərinin müəyyənləşdirdiyi istiqamət üzrə inkişaf etməsinə səbəb oldu. Moskvanın Dağlıq Qarabağda xüsusi nümayəndəsi Arkadi Volski öz çıxışında etiraf edirdi ki, bəzi millətçi erməni qruplar bölgədə vəziyyətin sabitləşməsinə mane olurlar.*

*Sumqayıt hadisələrinin istintaqı maraqlı faktlar üzə çıxardı. Həbs edilənlər arasında kənardan gəlmiş ermənilərin olması millətçi qrupların hadisələrdə fəal iştirakından xəbər verirdi. O da məlum oldu ki, hadisələrdən əvvəl Dağlıq Qarabağdan və respublikanın sərhədləri xaricindən bir qrup erməni Sumqayıta gəlmiş, şəhərdə yaşayan ermənilər arasında təbliğat işi aparmış və onların bank hesablarındakı pullarını götürüb şəhəri tərk etmələrini tələb etmişlər. Eyni zamanda SSRİ-nin müxtəlif bölgələrindən şəhərə jurnalistlər gəlmişdilər. Onlar sanki hansısa bir hadisənin olmasını gözləyirdilər. Bunları kim təşkil etmişdi? Jurnalistləri kim dəvət etmişdi? Kim binaların üstündə xüsusi çəkiliş aparılması üçün kamera ştativləri quraşdırmışdı? Əlbəttə, cavabsız suallar çoxdur, lakin bir fakt məlumdur*

*ki, erməni tərəfi Sumqayıt hadisələrindən maksimum yararlanmağa, insanların faciəsi üzərində siyasi məqsədlərə nail olmağa çalışdı. Sanki onların gözlədikləri an yetişmişdi.*

*Aşağıdakı amillər məsələnin müxtəlif aspektlərini aydınlaşdırmağa imkan verir:*

*Birincisi, Sumqayıtda baş verən hadisələr spontan şəkildə həyata keçirilən aksiya olmayıb. Ermənistan rəhbərliyi, Ermənistanın xüsusi xidmət orqanları və millətçi qruplar tərəfindən xüsusi peşəkarlıqla hazırlanmış və sonrakı müvafiq seçimlərin təyin edilməsinə zəmin yaradan strateji plan əsasında həyata keçirilən təxribat idi. Silahlı münaqişə dövründə Ermənistanın xarici siyasət prioritetləri və hərbi fəaliyyət istiqamətləri göstərir ki, ermənilər həmin strategiyanın ikinci mərhələsini həyata keçirməyə başlamışlar;*

*İkincisi, onlar çalışırdılar ki, hər iki xalq arasında gərginlik yaratsınlar və düşmənçilik münasibətlərini qızışdırsınlar, bununla da öz iddialarının təbliği üçün əsas yaratsınlar;*

*Üçüncüsü, erməni təbliğat maşını Sumqayıt hadisələrini geniş işıqlandırmaqla, Qərbdə onların yenidən qırğına məruz qaldıqlarını bəyan etməyə başladı. Qısa müddət ərzində bu haqda erməni mənşəli və ermənipərəst müəlliflər tərəfindən Avropa ölkələrində təhrif olunmuş məqalələr və kitablar yazıldı;*

*Dördüncüsü, bununla onlar ermənilərlə azərbaycanlıların dinc, yanaşı yaşamalarının qeyri-mümkünlüyünü isbat edib Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi tələbini əsaslandırmağa çalışdılar. Qeyd etmək lazımdır ki, 2003-cü ildə Ermənistan prezidenti Robert Koçaryan tərəfindən ifadə edilən «etnik uyğunsuzluq», əslində, status kvo ante (mövcud vəziyyətdən əvvəlki vəziyyətə) qayıdışın qeyri-mümkünlüyünə işarə edirdi. Sağlam təfəkkürə malik siyasi xadimlər və alimlər tərəfindən qınanılan bu ideya Ermənistanın hazırkı rəhbər dairələrinin düşüncə tərzinin və sülh prosesinə olan mənfi münasibətinin göstəricisidir.*

*Sonda qeyd etmək istəyirəm ki, Sumqayıt erməni millətçilərinin Azərbaycana qarşı ərazi iddialarının qurbanına çevrildi. Əlbəttə, tarix öz layiqli qiymətini verəcək. Lakin bizlər də bu hadisələri təfsilatlı şəkildə araşdırıb, gələcək nəsillərə dəyərli tədqiqatlar, təhlillər və faktlar təqdim etməliyik.*

## GİRİŞ

Bu gün bütün mütərəqqi bəşəriyyət üçün ciddi təhlükə sayılan etnik separatizmin ən qorxulu təzahürlərindən biri, heç şübhəsiz, təcavüzkar erməni separatizmidir. Açıq şəkildə bütün türklüyə qarşı nifrət hissi aşılayan bu antibəşəri fenomenin mahiyyətində qonşu xalqlara qarşı ərazi iddiaları irəli sürmək, genosid, terror, deportasiya və müharibə yolu ilə ələ keçirdikləri yad torpaqlar hesabına, təcavüzkar siyasət üzərində qurulmuş bədnam «Böyük Ermənistan» ideyasına nail olunması durur. Bu məqsədlə erməni millətçiliyi, onun ayrı-ayrı nümayəndələri «bütün vasitələr məqbuldur» prinsipi ilə hərəkət edir, qonşu xalqların tarixini saxtalaşdırmaqdan, maddi və mənəvi mədəniyyətini özününküləşdirməkdən belə çəkinmirlər. Ermənilər bütün dünyaya sübut etməyə çalışırlar ki, onlar dünyanın ən qədim xalqlarından biridir. Guya, onların yaratdıqları «Böyük Ermənistan» dünyanın ilkin «dövlət»lərindən biri olaraq Xəzər dənizindən Qara dənizədək böyük bir əraziyə malik olmuşdur, ona görə də onların qonşu xalqların torpaqlarına «tarixi» və «qanuni» hüquqları vardır. Məhz bu səbəbdən ermənilər kompakt yaşadıqları bütün yerləri separatizm ocağına çevirərək bu ərazilərin əsl sahibləri olan yerli millətlərlə münaqişəyə girirlər.

Erməni şovinizmi regionun sivil dünyaya inteqrasiyası yolunda əsas maneə olaraq xalqların və dövlətlərin təhlükəsizliyinin, əmin-amanlığın və gələcək birgəyaşayışının başlıca təhlükə mənbəyinə çevrilmişdir. Çoxsaylı erməni diasporunun maliyyə imkanları, erməni Qriqorian kilsəsinin dini-ideoloji təbliğat maşını, regionda maraqları olan, ermənilərin də mühüm mövqelər tutduqları müxtəlif dövlətlərin, güc mərkəzlərinin ikili standartlar siyasəti də Ermənistanın təcavüzkar siyasətinin daha da genişlənməsinə şərait yaradır.

Bu gün Azərbaycan elmi, publisistikası, jurnalistikası, ümumiyyətlə, bütün ictimai-humanitar sahələri qarşısında beynəlxalq siyasi dairələrdə

və dünya ictimaiyyətində Ermənistan–Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin əsl mahiyyəti və səbəbləri haqqında obyektiv fikir formalaşdırmaq, ermənilərin Azərbaycan xalqına qarşı törətdikləri cinayətlərin xarakterini və miqyasını bütün çılpaqlığı ilə açıb göstərmək, «məzlum», «əzabkeş» cildinə girmiş erməni şovinistlərinin əsl simasını ifşa etmək vəzifəsi durur. Bu bizim həm tarix qarşısında, həm də bütün bəşəriyyət qarşısında ən müqəddəs vəzifəmizdir. Bunu həm də bizdən şəhidlərimizin ruhu, düşmən tapdağı altında olan torpaqlarımızın harayı tələb edir.

Ermənistanın Azərbaycana qarşı ideoloji müharibəsinin əsas istiqamətlərindən birini də regionda baş vermiş tarixi və müasir hadisələri saxtalaşdırmaq yolu ilə dünya ictimai fikrində xalqımızı gözdən salmaq və ləkələmək məqsədi təşkil edir. Şər və yalan bu gün də Azərbaycan Respublikasına qarşı ideoloji təxribatda əsas mübarizə vasitəsidir. Öz məqsədlərinə nail olmaq üçün erməni millətçiləri iğtişaş və qırğınlar törədərək öz soydaşlarının qanını tökməkdən belə çəkinmirlər. Etdikləri cinayətləri isə başqa xalqların boynuna atmağa çalışırlar. XIX–XX əsrlərin bir çox hadisələri bunun əyani sübutudur.

1988-ci ildə Sumqayıt şəhərində təşkil edilmiş cinayətkar siyasi təxribat hadisələri ermənilərin siyasətinin mühüm səhifəsini təşkil edir. Sumqayıt hadisələri ermənilərin tarixən qonşu xalqlara, birinci növbədə, Qafqazın türk-müsəlman əhalisinə qarşı həyata keçirdikləri təcavüzkarlıq siyasətinin mühüm həlqələrindən biridir.

Ermənilər bu gün də Azərbaycana qarşı apardıqları informasiya müharibəsində Sumqayıt amilindən gen-bol istifadə edir, öz işğalçılıq siyasətlərini onunla ört-basdır etməyə çalışırlar. Bunun üçün kütləvi təbliğatın ən müasir vasitələrindən istifadə etməyə, xalqımız haqqında mənfi rəy yaratmağa çalışırlar. Buna əmin olmaq üçün İnternet axtarış sistemində, sadəcə, «Sumqayıt» sözünü yazmaq kifayətdir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev bu amili nəzərdə tutaraq göstərir ki, bizə qarşı informasiya müharibəsi aparılır. Bu, həqiqətdir. Bu informasiya müharibəsinin aparılması işində, əlbəttə ki, ilk növbədə, erməni lobbisi öz fəallığı ilə seçilir. Azərbaycanı qaralamaq, Azərbaycan reallıqlarını danmaq, Azərbaycanı geridə qalmış, antidemokratik ölkə kimi dünyaya təqdim etmək cəhdləri, ilk növbədə, erməni lobbisinin çirkin əməllərindən qaynaqlanır. Onların təsir dairələri kifayət qədər genişdir... Bəzi hallarda Azərbaycana qarşı kampaniya aparılır və çalışırlar ki,

Azərbaycanın imicinə koordinasiya edilmiş şəkildə xələl gətirsinlər. Onların fəaliyyəti məqsədyönlüdür və bu gün erməni lobbisi üçün bir nömrəli hədəf Azərbaycandır. Biz bu mübarizəyə hazır olmalıyıq (3, 23 aprel 2012-ci il).

Deməli, Sumqayıt hadisələri ilə bağlı həqiqətlərin ortaya çıxarılması həm də bizim milli təhlükəsizliyimizin, informasiya təhlükəsizliyinin mühüm tərkib hissəsidir. Çox təəssüf ki, bir çox məsələlərdə olduğu kimi, 1988-ci il Sumqayıt hadisələrinə münasibətdə də biz passiv mövqe tutmuş, bununla da, ermənilərin onlardan öz məqsədləri üçün yararlanmasına bir növ şərait yaratmışıq. Lakin son vaxtlar beynəlxalq vəziyyət dünya ictimai rəyi getdikcə Azərbaycanın xeyrinə dəyişməyə başlayır. Bizim haqq işimiz, həqiqətlər dünyanın ən mötəbər tribunalarından eşidilməyə başlayır. Bunun əsas səbəblərindən biri də regionda baş verən proseslər, Ermənistan–Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin tarixi-etnik kökləri haqqında dünya birliyinin daha çox obyektiv məlumatlar almasıdır. Lakin etiraf etmək lazımdır ki, bizim ümummilli problemimiz olan Dağlıq Qarabağ problemi ilə bağlı hələ də dünya ictimaiyyətində məlumatsızlıqdan doğan yanlış təsəvvürlər və stereotiplər qalmaqdadır. Bu sırada Sumqayıtda baş vermiş məlum hadisələr xüsusi yer tutur.

Azərbaycan tarixinin ağ ləkələrdən təmizlənərək yenidən obyektivliklə yazılması, yaxın keçmişimizdə baş vermiş hadisələrin düzgün şərh edilməsi və onlardan zəruri ibrət dərsləri götürülməsi üçün bu hadisələr, ilk növbədə, qərəzsiz, obyektiv elmi təhlildən keçirilməli, onlara əvvəlcə elmi, daha sonra isə hüquqi və siyasi qiymət verilməlidir.

Sumqayıt hadisələri erməni şovinist dairələrinin Dağlıq Qarabağı zəbt etmək üçün çox incəliklə işləyib hazırladıqları məkrli planın tərkib hissəsi idi. Bu ssenarinin müəllifləri, rejissorları, hətta aktyorları belə Ermənistanın millətçi qüvvələri, sponsorları xaricdəki erməni lobbisi, məsləhətçiləri isə antiazərbaycan dairələr idi.

Sumqayıt hadisələri ermənilərin Azərbaycan torpaqlarını zəbt etmək uğrunda hərəkatının mənəvi-ideoloji fazasından aktiv siyasi-hərbi fazasına keçid oldu.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev Sumqayıt hadisələrini təhlil edərək qeyd edir: «Heç kim üçün sirr deyil ki, Sumqayıt hadisələrini erməni millətçiləri törətmişlər. Bu onların təxribatı idi və orada ən çox qəddarlıq göstərən erməni millətindən olanlar idi. Məqsəd

də aydındır ki, bu hadisələrdən istifadə edib Azərbaycana qarşı əsassız iddialar irəli sürülsün, ondan sonra azərbaycanlılara qarşı soyqırımı ittihamı əsaslandırılsın» (25). Deməli, Sumqayıt hadisələrini törətməklə erməni millətçiləri və onların havadarları Azərbaycana qarşı təcavüzdən əvvəl dünya ictimaiyyətini xalqımız əleyhinə kökləmək, azərbaycanlılar haqqında vəhşi obrazı yaratmaq, bununla da, Dağlıq Qarabağın Azərbaycanın tərkibində qalmasının mümkünsüzlüyü haqqında bütün dünyada ümumi rəy formalaşdırmaq məqsədi güdürdülər. Buna görə də Sumqayıt şəhərində baş vermiş hadisələr Azərbaycana qarşı separatizm, terrorizm və gələcək işğalçı müharibəyə haqq qazandırmaq üçün ermənilər tərəfindən törədilmiş təxribat idi.

Bütün bunlar Sumqayıtda 1988-ci ilin fevralında baş vermiş hadisələrə dönə-dönə qayıdılmasını, bu hadisələrin səbəblərinin, köklərinin dərindən araşdırılmasını, hansı nəticələrə gətirib çıxardığının obyektiv və hərtərəfli şəkildə öyrənilməsini və ibrət dərslərinin çıxarılmasını zəruri edir. Ümummilli liderimiz Heydər Əliyevin qeyd etdiyi kimi, bu gün dövlətimiz, xalqımız qarşısında azərbaycanlılara qarşı əsrlər boyu aparılan soyqırımı siyasəti haqqında həqiqətləri bütün dünyaya yaymaq, beynəlxalq ictimai fikirdə ədalətin bərqərar olmasına nail olmaq, soyqırımı siyasətinin ağır nəticələrinin aradan qaldırılması və bir daha təkrar olunmaması üçün ciddi tədbirlər görmək vəzifəsi durur (24, 33-cü cild, 251).

Sumqayıt hadisələrinə məhdud məkanda, məhdud zaman çərçivəsində baş vermiş lokal hadisə kimi baxılması məsələyə qeyri-elmi yanaşma olardı. Bu hadisələr, artıq qeyd edildiyi kimi, ermənilərin soyqırımı siyasətinin tərkib hissəsi kimi uzun tarixi-siyasi köklərə malikdir. Ona görə də Sumqayıt hadisələrini tarixşünaslıqda «erməni məsələsi»nin tarixinin öyrənilməsi kontekstində nəzərdən keçirmək daha doğru olardı. Bir sıra dünya və rus tarixçilərinin, o cümlədən M.Abeqyanın, A.Anninskinin, V.Veliçkonun, Heredotun, S.Qlinkanın, A.Qriboyedovun, V.Qriqoryevin, U.Dyakonovun, S.Zelinskinin, S.Solovyovun, N.Trubetskoyun, İ.Şopenin və b. əsərlərində (59, 66, 89, 97, 98, 101, 103, 105, 107, 108, 111, 122, 154, 170, 191, 202, 211, 214) ermənilərin mənşəyinə, erməni məsələsinin tarixi köklərinə aydınlıq gətirilir, onların Cənubi Qafqazda, Ön Asiyada gəlmə olmaları tarixi faktlarla tam sübut olunur.

M.Avdeyevin, P.Butkovun, V.Veliçkonun, Q.Qaloyanın, S.Qlinkanın, A.Qriboyedovun, B.Qriqoryevin, S.Zelinskinin, İ.Kanadpeyenin, O.Ka-

çaznuninin, Z.Korkodyanın, A.Lalayanın, C.Makkarti və K.Makkartinin, J.Malevilin, Y.Pompeyevin, N.Şavrovun, İ.Şopenin, Q.Ezovun əsərlərində (60, 65, 86, 89, 98, 101, 102, 103, 111, 125, 127, 137, 138, 142, 202, 210, 211, 214 ) isə erməni əhalisinin rus çarizmi tərəfindən Azərbaycan torpaqlarına kütləvi şəkildə köçürülməsi, erməni–Azərbaycan münaqişəsinin əmələ gəlməsi, ermənilərin qonşu torpaqları ələ keçirmək üçün terrorçuluq əməllərinə başlamaları haqqında çox qiymətli materiallar var.

1980-ci illərin sonlarında ermənilərin Dağlıq Qarabağa ərazi iddialarının artması ilə əlaqədar Azərbaycan tarixçilərinin bu iddiaların əsassızlığını sübut edən, Dağlıq Qarabağın tarixi Azərbaycan ərazisi olduğunu konkret elmi faktlarla təsdiq edən tədqiqatları işıq üzü görməyə başladı. Hazırda Azərbaycan tarixşünaslığı erməni məsələsinin əsl mahiyyətini, ermənilərin azərbaycanlılara qarşı deportasiya, soyqırımı və terror siyasətini ifşa edən kifayət qədər sanballı araşdırmalara malikdir. Əsərdə azərbaycanlı müəlliflərdən C.Həsənli, R.İmanov, T.Köçərli, Q.Qeybullayev, Y.Mahmudov, K.Şükürov, İ.Məmmədov, C.Əsədov, H.Məmmədov, A.Paşayev, İ.Əliyev, Z.Bünyadov, H.Verdiyeva, R.Hüseynzadə, M.Qasımlı, K.İsmayılov, M.Mərcanlı, İ.Niftəliyev, S.Rüstəmova-Tohidi, Ə.Xəlilov və b. bu istiqamətdə apardıqları tədqiqatların nəticələrindən (23, 25, 29, 30, 35, 37, 39, 46, 47, 55, 70, 85, 90, 94, 95, 96, 117, 146, 147, 148, 187, 205, 206, 213), bir sıra kollektiv monoqrafiyaların (12, 13, 23, 39, 125, 126, 143, 185) bu problemlə bağlı materiallarından geniş istifadə edilmişdir.

Tədqiqatın mühüm istiqamətini XX əsrin 80-ci illərində keçmiş SSRİ-də və Azərbaycan SSR-də cərəyan edən hadisələrin təhlili, ölkədə milli münasibətlərin kəskinləşməsi, Dağlıq Qarabağı ələ keçirmək üçün ermənilərin başladıqları təcavüzkar siyasətin araşdırılması təşkil edir. Bu baxımdan həm sovet, həm müasir Rusiya, həm də erməni müəlliflərinin əsərləri müəyyən maraq kəsb edir. Düzdür, onların bir çoxunun, xüsusən erməni müəlliflərinin həmin dövrdə cərəyan edən proseslərə subyektiv, qərəzli münasibəti aşkar görünsə də, onların bəzilərinin hadisələrin episentrində olması, M.Qorbaçovun yaxın ətrafını təşkil etməsi və qərarların qəbulunda yaxından iştirak etməsi həmin müəlliflərin əsərlərinə diqqəti daha da artırır. Xüsusən F.Bobkovun, V.Boldinin, K.Brutunesin, K.Voyevodskinin, M.Qorbaçovun, N.Zenkoviçin, V.Kozlovun, V.Luçenkonun, V.Medvedyevin, A.Mütəllibovun, P.Pixoyanın, Y.Pompeyevin,

N.Rıjkovun, D.Furmanın, G.Şahnazarovun, A.Şubinin əsərlərində (88, 89, 90, 92, 98, 135, 147, 157, 158, 165, 180, 188, 211, 216, 219) bu baxımdan bir sıra diqqət cəlb edən məqamlar vardır. Çox təəssüf ki, Azərbaycanda dövlət və ictimai xadimlərin öz dövrü, əhatəsi, fəaliyyəti barədə xatirələr, gündəlik və əsərlər yazmaq ənənəsi yoxdur. Ona görə də həmin dövrdə Azərbaycan rəhbərliyində vəziyyət, cərəyan edən hadisələr haqqında ilk əldən məlumat almaq çox ciddi problem olaraq qalır.

Sumqayıt hadisələri ərəfəsində ölkədə və respublikadakı vəziyyətin işıqlandırılması baxımından Azərbaycan müəlliflərinin əsərləri və kollektiv əsərlər (7, 12, 36, 38, 41, 47, 51, 60, 70, 156, 185, 190, 191, 200–202, 220) geniş təhlil edilmişdir. Bilavasitə Sumqayıt hadisələrini araşdırarkən çoxsaylı ədəbiyyata müraciət edilmişdir. Bu ədəbiyyatı həm müəlliflərin hadisələrə münasibəti baxımından, həm də orada proseslərin işıqlandırılması baxımından müxtəlif cür təsnifləşdirmək mümkündür. Birinci növbədə, hadisələrin bilavasitə iştirakçısı olmuş və ya həmin zaman ölkə rəhbərliyinin Sumqayıtla bağlı qərar qəbulunda rolu olmuş, sonralar bu hadisələri öz kitablarında, xatirələrində, müsahibələrində qələmə almış müəllifləri (F.Bobkov, M.Qorbaçov, V.Lutsenko, V.Xmeylov, V.Medvedyev, A.Mostovoy, V.Nikolayev, N.Rıjkov, G.Şahnazarov, R.Medvedyev) (88, 89, 106, 147, 157, 158, 163, 175, 188, 216) göstərmək lazımdır. Onlar Sumqayıt hadisələrinə ümumi ölkə miqyasında və millətlərarası münasibətlərin kəskinləşməsi kontekstində baxsalar da, həmin əsərlərdə bu hadisələrə münasibətdə siyasi rəhbərlikdə olan ixtilaflar, partiya rəhbərliyi ilə güc strukturları, xüsusən DTK arasında ziddiyyətlər, SSRİ rəhbərliyinin Dağlıq Qarabağ məsələsinə, ermənilərin separatizm hərəkətinə münasibəti ilə bağlı çox ciddi faktlar vardır və bir sıra mülahizələrdə onlara istinad edilmişdir. Sov. İKP Siyasi bürosu ilə DTK arasında münasibətlərin xarakteri, regionda baş vermiş milli münaqişələrin mənbəyi və s. məsələlər o zamanlar DTK sədrinin birinci müavini vəzifəsində işləmiş, hadisələr zamanı Sumqayıtda olmuş F.Bobkovun əsərlərində geniş işıqlandırılıb (88, 89).

Sumqayıtla bağlı bir çox məqamlar sovet və müasir Rusiya jurnalistlərinin, publisistlərinin məqalələrində və İnternet yazılarında öz əksini tapıb. Əgər sovet dövründə (1988–1991-ci illərdə) Sumqayıt hadisələri ilə bağlı yazılarda bir qədər balanslaşdırılmış xətt özünü göstərirsə (77, 135, 139, 186, 206), müasir rus müəlliflərinin bu hadisələrə münasibətdə qərəzliliyi, əksər hallarda ermənilərin mövqeyindən çıxış etməsi açıq hiss olunur (81,




**SSRİ DTK sədrinin birinci müavini olmuş Filip Bobkovun «Xainləri necə hazırlayırdılar» adlı kitabının üz qabığı**

98, 117, 141, 163, 193). V.İlyuxin (123), A.Mürsəliyev (164), D.Pompeyev (181, 182), D.Furman (211) bu baxımdan xoş istisna təşkil edirlər. Onların yazılarında Dağlıq Qarabağ, Sumqayıt hadisələrinə münasibətdə obyektivlik mümkün qədər gözlənilmiş, bu hadisələrin kökləri, sovet, Rusiya rəhbərliyinin, ziyalıların mövqeyi qərəzsiz şəkildə təhlil edilmişdir.

Dağlıq Qarabağ, o cümlədən Sumqayıt hadisələri ilə bağlı xarici müəlliflər arasında ingilis yazarı Tomas de Vaalın «Qara bağ. Ermənistan və Azərbaycan sülh və müharibə arasında» (2005-ci il, rus variantı – 2007) əsəri xüsusi qeyd edilməlidir. Əsərin birinci və ikinci fəsilləri, demək olar ki, bütünlüklə 1988-ci il və Sumqayıt hadisələrinə həsr edilib. Burada ermənilərin separatizm hərəkatı, Sumqayıt faciəsinə gətirən yollar təfsilatı ilə təhlil olunur. Müəllif həm erməni, həm Azərbaycan, həm də sovet mənbələrinə, hadisələrin bilavasitə təşkilatçıları (ermənilərin) və iştirakçılarının fikirlərinə əsaslanaraq bu hadisələrin baş verməsi haqqında öz mülahizələrini irəli sürür. O, hadisələrlə bağlı mövcud olan bir sıra versiyalara da öz münasibətini bildirir. Azərbaycan tərəfinin versiyalarını da şübhə altına alan Tomas de Vaal, eyni zamanda etiraf edir ki, əgər






**İngilis tədqiqatçısı Tomas de Vaalın «Qara bağ. Ermənistan və Azərbaycan sülh və müharibə arasında» kitabının üz qabığı**

azərbaycanlıların Ermənistandan zorla qovulması haqqında faktlar geniş yayılsa idi, Sumqayıt hadisələrinin ümumi mənzərəsi heç də ağ-qara rəngdə olmazdı (207, 73) (müəllif bu hadisələrdə yalnız azərbaycanlıların günahkar görülməsini nəzərdə tutur – İ.M).

Monoqrafiya hazırlanarkən erməni müəlliflərinin Sumqayıt hadisələrinə həsr edilmiş saysız-hesabsız yazıları da təhlil edilmişdir. Z.Balayan, X.Barseqyan, S.Zolyan, A.Marukyan, A.Melik-Şahnazarov, V.Movsesyan və başqalarının Azərbaycana, Türkiyəyə nifrət hissi aşılayan böhtan və yalan dolu yazılarında (84, 85, 87, 120, 155, 159, 203, 161) hadisələr tam saxtalaşdırılır və iddia edilir ki, əvvəla, guya, rəsmi məlumatların əksinə olaraq, Sumqayıtda 32 deyil, yüzlərlə, hətta minlərlə erməni öldürülmüş, guya, bu hadisələr Azərbaycanın rəsmi orqanlarının razılığı və bütün azərbaycanlıların fəal iştirakı ilə törədilmiş və məqsəd də, guya, erməniləri qorxutmaq, onları Dağlıq Qarabağ uğrunda ədalətli mübarizədən çəkindirmək olmuşdur. Erməni müəllifləri Sumqayıt hadisələrinin azərbaycanlıların milli xislətinə uyğun gəldiyini iddia edir, bununla da, bütöv bir xalqı vəhşi, qaniçən, fanatik kütlə kimi qələmə ver-

məyə cəhd göstərirlər. Sumqayıt hadisələrinin bu cür ermənisayağı «təhlil»inə çoxsaylı erməni saytlarında, o cümlədən www.sumqait.info saytında rast gəlmək mümkündür (228, 229, 233, 232, 231).

Müstəqillik əldə etdikdən sonra müasir siyasi tariximizin bir çox hadisələri kimi, Sumqayıt hadisələrinə də yenidən baxmaq imkanı əldə edilmiş, bir sıra nəşrlər işıq üzü görmüşdür (1, 2, 7, 29, 46, 47, 48, 62, 58, 93, 189). Bəzi nəşrlər istisna olmaqla (30, 47, 58, 189) onların əksəriyyəti üçün səthilik, hadisələrə ümumi yanaşma xarakterikdir. Bunu Sumqayıt hadisələrinin ildönümünə həsr edilən çoxsaylı qəzet məqalələrində (28, 41, 42, 44, 49, 53, 59) görmək mümkündür. Son dövrdə işıq üzü görmüş və Sumqayıt hadisələrinin təhlilini də özündə əks etdirən iki nəşri də qeyd etmək lazımdır. Ç.Sultanovun «İmperiyanın son zərbəsi» adlı əsərində Sumqayıtda baş verənlər SSRİ-nin süqutu, ölkədə baş verən siyasi proseslər, Dağlıq Qarabağ məsələsi fonunda geniş təhlil edilmiş, bu zaman xarici ölkə, əsasən, Rusiya müəlliflərinin kitablarından, İnternet materiallarından geniş istifadə olunmuşdur (201). Sumqayıt hadisələrində dövlət ittihamçısı rolunda çıxış etmiş A.İsmayılovun «Sumqayıt – SSRİ-nin süqutunun başlanğıcı» adlı kitabında (30) müəllif ittiham aktına, eləcə də öz xatirələrinə əsaslanaraq Sumqayıt hadisələrinin bir sıra qaranlıq məqamlarına aydınlıq gətirməyə çalışmışdır. Müəllifin bu hadisələr zamanı respublika rəhbərliyinin tutduğu mövqeyə dair mülahizələri diqqəti cəlb edir. Azərbaycan Dövlət Televiziya və Radiosu Qapalı Səhmdar Cəmiyyətinin Sumqayıt hadisələrinə həsr etdiyi «Sumqayıtın əks-sədası» (2 film) və «Sovet imperiyasının gizlinləri – Qriqoryanın işi» adlı 3 hissəlik sənədli filmləri həm hadisə iştirakçılarının məlumatlarına, həm də o zaman SSRİ rəhbərliyində təmsil olunmuş və Sumqayıtla bağlı proseslərin içində olmuş şəxslərin mülahizələrinə əsaslanaraq hazırlanıb.

Onu da qeyd etmək lazımdır ki, son vaxtlar Sumqayıt hadisələrinin obyektiv araşdırılması, həqiqətlərin dünya ictimaiyyətinə çatdırılması üçün İnternetin imkanlarından daha yaxşı istifadə olunmağa başlanıb. Erməni faşizminin iç üzünü açan, o cümlədən Sumqayıt hadisələrinin əsl mahiyyətini göstərən bir sıra İnternet resursları (77, 223, 227, 230, 234, 235) hazırlanıb. Sumqayıt hadisələrinin təhlilində fəallıq göstərən müəlliflərin, o cümlədən T.Atayevin (71) fəaliyyətini xüsusi qeyd etmək lazımdır.

Beləliklə, 1988-ci ilin fevralında Sumqayıtda baş vermiş hadisələrin ayrı-ayrı aspektləri tarixşünaslıqda və publisistikada işıqlandırılsa da, kompleks şəkildə tədqiqat obyekti olmamış, tarixi kökləri, səbəbləri, baş

vermə şəraiti, hadisələrin gedişi və siyasi nəticələri sistemli şəkildə öyrənilməmişdir. Tədqiqat işinin qarşısında duran əsas vəzifələrdən biri də bu boşluğu doldurmaqdır.

Kitab hazırlanarkən ən müxtəlif mənbələrdən, sənəd və materiallardan, memuar ədəbiyyatından, statistik külliyyatlardan istifadə edilmişdir. XX əsrin 80-ci illərində baş vermiş hadisə və proseslərin mahiyyətini aydınlaşdırmaq baxımından ümummilli lider Heydər Əliyevin və Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin imzaladığı rəsmi sənədlər, söylədikləri fikirlər tədqiqatın ən vacib mənbələrini təşkil edir (4, 17, 24, 25, 26, 52).

Tədqiqatın ən mühüm mənbəyini Sumqayıt hadisələrinin təhqiqinə həsr edilmiş ittiham aktı, şahidlərin ifadəsi, məhkəmənin hökmünü özündə əks etdirən çoxcildlik 18/55461-88 №-li cinayət işinin materialları təşkil edir. Hazırda bu cinayət işi 60-206 №-li cinayət işi kimi araşdırılır. Bu sənədlər, həmçinin **http://www.prokurorluq.gov.az** sumqayit-senedler saytında da yerləşdirilmişdir. Bu monoqrafiya hazırlanarkən, ilk dəfə olaraq 34 cildlik 60-206 №-li cinayət işi tam araşdırılmış, Respublika Prokurorluğunda Sumqayıt işini araşdırmaq üçün yaradılmış komissiyanın apardığı istintaq işinin nəticələrindən istifadə olunmuş, Azərbaycan Respublikasının Milli Təhlükəsizlik Nazirliyinin arxivindəki indiyə qədər aşkar edilməmiş sənədlərdən istifadə edilmişdir. İlk dəfə olaraq hadisələr zamanı SSRİ DTK-nın sədrinin birinci müavini vəzifəsində işləmiş və dəfələrlə Azərbaycan SSR-ə ezam olunmuş Filip Bobkovdan və Sumqayıt hadisələrinin istintaqında iştirak etmiş, daha sonra SSRİ-də baş vermiş analoji hadisələrin təhqiqatına cəlb olunmuş V.Kalniçenkodan geniş müsahibə alınmışdır.

Kitabda, həmçinin Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsinin Siyasi Sənədlər Arxivinin (fond 1, siyahı 83, iş 59, 65) materiallarından geniş istifadə olunmuşdur. Adıçəkilən fondun işlərində Sumqayıt hadisələri ilə bağlı yaradılmış hökumət komissiyasının hesabatları, AKP MK bürosunun qərarları və digər sənədlər toplanmışdır. Bu sənədlərin qiyməti ondadır ki, onlar heç bir zaman nəşr edilməmiş və elmi dövriyyəyə buraxılmamışdı. Erməni separatizminin və təcavüzünün ifşa edilməsi baxımından Azərbaycan Respublikası MTN-in arxivinin (8) sənədləri də mühüm əhəmiyyət kəsb edir. O zamankı SSRİ rəhbərliyinin Sumqayıt hadisələrində rolunu və münasibətlərini araşdırmaq baxımından Sov.İKP MK Siyasi bürosunun sənədləri, o cümlədən 29 fevral 1988-ci il tarixli ic-

lasının stenoqramı (116), müzakirə edilən məsələləri özündə əks etdirən qeydlər (95, 199) əsərdə geniş təhlil edilmişdir.

Azteleradio QSC-nin videoarxivində saxlanılan və Sumqayıt hadisələrinin təhlilinə həsr edilmiş sənədli filmlər (14, 15, 16) də qiymətli mənbələr sırasındadır. Bu mənbələrin əhəmiyyəti onunla ölçülür ki, orada hadisə iştirakçılarının, SSRİ rəhbərliyində təmsil olunmuş bir sıra şəxslərin şəxsi mülahizələri öz əksini tapıb.

1988–1989-cu illərdə Dağlıq Qarabağ və onun ətrafında baş verən hadisələrlə bağlı SSRİ və Azərbaycan SSR səviyyəsində qəbul edilmiş qərarların təhlili baxımından hələ sovet dövründə işıq üzü görmüş sənədlər külliyyatı (13, 19, 126, 130, 167, 196, 208) mühüm mənbələrdir. Sovet dövründə Azərbaycan SSR-in tərkibində DQMV-nin yaranmasını, sosial-iqtisadi, mədəni inkişafının göstəricilərini özündə əks etdirən statistik məcmuələr muxtar vilayətin, guya, Azərbaycan SSR rəhbərliyi tərəfindən ayrı-seçkiliyə məruz qalması haqqında erməni yalanlarını tamamilə ifşa edir (20, 43).

Təhqiqat işində həmin dövrdə SSRİ və Azərbaycan SSR-in mətbu orqanlarında işıq üzü görmüş, Dağlıq Qarabağ və Sumqayıt hadisələri ilə bağlı qəbul edilmiş qərarlar da (6, 18, 21, 31, 32, 63, 64, 65, 138, 183) geniş təhlil edilib.

Monoqrafiya Sumqayıt hadisələrinin lokal səviyyəli hadisə deyil, tarixi uzun əsrlərlə ölçülən erməni məsələsinin tərkib hissəsi, Azərbaycan torpaqlarını ələ keçirmək üçün hazırladıqları məkrli plan və proqramların mühüm həyata keçirmə mexanizmi olduğunu sübuta yetirir, Sumqayıt hadisələrinin erməni strateqləri tərəfindən ustalıqla hazırlandığı, onun əsas təşəbbüskarları, təşkilatçıları və icraçılarının da məhz ermənilər olmasını təsdiq edir. Sumqayıt da daxil olmaqla Dağlıq Qarabağla bağlı bütün fitnəkar hadisələr Moskvada fəaliyyət göstərən erməni lobbisi, imperiyanı qoruyub saxlamaq istəyən erməniprəst qüvvələr tərəfindən idarə olunurdu. Sumqayıt hadisələri SSRİ-də mühafizəkarlarla liberallar arasında ziddiyyətlərin nəticəsi kimi də ortaya çıxmış, ölkədə milli münaqişələrin qızışmasında hər iki tərəfin maraqları müəyyənləşdirilmişdir. Bu hadisələrdən sonra ermənilər və onların havadarları Dağlıq Qarabağda separatizmi genişləndirmək, hərbi yolla regionu Azərbaycandan qoparmaq üçün istifadə etmiş, Sumqayıt təxribatı Qarabağ müharibəsini başlamaq istəyən ermənilər üçün ideoloji rupor rolu oynamışdı.

# I FƏSİL

# SUMQAYIT HADİSƏLƏRİNİN TARİXİ-SİYASİ KÖKLƏRİ

## 1.1. Erməni ekspansionizminin mənbələri və inkişaf mərhələləri

Təcavüzkar erməni millətçiliyinin öz məqsədlərinə çatmaq üçün geniş şəkildə istifadə etdiyi üsullardan biri də tarixi həqiqətləri saxtalaşdırmaq, məlum faktları öz xeyrinə ört-basdır etməkdən ibarətdir. Odur ki, Ermənistanın Azərbaycana qarşı ərazi iddialarının və 1988-ci ildə Sumqayıtda baş vermiş təxribatların səbəblərini tam aydınlaşdırmaqdan ötrü tarixçilərin «erməni məsələsi» adlandırdıqları problemin tarixi-siyasi və ərazi-demoqrafik köklərinə nəzər salmağa ehtiyac vardır.

Tarixi, antropoloji və genetik tədqiqatların nəticələri sübut edir ki, ermənilər nə Cənubi Qafqazın, nə də Ön Asiyanın yerli, köklü əhalisi deyillər [112; 115]. XIX əsrin rus qafqazşünası İ.Şopen açıq şəkildə yazırdı ki, ermənilər mahiyyətcə gəlmədirlər. Onlar Anadolu dağlarının şimal vadilərinə gəlmiş frikiyalıların və ioniyalıların bir qoludur [218, 26]. Tədqiqatçılar qeyd edirlər ki, müasir ermənilərin əcdadı hesab olunan köçəri tayfalar eramızdan əvvəl XII əsrdə Balkan yarımadasından Kiçik Asiyaya keçərək Fərat çayının yuxarı axınlarında məskən salmışlar. İ.M.Dyakonov linqvistik və arxeoloji mənbələrə əsaslanaraq ermənilərin Yuxarı Fərat hövzəsinə köçmələrini təsdiq edir: «Protoermənilər Yuxarı Fərat hövzəsində Auviya və Hurrit-Urartu sivilizasiyalarının hökmranlığı dövründə gəlmə xalqlar kimi ortaya çıxmışlar və onların burada avtoxtonluğundan söhbət gedə bilməz [114]. İ.Dyakonov qədim erməni dilinin hind-Avropa dil qrupuna aid olduğunu təsdiq edərək, onun Erməni yaylasında avtoxton xalqların (hurritlərin, urartuların) dili ilə qohum olmadığını və buna görə buraya başqa yerdən gəldiyini qeyd edir [115, 202].

Maraqlıdır ki, sovet dövründə Ermənistan SSR-də erməni xalqının və ədəbiyyatın tarixinə həsr edilmiş kitablarda da ermənilərin Kiçik Asiyaya

və Cənubi Qafqaza gəlmə olmaları faktı öz əksini tapmışdır. Məsələn, M.Abeqyan qədim erməni ədəbiyyatına həsr etdiyi əsərində ermənilərin Balkanlarda, yunan və frikiyalılarla qonşuluqda yaşadığını, sonra isə Kiçik Asiyaya köçdüyünü təsdiq edir [67, 12]. M.Abeqyan da daxil olmaqla əksər müəlliflər Heredotun hələ miladdan öncə V əsrdə ermənilər haqqında söylədiyi «ermənilər Kiçik Asiyaya Qərbdən – Avropadan köçmüşlər və frikiyalıların varisləridi» [104] sözlərini təsdiq etmişlər.

Ermənilər Cənubi Qafqaz da daxil olmaqla keçib getdikləri və məskunlaşdıqları bütün əraziləri özününküləşdirməyə, erməniləşdirməyə çalışmışlar və nəticədə hazırda erməni milli tarixşünaslığında 26 «Ermənistan» adlı dövlətin olduğu iddia edilir [154, 28].

Ermənişünaslar, əslində, Ermənistanın tarixini deyil, erməni xalqının (ərazinin deyil, etnosun) tarixini yazırlar. Erməni tarixçiləri öz etnoslarının mənşəyini Haykdan götürdüklərini bildirir, «Haykın ölkəsi»ni isə Kiçik Asiya ilə lokallaşdırırlar. Erməni xalqı hay adını Haykın tayfa ittifaqından götürmüş, onun tutduğu ərazi isə Haystan adını almışdır [128, 25].

Ermənilərin müəyyən ərazidə möhkəmlənmək və öz dövlətlərinə malik olmaq cəhdləri heç zaman uğurla nəticələnmirdi, çünki hər zaman və hər yerdə onlar etnik azlıq olaraq qalırdılar [149, 18].

Qədim və orta əsrlərdə ermənilər bir çox xalqların, tayfaların, o cümlədən yunanların, urartuların, romalıların, bizanslıların, midiyalıların, farsların, suriyalıların (bütövlükdə semit və hind-Avropa dünyasının) mədəni irsini mənimsəyərək öz sərvətlərinə çevirmişlər [97, 712]. Ermənilərin başqa xalqların mədəni-mənəvi nailiyyətlərini oğurlayaraq özününküləşdirmək cəhdləri sonrakı dövrlərdə də davam etmiş, erməni mədəniyyəti, folkloru, bir qayda olaraq, türk, Azərbaycan mədəniyyəti, dili əsasında inkişaf etmişdir. Bunu ermənilərin antroponimləri, toponimləri, məişət və təsərrüfat alətlərinin adları, folkloru, musiqisi və s. təsdiq edir. Bunu az-çox obyektivliyi ilə seçilən erməni müəllifləri həmişə təsdiq etmişlər.

Əhəmənilər çarlığının süqutundan sonra Balkanlardan Kiçik Asiyaya köçən, erməni tarixçiləri tərəfindən «erməniləşdirilən» (Y.Mahmudov), əslində isə yalnız ermənilərin əcdadları hesab edilən tayfalar tərəfindən Yuxarı Fərat vadisində kiçik knyazlıq yaranmışdı, regionda baş verən siyasi proseslərdən istifadə edən knyazlıq II Tiqranın dövründə (e.ə. 95–55-ci illər) öz ərazilərini genişləndirməyə (qərb istiqamətində) nail ol-

muşdu. Ancaq Roma sərkərdəsi Pompeyə məğlub olduqdan sonra bu knyazlıq müstəqil dövlət kimi tarix səhifəsindən getməli oldu [156, 21]. (II Tiqran erməni deyil, parfiyalı olub və onun rəhbərlik etdiyi dövlətin Armeniya adlanması onun indiki Ermənistanla etnik və siyasi əlaqəsinin olması anlamına gəlmir – İ.M.)

Qaraqoyunlu dövlətinin himayədarlığından istifadə edən erməni Qriqorian kilsəsi 1441-ci ildə öz iqamətgahını Kilikiyadan Azərbaycan torpağına – Üçmiadzinə köçürməyə nail oldu. Həm Azərbaycanda, həm də Osmanlı imperiyasında ermənilərin etnik azlıq kimi bütün milli-mədəni, mənəvi, iqtisadi ehtiyacları ödənilir, onlara dövlət səviyyəsində himayədarlıq göstərilirdi. Bu himayədarlıqdan və Azərbaycan xalqının tolerant münasibətindən istifadə edərək erməni tacirləri, Qriqorian kilsəsi azərbaycanlılara məxsus torpaqları müxtəlif yollarla ələ keçirməklə öz mövqelərini genişləndirirdilər [153]. Öz ənənələrinə sadiq qalan ermənilər Osmanlı imperiyasının zəifləməsindən istifadə edərək, bu dəfə Qərb dövlətlərinin himayəsinə sığındılar. Avropa dövlətləri isə öz növbəsində ermənilərdən həm Osmanlı dövləti, həm də Azərbaycana qarşı alət kimi istifadə etməyə başladılar.

Rusiya imperiyasının Qafqazı ələ keçirmək siyasətinin başlanması ilə ermənilərin və Qriqorian kilsəsinin xarici oriyentasiyasında dönüş baş verdi. İndi onlar yeni işğalçıların himayəsinə sığınmağı üstün tutdular. Eyni zamanda «erməni məsələsi» də Rusiya imperiyasının Qafqaz siyasətinin tərkib hissəsi kimi təşəkkül tapmağa başladı.

I Pyotrun hakimiyyəti dövründə (1682–1725) rus-erməni münasibətləri daha sıx inkişaf etməyə başlayır. Ruslar Cənubi Qafqazda öz işğalçılıq planlarını həyata keçirmək üçün ermənilərdən mühüm alət kimi istifadə edir, onların vasitəsilə burada özlərinə etnik-siyasi dayaq yaratmağa çalışırdılar. Məhz Böyük Pyotr ermənilərin Rusiyaya köçürülməsinin təşəbbüskarı olmuş və onlara müxtəlif üstünlüklər vermişdi [221, 2].

1722-ci ildə Xəzərin qərb sahillərini ələ keçirən I Pyotr burada yaşayan müsəlman əhalisini köçürmək və onların yerinə erməniləri yerləşdirmək məqsədilə İstanbuldakı səfiri A.Rumyantsevə yeni yaradılmış Xəzər vilayətinə köçmələri üçün erməniləri dilə tutmaq tapşırığı vermişdi. Ermənilərin I Pyotra onları öz himayəsinə götürməsi ilə bağlı çoxsaylı müraciətlərini nəzərə alaraq imperator 10 noyabr 1724-cü il tarixli «Erməni xalqına əlahəzrət Fərman»ında (23) onları öz himayəsinə almağa hazır

olduğunu bildirirdi [198, 721]. Bu fərmanda «erməni məsələsi»nin əsl mahiyyəti açılır. Rusiya Xəzəryanı torpaqları işğal etdikdən sonra burada möhkəmlənmək üçün kifayət qədər hərbi qüvvəyə və yerli əhali arasında dəstəyə malik deyildi. Belə bir şəraitdə diqqət ermənilərə yönəldi. S.M.Solovyev yazırdı ki, Pyotr ələ keçirilmiş torpaqlarda Rusiyanın möhkəmlənməsi üçün orada xristian əhalisinin gücləndirilməsini və müsəlmanların azaldılmasını yaxşı vasitə hesab edirdi. İmperator bunun üçün birbaşa erməniləri göstərirdi [198, 717].

I Pyotr 1724-cü il sentyabrın 24-də ratifikasiyaların mübadiləsi üçün İstanbula göndərilən Aleksandr Rumyantsevə öz əli ilə yazdığı təlimatda gürcü və ermənilərin vəziyyəti və gücünü müəyyənləşdirməyi tapşırmışdı. Məhz belə bir şəraitdə ermənilərin Rusiya tərəfindən işğal edilmiş torpaqlara, konkret halda Xəzər sahili torpaqlara köçürülməsini dövlət siyasətinə çevirən sənədlər meydana gəlir. Pyotr ermənilərin köçürülməsinə dair A.Rumyantsevə reskriptində bütün diplomatik gizlinləri bir kənara qoyaraq, açıq şəkildə bildirirdi ki, əgər türklər bu barədə sizə etiraz bildirsə, cavab verin ki, erməniləri biz dəvət etmişik, onlar həmməzhəblik üzrə himayəçilik xahiş etmiş, biz də xristianlıq naminə imtina etməmişik və i.a. «Erməni deputatları düşməndən qorunmaq xahişi ilə bizə sığınmışlar; əgər biz bunu etmək iqtidarında deyiliksə, onda onlara bizim yeni ələ keçirdiyimiz İran əyalətlərində məskunlaşmağa icazə verək. Biz onlara elan etdik ki, Porto (Osmanlı imperiyası) ilə bağlanmış sazişə əsasən onlara hərbi yardım göstərə bilmərik, amma bizim Xəzər sahili əyalətlərimizdə məskunlaşmalarına icazə verdik və xatircəmlik fərmanını göndərdik. Əgər türklər bu barədə sizinlə danışsalar, onda cavab verin ki, biz erməniləri çağırmamışıq, amma onlarla həmməzhəb olduğumuzdan onları himayəyə götürməyi rica etdilər; biz, xristianlıq naminə, xristian olan ermənilərə rədd cavabı verə bilməzdik, necə ki, vəzir özü də dəfələrlə elan edirdi ki, eyni dinə qulluq edənlərə himayədən imtina etmək mümkün deyil; amma nəzarət etmək lazımdır ki, torpaqlar sazişdə təsdiq edilən tərəfə məxsus olsun, millətlərə isə bu və ya digər tərəfə keçməyə mane olmaq lazım deyil. Portoya isə ermənilərin oranı tərk etməyi daha sərfəlidir, o zaman o, müqavimətsiz ermənilərin torpaqlarına yiyələnmiş olar. Əlavə et ki, əgər Porto bizim ələ keçirdiyimiz İran əyalətlərindən müsəlmanları çağırsa, biz etiraz etmərik; yazılı xatircəmlik tələb etsələr, verin» [198, 731–737].

Pyotrun 1724-cü il 10 noyabrda imzaladığı sənədlər kompleksi «Erməni xalqına ali Fərman»ı və «Ermənilərin Xəzər sahili torpaqlara köçürülməsinə dair ali Buyruqları» əhatə edir. Ali Fərmanda ermənilərin Gilan, Mazandaran və Bakıda məskunlaşdırılmasından bəhs edilir, burada səhvən Bakı İran əyaləti kimi verilir: «Biz sizi ailələrinizlə və nəsillərinizlə öz ali imperator himayəmizə qəbul etmişik və bundan belə sərbəst yaşamanız üçün Xəzər dənizi boyu yeni alınmış İran əyalətlərimizdə sakit yaşayacaq və öz qanunlarınız əsasında xristian məzhəbinə qulluq edə biləcək rahat ərazilərin ayrılmasını əmr etmişik. Nə qədər ki biz xristianlıq naminə sədaqətli erməni millətini öz himayəmizdə saxlayırıq, biz bunun naminə sizə əlahəzrətin fərmanını lütf edirik və həmin yeni alınmış İran əyalətlərinin başçılarına öz adımızdan fərman göndərmişik ki, sizlərdən kimsə oralara gələndə, onlar sizi Gilan və Mazandaranda olduğu kimi, Bakıda və digər uyğun yerlərdə nəinki qəbul etsinlər, hətta yaşamaq və məskunlaşmaq üçün rahat ərazilər ayırsınlar və bundan belə hər cür şəfqətdə və təhlükəsizlikdə saxlasınlar» [37, 51].

257 nömrəli buyruqda Gilan, Bakı və Dərbənddəki imperiya canişinlərinə göstəriş verilirdi: «10 noyabr 1724-cü il. Xəzəryanı vilayətlərin yerli hökumətlərinə ermənilərin məskunlaşması üçün torpaqların ayrılması və onlara hər cür yardım göstərilməsi haqda Ali Fərman». Bu fərman imperator I Pyotrun şəxsi imzası ilə Gilanda idarəçiliyi həyata keçirən briqadir Levaşova, Bakıya – polkovnik Ostafyevə, Dərbəndə – polkovnik və komendant Yungerə, Müqəddəs Xaç qalasına – general-mayor Kropotova göndərilib. Onun bir nüsxəsi də oraya göndərilən ermənilərə verilib.

Gilana göndərilmiş fərmanda yazılırdı: «Erməni xalqı bizdən xahiş edir ki, onları özümüzün himayəmiz altına qəbul edək və yeni əldə etdiyimiz fars əyalətlərində məskunlaşmaları üçün yer ayıraq. Odur ki, sizə göstəriş verirəm ki, Gilan və Mazandarana erməni xalqının nümayəndələri şəhər və kəndlərinizə gəldikdə dərhal onların istədikləri yerlərdə məskunlaşmaları üçün yer verin, onlara hər cür kömək göstərin ki, onlardan heç bir şikayət gəlməsin. İndən belə biz erməni xalqını bizim imperatorun xüsusi himayəsinə qəbul etmişik». Kansler Qolovkin, Andrey Osterman. Bakı, Dərbənd və Müqəddəs Qalaya göndərilmiş və ermənilərin əlinə verilmiş fərmanlarda əlavə olaraq yazılmışdı: «Bakıya, polkovnik Ostafyevə: onlara şəhərdə, Bakı yaxınlığında, Salyanda və kəndlərində və başqa yerlərdə yer ayır». «Dərbəndə, polkovnik və ko-

mendant Yungerə: onlara Dərbənddə, habelə onun ətrafındakı kəndlərdə yer ayır». «Müqəddəs Qalaya, general-mayor Kropotova: onlara Müqəddəs Qala yaxınlığında, Sulaki, Aqraxani və Tərki çayları boyunca yer ayır» [37, 6, 53].

Eyni məzmunlu 259 №-li fərman general-leytenant Matyuşkinə də göndərilmişdi. Fərman belə adlanırdı: «Ermənilərin Xəzəryanı vilayətlərdə məskunlaşması, onların mehriban qarşılanması və əlverişli yerlərdə torpaqların ayrılması haqda Ali Fərman. 10 noyabr 1724-cü il» [37, 54].

Fərmanda göstəriş verilir ki, əlində sənədlə gələn ermənilərə göstərilən yerlərdə torpaq payları ayrılsın. Onlar boş ev və yerlərdən başqa həm də imperiyaya qarşı çıxan və şübhəli olanların ev və torpaqlarında yerləşdirilsin. İmperiyanın əleyhinə çıxan və şübhəli olan şəxslər isə torpaqlardan qovulsunlar [37, 53–54]. 259 №-li fərmanda əvvəlki sənədlərdə olduğu kimi ermənilərin Gilan, Mazandaran, Bakı və Dərbənddə yerləşdirilməsi planlaşdırılırdı. General-leytenant Matyuşkinə göndərilmiş fərmanda deyilir: «Ermənilər Gilana, Mazandarana, Bakıya, Dərbəndə, yaxud bizim oradakı başqa yerlərə gəldikdə onları mehriban qarşılamalı, onlara boş olan şəhər və kəndlərdə həyət və yaşayış yerləri verməlisən. Habelə o yerləri də vermək olar ki, onların sahibləri bizim əleyhimizədirlər və üzərində belə şübhələr var. Əleyhimizə olanlar və şübhəlilərlə isə yuxarıda xatırlanan təlimata uyğun olaraq davranmalı» [37, 54; 94].

Bəzi erməni tarixçiləri yazırlar ki, guya, ermənilər XI əsrə qədər indiki Ermənistan ərazisində yaşayıblar və onları bu ərazilərdən zorla köçürüblər. Rusiya imperiyası bu ərazilərə gəldikdən sonra isə ermənilərin, guya, yenidən geriyə, tarixi ərazilərinə köçürülməsi prosesi başlayıb. Bu yuxarıda göstərilən və aşağıda haqqında bəhs edəcəyimiz sənədlər vasitəsilə təkzib olunur. Məsələn, yuxarıda xatırlanan sənədlərdən göründüyü kimi, çar I Pyotrun fərmanını yerinə yetirən məmurlar ermənilərin yalnız Mazandaran, Gilan, Bakı, Dərbənd və Salyan ərazilərinə köçürülməsini nəzərdə tuturdu. Birincisi, ona görə ki, Rusiya imperiyası işğal etdiyi ərazilərdə xristianların sayını artırmaqla cənub sərhədlərini möhkəmləndirmək siyasəti aparırdı və o, xristianlara müsəlman İranına qarşı sipər, bufer əhali kimi baxırdı. Yəni Rusiya imperiyası ermənilərin bu köçürülməyə iddia etdiyi kimi «tarixi vətənlərinə qaytarmaq» deyil, cənub sərhədlərini möhkəmləndirmək və bufer zolaq yaratmaq vasitəsi kimi baxırdı. Məsələn, Azərbaycan ərazisini, Quba xanlığını, Bakı xanlığını işğal edənə qədər

Rusiya imperiyası erməniləri Dərbənddə də yerləşdirirdi. Belə çıxır ki, Dərbənd də ermənilərin tarixi vətəni imiş? Əgər Rusiya imperiyası XVIII əsrin əvvəllərində Bakı və Quba xanlığını işğal edə bilməsəydi, indi Ermənistan dövləti Dərbənd ərazisində olacaqdı? Həm də I Pyotrun dövründə ermənilərin məhz Dərbənd, Bakı, Salyan, Gilan və Mazandaran ərazisində yerləşdirilməsi ona görə planlaşdırılırdı ki, Xəzər dənizinin sahillərinə nəzarət edə bilsin. Bu ona görə edilmirdi ki, həmin yerlər ermənilərin tarixi vətəni olmuşdur. Ona görə bu məskunlaşma siyasəti aparılırdı ki, ticarət üçün vacib idi. Gilan və Mazandaran İran ərazisində, Xəzərin cənub sahilində əsas ticarət limanları idi. Xəritəyə baxdıqda birmənalı olaraq isbat edilir ki, Rusiya imperiyası erməniləri köçürməklə məhz Xəzərdəki limanlara nəzarəti ələ keçirmək istəyir, eyni zamanda Xəzəri islam dövləti olan İrandan ayıran bufer zona formalaşdırmağa çalışırdı. Ona görə də bu köçürmə imperiyanın kolonizasiya siyasətinin tərkib hissəsi idi.

I Pyotrun ermənilərə istinad etmə siyasətini davam etdirən II Yekaterina Rusiyanın himayəsi altında erməni çarlığının bərpa edilməsinə öz razılığını vermişdi [73, 305]. V.Veliçko Yekaterinanın ermənilərə bu isti münasibətini onun sarayında əxlaq pozğunluğunun və həddən artıq dəbdəbənin mövcudluğu ilə izah edir [96, 79]. Təsadüfi deyildir ki, çariça ermənilərə bu səxavəti müqabilində onlardan bir neçə dəfə çox qiymətli bəxşişlər almışdı [195, 69–73]. Rusiya hökmdarının sarayında tərtib olunmuş plana uyğun olaraq əvvəlcə Dərbənddə möhkəmlənmək, sonra Şamaxı və Gəncəni ələ keçirmək, kifayət qədər ordu topladıqdan sonra Qarabağdan və Sıqnaxdan hücum edərək asanlıqla İrəvanı tutmaq nəzərdə tutulurdu [195, 69].

Lakin Rusiya ermənilərə dövlət yaratmaq ideyasını təlqin etməklə bunu ələ keçirdikləri ərazilərdə həyata keçirməyi heç ağlına belə gətirmirdi. Bu ideya yalnız erməniləri öz tərəfinə çəkmək və onlardan Türkiyə və İrana qarşı sipər kimi istifadə etmək üçün ortaya atılmışdı.

II Yekaterina erməniləri Osmanlı imperiyası ilə Rusiya arasında bufer zona yaratmaq üçün Don çayı üzərində, indiki Rostov-na-Donu şəhəri ərazisində yerləşdirərək orada 1778–1779-cu illərdə erməni koloniyası yaratmışdı. O bu məqsədlə 1779-cu il martın 9-da fərman da imzalamışdı. Bunun bir səbəbi də o idi ki, ermənilər məhz Rusiya imperiyasının cənub sərhədlərində yerləşdirilirdilər və sərhədin necə dəyişməsindən onların

məskunlaşması birbaşa asılı idi. Yeri gəlmişkən, Rostov şəhəri yaxınlığındakı Don üzərində ermənilər II Yekaterinaya minnətdarlıq hissinin ifadəsi olaraq ona abidə də ucaltmışlar. Abidə sovet dövründə götürülsə də, sonralar ermənilər onu yenidən bərpa etmişlər.

Xəzərin hüdudlarında Rusiya imperiyasının daha bir cənub məntəqəsi Həştərxan idi. Elə bu səbəbdən də Rusiya imperiyası Həştərxanda böyük erməni məskənləri yaradır və erməniləri kütləvi şəkildə oraya köçürürdü. Analoji vəziyyət Şimali Qafqazın ərazilərinə də aiddir. Məsələn, Rusiya imperiyasının Qara dəniz sahilində mövqelərini möhkəmləndirmək və Osmanlı Türkiyəsinə qarşı forpost yaratmaq üçün ermənilərin Abxaziyaya köçürülməsi də elə həmin dövrə aiddir. Ancaq sonralar Rusiya imperiyasının cənub sərhədləri Araz çayına qədər genişləndikcə ermənilərin də məskunlaşmasının coğrafiyası dəyişir və onlar cənub sərhədlərinə tərəf məskunlaşmağa başlayırlar. Onların indiki Ermənistanda məskunlaşdırılması da elə bu məntiqdən doğur.

Çox maraqlıdır ki, Rostovda yaşayan ermənilər Rostovun, Abxaziyada yaşayan ermənilər Abxaziyanın, Gürcüstanda yaşayanlar Gürcüstanın, Qarabağda yaşayanlar Qarabağın tarixi erməni torpaqları olduğunu və köçürməyə qədər də burada ermənilərin yaşadığını eyni qaydada, saxta faktlara söykənərək iddia edirlər.

Ermənilərin xarakter və məqsədlərini, əvvəl yaşadıqları yerlərdəki davranışını yaxşı bilən A.Qriboyedov Rusiya imperatoruna məsləhət görürdü ki, erməniləri mərkəzi rus quberniyalarında yerləşdirmək olmaz. Onlar elə tayfalardandır ki, bir neçə on il yaşadıqdan sonra həmin torpaqların onların əcdadlarına məxsus olduğunu bütün dünyaya car çəkəcəklər [156, 25].

Ermənilər isə əlverişli şərtlərlə münbit torpaqlar əldə etmək, məskunlaşmaq, çar Rusiyasının ayırdığı vəsaiti almaq üçün Rusiya imperiyasının yeni işğal etdiyi ərazilərə köçməyə başlamışdılar. Məsələn, dəftərxana işçiləri olan Qolovkin və Ostermanın general-leytenant Matyuşkinə göndərdikləri 259 nömrəli buyruqda göstərilir: «Xüsusi olaraq gəlmiş erməni nümayəndələri məlumat verirlər ki, Qarabağ və Qafandakı ermənilər bizim himayəmiz altında yaşamaq istəyirlər və biz onlara yeni əldə etdiyimiz ərazilərdə torpaqlar verək. Biz nəinki icazə verdik, onları dərhal bizim qramotalarla (№255, 256) geri göndərdik və arxayın etdik ki, həmin əyalətlərə gələ bilərlər» [23]. Bu fakt onu göstərir ki, söhbət «er-

mənilərin tarixi vətənlərinə qayıtması»ndan deyil, Rusiya imperiyasının geopolitik maraqlarından və ermənilərin yeni, əlverişli münbit torpaqlar əldə etmək istəklərindən gedirdi.

1813-cü il Gülüstan və 1828-ci il Türkmənçay müqavilələrindən sonra isə Rusiya imperiyası üçün Osmanlı imperiyasına qarşı bufer xristian ərazisi yaratmaq planları ermənilərin məhz indiki Ermənistan ərazisində kompakt yaşayışını təşkil etmək zərurəti yaratdı. Beləliklə, bu faktlar göstərir ki, ermənilərin kompakt yaşayış əraziləri və köçürüldükləri ərazilər Rusiya imperiyasının cənub sərhədlərinin yerdəyişməsinə uyğun olaraq dəyişir. Cənub sərhədi Dərbənddədirsə, ermənilər Dərbəndə, Gürcüstan ərazisindədirsə, Gürcüstana köçürülür, sərhədlər Qarsla sərhədə qədər genişlənirsə, ermənilər də Qarsla sərhəddə yerləşdirilirdi. Məsələn, 1819-cu ildə ermənilər Gürcüstan ərazisində yerləşdirilmişdilər. Bunun üç səbəbi vardı:

1. Rusiya imperiyasının cənub sərhədi Gürcüstandan keçirdi;
2. Rusiya imperiyası İrəvan xanlığını işğal etməyə hazırlaşırdı;
3. Bu ərazi İran və Osmanlı dövlətləri ilə mübarizə üçün plastdarm kimi müəyyənləşdirilmişdi.

Paskeviçin sözügedən raportunda göstərilir ki, o, İrəvan və Naxçıvan xanlıqları ərazisinə köçürülən erməni ailələrinə kömək üçün Gürcüstana ermənilərin köçürülməsi zamanı istifadə olunmuş, 22 oktyabr 1819-cu ildə təsdiq edilmiş təlimata uyğun hərəkət etməyi planlaşdırır. Əksinə, əgər çar Rusiyasının ordusu Arazın cənubunda tutduğu ərazilərdə qalardısa, onda ermənilər də məhz həmin ərazilərdə yerləşərək oranı tarixi vətənləri elan edəcəkdilər. Bunu general-adyutant Paskeviçin raportu da sübut edir. Raportda deyilir: «Mümkündür ki, bütün Azərbaycanın həmişəlik bizim əlimizdə qalacağına olan ümid orada (Arazdan cənubda) yaşayan xristianları köçməkdən saxlayırdı. Amma indi sülh traktatının imzalanması məlum etdi ki, bizim qoşunlarımız tezliklə bu əyalətlərdən çıxmalıdır. Ona görə də yazın gəlməsi ilə xristianların böyük hissəsi niyyətlərini həyata keçirməyə başlayıblar» [37, 66–69]. («Qafqazda erməni məsələsi»). Bu fakt onu da göstərir ki, ermənilərin məskunlaşmasının əsas ünvanı Rusiyanın cənub sərhədi idi. Onların konkret tarixi-coğrafi missiyaları olmayıb, Rusiya imperiyasının cənub sərhədlərinin necə dəyişməsindən asılı idilər. Sərhədin dəyişməsi ilə onların «vətənləri»nin də ərazisi dəyişirdi. Bir daha qeyd etməyə zərurət var ki, 1724-cü ildə ermənilər üçün «vətən» kimi Dərbənd, Bakı və Salyan, Gilan, yəni Xəzər sahili ərazi seçilmişdisə və onlar həmin

ərazilərə köçürülürdülərsə, 1828-ci ildən sonra onların «vətən»inin ünvanı Naxçıvan və İrəvan xanlıqlarının ərazilərinə, yəni Osmanlı imperiyasının sərhədlərinə doğru dəyişdi. Rusiya ordusu Türkmənçay müqaviləsindən sonra indiki İran ərazisindən çıxmasaydı, ermənilərin «vətən»i indiki İran ərazisində olacaqdı. Yəni ermənilərin indi Ermənistan adlandırdıqları ərazi tarixin gedişindən asılı olaraq Dərbənd, yəni indiki Rusiya və ya indiki İran ərazisində, Azərbaycanda da yaradıla bilərdi. Hər şey Rusiya imperiyasının cənuba doğru nə qədər irəliləməsindən asılı idi.

Bütün bunlar sübut edir ki, ermənilərin tarixi vətənlərinə qayıtması haqda o zamankı sənədlərdə heç bir qeyd yoxdur. Əksinə, Qriboyedovun «Записка об учреждении Российской Закавказской кампании» adlı hesabatında yazılır: «Rusiyada və burada, Gürcüstanda müxtəlif zamanlarda xüsusi hüquqlarla kolonistlər yerləşdirilmişdir (Rostovda, Həştərxanda, Ukraynadakı erməni koloniyaları nəzərdə tutulur – İ.M.). Amma onlar həmin yerlərə az xeyir vermişdilər. Əvvəla, ona görə ki, böyük məsafələrdə səpələnmişdilər və bir-birləri ilə əlaqələri zəif idi (bu məqam da onu göstərir ki, erməni koloniyalarının sərhəd boyu səpələnməsi geopolitik məqsədlərə xidmət edirdi – İ.M.). İkincisi, ona görə ki, onlar nəzarət və rəhbərlikdən məhrum idilər. Həm də yerli iqlimə uyğunlaşa bilməmələri və yerli torpağın xüsusiyyətlərindən xəbərsiz olmaları da onların ilk təcrübəsinin nəticəsiz qalmasına səbəb oldu. Buna görə də aşağıda imza atanlar, Arazın o tayından yenidən Rusiya ərazilərinə keçmiş ermənilərin vəziyyətinə toxunmağı vacib sayırıq. Türkmənçay müqaviləsində nəzərdə tutulmasına baxmayaraq, həmin sənəd imzalanarkən bu çoxsaylı emiqrasiyanın olacağını əvvəlcədən görmək mümkün deyildi. Bizim ordumuzun uzun müddət Xoyda dayanması buna səbəb oldu. Onların qəbul edilməsi üçün heç nə hazır deyil. Bunun üçün pul vəsaiti kifayət qədər deyil. Diyarı tanımamaq, buranın yeni olması onlar üçün məhvedici ola bilər. İsti hava şəraitindən soyuq hava şəraitinə düşmələri və s. çətinliklər hələlik davam edə bilər. Əgər icazəniz olarsa, kampaniya bu problemləri həll edə bilər» [109, 457].

Qriboyedovla Zaveleyskinin 1828-ci il sentyabrın 7-də Tiflisdə imzaladıqları bu hesabatdan çıxan nəticələr belədir:

1. Ermənilər və başqa xristianlardan ibarət koloniyalar əvvəllər də Rusiyanın başqa ərazilərində yaradılmış və bunun nəticələri uğursuz olmuşdu.

2. Ermənilər üçün bu ərazilər yad torpaqlar, yad iqlim idi və Rusiya imperiyası onları burada saxlamaq üçün böyük vəsait xərcləməli olurdu.
3. Qriboyedov və Zaveleyski başqa koloniyalardan və işğal olunmuş İran ərazilərindən erməniləri məhz Cənubi Qafqaza, özü də kompakt yaşayış məskənləri və bir mərkəzdən idarə olunan şəkildə yerləşdirməyi təklif edirdilər.

Azərbaycanlıların İrəvan xanlığı ərazisindən köçüb getməsini və oraya ermənilərin köçürülməsini təmin etmək məqsədilə Türkmənçay müqaviləsinə 12-ci maddə salınmışdı. Həmin maddədə deyilir: «Razılığa gəlmiş ali tərəflər qarşılıqlı razılıq əsasında qərara gəldilər ki, Arazın hər iki tərəfində mülkiyyəti olanlar 3 il ərzində onları azad şəkildə sata və dəyişə (?!) bilərlər. Zati-aliləri Rusiyanın imperatoruna aid olduğu üçün o bu göstərişdən keçmiş İrəvan sərdarı Hüseyn xanı, onun qardaşı Həsən xanı və keçmiş Naxçıvan rəhbəri Kərim xanı çıxarır» [Rusiya–İran Türkmənçay müqaviləsi. 10 fevral 1828, 12-ci maddə].

Beləliklə, ermənilər 1724-cü ildə Rusiya imperiyasının cənub sərhədlərinə Dərbənd, Bakı və Salyana köçürülürdülərsə, 1828-ci ildə Rusiya imperiyasının cənub sərhədləri Qarabağ xanlığı, İrəvan xanlığı və Naxçıvan xanlığının da ərazilərini Araz çayına qədər əhatə etdiyinə görə ermənilərin İrəvan və Naxçıvana köçürülməsi planı işə düşdü. Əlahiddə Qafqaz korpusunun komandiri, general-adyutant Paskeviçin baş qərargahın rəisinə göndərdiyi raport bu köçürmə siyasətini incəliklərinə qədər açmağa imkan verir. Artıq yuxarıda qeyd edildiyi kimi, Türkmənçay müqaviləsindən sonra İran ərazisində yaşayan ermənilər Rusiya ordusunun Arazın cənubundakı əraziləri tərk edəcəyini görüb Rusiya ordusu ilə birlikdə Arazın şimalındakı ərazilərə köçməyə razılıq verirlər. Birinci ona görə ki, onlar müharibə zamanı Rusiya ordusuna kömək etmişdilər və Rusiya ordusu çəkildikdən sonra cəzalandırılacaqlarını düşünürdülər. Digər tərəfdən də general-adyutant Paskeviçin onları köçürmək üçün göndərdiyi, erməni dilini bilən, erməni əsilli zabitlərə rəhbər təyin edilmiş polkovnik Lazarev erməniləri dilə tutur və qorxudurdu ki, rus qoşunları çıxandan sonra onları pis tale gözləyir. Paskeviçin polkovnik Lazarevə göndərdiyi təlimatlarda ermənilərin köçürülməsi üçün qorxutma və eyni zamanda şirnikləndirmə metodlarından istifadə edildiyi aydın olur. Məsələn, Paskeviçin Lazarevə verdiyi tapşırıqlarda deyilirdi: «1. Dərhal bizim qoşunların tərk edəcəyi yerlərə və xristianların daha çox məskun-

laşdığı Marağa ətrafına getsinlər və xristianların həqiqi niyyətlərini öyrənsinlər ki, onlar, doğrudan da, bizim nəzarətimiz altında olan əraziyə köçmək istəyirlər. 2. Onların razılığını almaq üçün heç bir zorakı metoddan istifadə olunmasın. Amma onlara təlqin edilsin ki, Avropada ən qüdrətli xristian imperatorun təbəəsi olmağa razı olarlarsa, Rusiya qanunları altında xeyir görə və xoşbəxt həyata qovuşa biləcəklər. 3. Xristianlara hökumət adından ümid verin ki, ticarətlə məşğul olan köçkünlər ümumi ticarət hüquqlarından istifadə edə biləcəklər; köçkünlər isə kifayət qədər münbit torpaqlarla təmin ediləcək, 6 il vergidən azad olunacaq, 3 il zemstvo töycüsünü verməyəcəklər. 4. Bizim ordumuzun tezliklə çıxacağı ərazilərdə, o cümlədən Marağada və ətrafında erməniləri dilə tutmaq lazımdır ki, onlar qoşunlarla birlikdə köçməyə başlasınlar. Ona görə ki, qoşunların çıxmasından sonra onlar farslar tərəfindən nəinki incidilməyə və sıxışdırılmağa məruz qalacaqlar, həmçinin müxtəlif bəhanələrlə həbs oluna bilərlər. 5. Ərzaqla təmin olunmalarını asanlaşdırmaq üçün çalışın ki, köçürülən hər bir partiya 150-dən 300-ə qədər ailəni əhatə etsin». Rusiya imperiyasının apardığı siyasətin əsas mahiyyətini birmənalı olaraq açan və bu siyasətin məhz azərbaycanlılara, türklərə, müsəlmanlara qarşı olduğunu sübut edən həqiqət anı Paskeviçin Lazarevə göndərdiyi təlimatın 12-ci maddəsində əks olunub. «12. Ümumiyyətlə, xristianları razı salmaq lazımdır ki, onlar bizim xristian əhalisinin sayını artırmaq istədiyimiz Naxçıvan və İrəvan vilayətlərinə getsinlər. Üzümçü və yaxınlıqda yerləşən 3 erməni kəndinin əhalisinin isə Qarabağa köçürülməsinə icazə verilsin. Ona görə ki, bu əyalət onlara daha yaxındadır» [105, 103].

Bu maddədən çıxan nəticə belədir:

1. Rusiya imperiyası İrəvan və Naxçıvanda xristian əhalisinin sayının artırılması və müsəlmanların sıxışdırılması siyasəti aparırdı.
2. Bu fakt göstərir ki, həmin ərazilərdə müsəlmanların sayı xeyli çox idi.
3. Ermənilər Qarabağa ona görə köçürülürdü ki, həmin bölgə onların tərk etməli olduqları İran ərazisinə daha yaxın idi və uzun yol qət etməmək üçün məhz Qarabağ ərazisinə köçürülmələrinə göstəriş verilmişdi. Bununla da, «ermənilərin tarixi vətənlərinə qayıdışı» kimi saxta tezis bütün bu arqumentlərlə təkzib edilir.

Bu faktlar ermənilərin nə üçün məhz indiki Ermənistan ərazisinə köçürülməsini izah edir. Belə görünür ki, ilk növbədə, məqsəd Osmanlı təhlükəsinə qarşı xristianlardan ibarət bufer zona yaratmaqdır. İkincisi,

Türkiyədən köçürülən ermənilərin məhz indiki Ermənistan, o zamankı İrəvan xanlığı ərazisinə yerləşdirilməsi bölgənin yaxınlığına görə daha sərfəli idi. Üçüncü səbəb isə Qriboyedov və Zaveleyskinin sözügedən təkliflərində göstərilirdi. Əvvəlki erməni koloniyaları iqlim sərtliyi üzündən effektli deyil və onların cənub rayonlarına köçürülməsinə ehtiyac da bundan yaranır [109, 475].

Paskeviçin raportunda göstərilir ki, ermənilərin İrəvan və Naxçıvan xanlıqlarının ərazilərinə köçürülmələri üçün komitə yaradılacaq (Paskeviçin raportu. 3 mart 1828-ci il. Təbriz şəhəri) [37, 69].

Onun komitəyə ünvanladığı təlimatda əmr edilirdi: «Yaxşı olar ki, İrəvan müvəqqəti İdarəsi və Komitəsi İrəvana köçürmə apararkən az məskunlaşmış Naxçıvan və ona aid olan Ordubad, Meğri və Qafan dairələrini də diqqətdən kənarda qoymasınlar».

Rusiya imperiyası Osmanlı imperiyası və Qacarlar dövlətinin şimal sərhədlərinə yaxınlaşdıqca ermənilərin də himayəsində yaşadıqları dövlətlərə xəyanəti artır və Rusiyaya meyli güclənirdi. Rusiya imperiyasının XVII əsrin sonlarından – XX əsrin əvvəllərinə qədər osmanlılarla apardığı səkkiz müharibənin ən mühüm nəticələrindən biri Qara dənizə və Xəzər dənizinə çıxış əldə etməsi və Qafqazı ələ keçirməsi oldu. Rusiyanın bu geosiyasi qələbələrindən ruhlanan ermənilərin xəyanətkarlığı da yeni forma və məzmun almağa başladı. İndi onlar silahlı dəstələr yaradır, rus ordusunun hərbi əməliyyatlarında iştirak edir, onun ərzaqla təminatını həyata keçirir, kəşfiyyat məlumatları ilə təmin edirdilər [221, XIX, XXIII; 179, 20–35].

Çar Rusiyası ermənilərin və Qriqorian kilsəsinin xidmətlərini nəzərə alaraq onları Osmanlı imperiyası və Qacarlar İranından kütləvi surətdə Şimali Azərbaycan ərazisinə, o cümlədən İrəvan, Qarabağ, Naxçıvan, Gəncə xanlıqlarının ərazilərinə gətirməyə başladı. Köçürmə prosesi Rusiya–İran (1826–1828) və Rusiya–Osmanlı (1818–1829) müharibələrindən sonra daha geniş vüsət aldı. Erməni əhalisini Azərbaycan ərazilərinə köçürməklə rus çarizminin əsas məqsədi işğal etdiyi ərazilərdə özü üçün etnokonfessial dayaq yaratmaqdan ibarət idi. Xristian əhalisinin (İ.M.) sayının mümkün qədər artırılması nəzərdə tutulan Naxçıvan və İrəvan vilayətinə köçüb gəlmələri üçün xristianları (erməni – İ.M.) razı salmaq lazımdır [195, 157]. Bu məqsədlə, hətta köçürülmələr üzrə xüsusi komitə də təşkil olunmuşdu [105, 105].

Təkcə 1828–1829-cu illərdə İran ərazisindən Şimali Azərbaycan torpaqlarına 6946 ailə və ya 35560 nəfər erməni köçürülmüşdü. Onlardan 2558 ailə Naxçıvan əyalətində, 3000 ailə (təqribən 15000 nəfər) isə Qarabağda yerləşdirilmişdi [217, 539; 195, 369; 110, 125–127].

Azərbaycan torpaqlarına köçürülən ermənilər üçün çar hakimiyyəti geniş güzəştlər vermiş, onlar uzun müddətə vergilərdən və mükəlləfiyyətlərdən azad edilmiş, azərbaycanlılara məxsus torpaqlar onların əlindən alınaraq erməni ailələrinin ixtiyarına verilmişdi [105, 108–109].

Yeri gəlmişkən, Cənubi Qafqazda erməni əhalisinin, əsasən, köçürülmə mexanizmi vasitəsilə sayının sürətlə artması faktını erməni müəllifləri də (V.A.Parsamyan, Q.A.Qaloyan, S.A.Aqayan və b.) etiraf edirlər. Q.A.Qaloyan açıq şəkildə yazırdı ki, XIX əsrin əvvəllərində İran dövlətindən Rusiya ərazilərinə 40000, Türkiyədən isə 90000-dən çox erməni köçürülmüşdür [100, 12].

Azərbaycan ərazilərində erməni əhalisinin sayının süni surətdə artırılması prosesi XIX əsrin ikinci yarısında da davam etmiş, nəticədə qədim Azərbaycan torpaqları olan İrəvanın, Naxçıvanın, Qarabağın, Zəngəzurun etnik tərkibində ermənilərin xeyrinə dəyişikliklər baş vermişdi. Təkcə keçmiş İrəvan quberniyası ərazisində köçmə ermənilərin sayı 1831-ci ildə 81610-dan (onların da əksəriyyəti gəlmə idilər – İ.M.) 1873-cü ildə 221191 nəfərə çatdırılmışdı [118, 166–170]. 1886-cı ildə İrəvan quberniyasında ermənilərin sayı 375700, 1897-ci ildə 439926, 1917-ci ildə isə 669871 nəfərə çatmış, 20 il ərzində (1897–1917-ci illər) 34,3% artmışdı [97].

Analoji dəyişikliklər ərazisinə erməni əhalisinin köçürüldüyü Azərbaycanın digər bölgələrində də baş verirdi [97, 77–78].

Ermənilər xüsusən Bakının milli tərkibi ilə bağlı çoxlu uydurmalar yaymaqda davam edir, həyasızcasına onun tarixən «rus-erməni-fars şəhəri» olduğunu və yalnız sovet dövründə türkləşdiyini iddia edirlər [174, 1999, 22 sentyabr]. Bakının tarixi, xüsusən orta əsrlər tarixi haqqında Azərbaycan tarixşünaslığında kifayət qədər tədqiqatlar mövcuddur [80]. Artıq qeyd edildiyi kimi I Pyotr dövründə Xəzəryanı ərazilər ələ keçirildikdən sonra Rusiya dövlətinin əsas məqsədlərindən biri də burada etnikdini dayaq yaratmaq üçün erməni əhalisinin Bakı və Dərbənd şəhərlərinə köçürülməsi olmuşdu. Lakin o zaman bu məqsədi reallaşdırmaq mümkün olmasa da, 100 ildən sonra, XIX əsrin əvvəllərində Şimali Azərbaycanın Rusiyanın tabeliyinə keçməsi ilə bu məqsəd mərhələ-mərhələ həyata keçi-

rilməyə başlandı. Məhz həmin zamandan Bakıda erməni əhalisinin (eləcə də digər gəlmə əhalinin) sayı sürətlə artmağa başlamış, onların burada iqtisadi fəaliyyəti də güclənmişdi. Tədqiqatçı F.Tağıyevin hesablamalarına görə 1816-cı ildə burada 5270 müsəlman və 238 erməni, 1860-cı ildə 11570 müsəlman və 655 erməni yaşayıb [205, 54–55]. XIX əsrin II yarısında neft sənayesinin coşqun inkişafı ilə əlaqədar Bakı əhalisinin tərkibində həm keyfiyyət, həm də kəmiyyət dəyişiklikləri baş vermişdir. 1860–1897-ci illərdə şəhərin əhalisi 9 dəfə artmış, bu artım ən çox ermənilərin və rusların sayında özünü göstərmişdi. 1897-ci ilin siyahıyaalmasının nəticələrinə görə, burada 40341 azərbaycanlı (bütövlükdə 48000-ə yaxın müsəlman) və 19098 erməni yaşayırdı. 1917-ci il Qafqaz təqviminə görə, Bakıda 182828 azərbaycanlı, 9430 Qafqaz dağlıları, müsəlmanlar, 94894 nəfər rus və 75522 nəfər erməni yaşayırdı. Sonuncular arasında cəmi 24605 nəfər «yerli əhali» sayılırdı, qalanları «müvəqqəti yaşayanlar» qrupuna daxil idi [131]. Deməli, Bakı əhalisinin mexaniki artmasına baxmayaraq, burada azərbaycanlılar sayca üstünlük təşkil etməkdə davam edirdilər. Lakin qeyri-yerli millətlərin, xüsusən ermənilərin Bakıda və onun ətrafında sürətlə artması buranın etnosiyasi, etnomədəni həyatına mürəkkəb təsir göstərməmiş deyildi. Şəhərin siyasi, iqtisadi həyatında, idarəetməsində ermənilərin rolunun güclənməsi, əslində, imperiya siyasətinin təzahürü sayılmalıdır.

Rusiya çarizminin Şimali Azərbaycan torpaqlarını erməniləşdirmək siyasətinin nəticəsi olaraq burada yaşayan ermənilərin sayı XIX əsrin 20-ci illərindəki 51530 nəfərdən 1916-cı ildə 1211145 nəfərə çatmış, təqribən 24 dəfə artmışdı [156, 24–25; 97, 78]. Çarizmin siyasətinin bu nəticələrini rus müəllifləri də təsdiq edirlər. N.Şavrov hələ 1911-ci ildə etiraf edirdi ki, hazırda Zaqafqaziyada yaşayan 1300000 erməninin 1000000-u yerli sakinlər deyildir və bu əyalətlərə bizim tərəfimizdən köçürülmüşdür. Sonralar o qeyd etmişdi ki, «Zaqafqaziyada dövlətin (Rusiya dövlətinin – İ.M.) 100 illik hökmranlığı dövründə işğal edilmiş torpaqlara 1200000 yad xalq (erməni – İ.M.) və 24000-ə qədər rus köçürülmüşdü [215, 64–71].

Azərbaycanın Rusiyanın əlinə keçməsi ilə dinc türk-müsəlman əhaliyə qarşı soyqırımı və deportasiya siyasətinin də əsası qoyuldu. Çarizmin zülmünə, torpaqlarında erməni əhalisinin kütləvi məskunlaşdırılmasına dözməyən azərbaycanlılar öz ata-baba torpaqlarını tərk edərək Türkiyəyə

və İrana, Azərbaycanın şimal əyalətlərinə köçməyi üstün tuturdular. 1820-ci illərin sonu – 30-cu illərin əvvəllərində, təkcə 3–4 il ərzində, keçmiş Naxçıvan xanlığının türk-müsəlman əhalisinin faizi 90%-dən 60%-ə düşmüş [110, 311], İrəvan əyalətində isə onun sayı 3,5 dəfə azalmışdı (2984 ailədən cəmi 847 ailə qalmışdı – İ.M.) [217, 541].

Gülüstan və Türkmənçay müqavilələri ilə Azərbaycanı iki yerə bölən, Azərbaycan dövlətlərinin – xanlıqların siyasi varlığına son qoyan Rusiya xalqımıza qarşı növbəti zərbəni – qədim İrəvan və Naxçıvan torpaqları hesabına 21 mart 1828-ci ildə «erməni vilayəti» adlı qondarma inzibati-ərazi vahidi yaratmaqla vurdu. Bu addımı ilə çarizm, bir tərəfdən ermənilərin rəğbətini qazanmaq, digər tərəfdən isə Osmanlı imperiyası, Qacarlar İranı və Azərbaycan torpaqları arasında xristian zolaq yaratmaq, türk dünyasını parçalamaq məqsədi güdürdü. Əslində, keçmiş İrəvan quberniyasının ərazisində erməni vilayətinin yaradılması, orada ermənilərin kütləvi surətdə yerləşdirilməsi, tarixi Azərbaycan torpaqlarında gələcəkdə süni erməni dövlətinin formalaşdırılması prosesinin əsasını qoydu. Şimali Azərbaycanda erməni amilinin təsirinin güclənməsi, ermənilərin bölgənin sosial-iqtisadi, siyasi həyatında rolunun artması bölgə əhalisinin gələcəyi üçün əsas təhlükələrdən birinə çevrilməyə başladı. Bunu XIX əsrin sonu XX əsrin əvvəllərində yaşamış rus müəllifləri də etiraf edirdilər. Onların əsərlərində ermənilərin fəaliyyəti «regionda rus işinə təhlükə» (N.Şavrov), «Qafqazda sabitsizliyin əsas səbəbkarı» (F.Qerşelmarn), «erməni-tatar qarışıqlığının baiskarı» (V.F.Mayevski) kimi qiymətləndirilirdi. Məlum olduğu kimi, həmin dövrdə Azərbaycan Rusiya iqtisadiyyatı üçün, Rusiyanın cənuba doğru geosiyasi planlarının həyata keçirilməsi üçün mühüm rol oynayırdı. Məhz Rusiyanın Qafqazdakı maraqları naminə qafqazşünas İ.N.Kanadpev region xalqlarını ermənilərin ziyanverici təsirindən qorumağa çağırırdı, çünki onların separatizmi «Qafqazda erməni muxtariyyətinə və hətta heç zaman mövcud olmamış erməni dövlətçiliyinin yaranmasına aparıb çıxarır. Başqa torpaqları ələ keçirmək və erməni dövlətçiliyini yaratmaq, Qafqazın ermənilərlə məskunlaşdırma prosesini davam etdirmək kimi məqsədlərinə çatmaq üçün onlar silah götürməyə hazırdırlar». Bununla əlaqədar müəllif istisna etmirdi ki, Qafqazda ermənilərin məqsədlərinin həyata keçirilməsi Rusiyanın Qərbdə ehtimal olunan müharibədə məğlubiyyətinə gətirib çıxara bilər [132, 5–33].

Digər görkəmli rus qafqazşünası V.L.Veliçko ermənilərin «xristian» faktorunu qabardaraq öz çirkin məqsədlərinə çatmaq üçün bütün vasitələrdən istifadə etdiklərini, Zaqafqaziyanın iqtisadi həyatını nəzarətə götürdüklərini, hətta mətbuatın onların hakimiyyəti altında olduğunu qeyd edərək göstərirdi ki, ermənilər de fakto – tam mənada diyarın sahiblərinə çevriliblər. Burada erməni amilinin erməni dövlətçiliyinin olmaması şəraitində gizli siyasi vəzifələri dini vəzifələrdən uca tutan erməni kilsəsi dəstəkləyir və yönləndirir [96, 67–163].

Qafqazın yerli hakimiyyəti, o cümlədən canişin İ.İ.Voronsov-Daşkov ermənilərin təsiri altında idi. Qafqazşünas M.O.Menşikov yazırdı ki, terror fəaliyyətinə görə daşnakları mühakimə etmək cəhdləri səmərəsiz olurdu, çünki məhkəmə orqanları belə, erməni terrorçuların təzyiqinə məruz qalırdılar. Bu, ermənilərin tədricən Zaqafqaziyanın sahiblərinə çevrilmələrinin, torpaqları, sərmayələri, sənayeni, ticarəti ələ keçirmələrinin və yerli administrasiyaya, demək olar ki, komanda təsirinin nəticəsidir: Menşikov uzaqgörənliklə qeyd edirdi ki, ermənilər Qafqazı dinc yolla fəth etdikdən sonra bu erməni patriotlarını onların son məqsədlərinə daha da yaxınlaşdıracaqdır. Son məqsəd isə aydın idi [160, 464–465]. Yad torpaqlarda – Cənubi Qafqazda erməni amilinin gücləndirilməsində, imperiyanın (daha sonra Sovet dövlətinin və müasir Rusiyanın – İ.M.) ermənipərəst siyasətinin formalaşmasında erməni generalları, tacir və kapitalistləri, dövlət xadimləri mühüm rol oynamışlar. Əgər çarizm dövründə bu missiyanı M.Lazarev, X.Lazarev, Q.Ori, M.Arqutinski-Dolqorukov, L.Mədətov, Q.Ter-Qukasov, V.Bebutov, L.Melikov, M.Loris-Melikov, S.Kişmişev yerinə yetirirdilərsə, sonralar bu işi S.Şaumyan, A.Mikoyan, G.Şahnazaryan, A.Q.Aqanbekyan və başqaları öz öhdələrinə götürmüşlər. Bu gün də Rusiya ali hakimiyyət dairələrində həmin ənənələri davam etdirən erməni və ermənipərəst xadimlər az deyildir. Bu xadimlərə biz Avrasiya nəzəriyyəsinin banilərindən biri, N.S.Trubetskoyun sözlərini çatdırmaq istəyirik: «Ermənilərlə dil tapmaq həmişə asandır. Lakin ermənilərə arxayın olmaq olmaz. İqtisadi cəhətdən güclü olaraq, Zaqafqaziyanın bütün iqtisadi həyatına rəhbərliyi öz əllərində tutan ermənilər, eyni zamanda parazit xalqa və qula aid olan bütün xüsusiyyətlərə malikdirlər, buna görə qonşu xalqlarda onlara qarşı nifrətə gətirib çıxaran ümumi antipatiya (ikrah) hissi mövcuddur. İnqilaba qədərki dövrdə sonda rusların ermənilərlə təkbətək qalmasına və Zaqafqaziyanın

digər millətlərini özlərinə qarşı qaldırmasına gətirib çıxarmış siyasət bizə ibrət dərsi olmalıdır» [209, 22].

XIX əsrin sonlarından başlayaraq Rusiya çarizminin dəstəyindən istifadə edən erməni millətçiləri Osmanlı ərazisində erməni dövlətinin yaradılması məqsədilə (çünki çarizm öz ərazisində buna heç zaman imkan verməzdi – İ.M.) həm Şərqi Anadoluda, həm də Şimali Azərbaycanda silahlı terror dəstələri yaradır, türk-müsəlman əhalisinə, yerli hakimiyyət orqanlarına qarşı sui-qəsd və talanlar həyata keçirirdilər.

«Böyük Ermənistan» yaratmaq xülyası ilə hərəkət edən ermənilər 1905–1906-cı illərdə azərbaycanlılara qarşı qanlı aksiyalar həyata keçirmiş, Bakıda, Tiflisdə, Şuşada, Gəncədə, İrəvanda, Naxçıvanda, Zəngəzurda dinc əhaliyə qarşı kütləvi qırğınlar törətmişlər.

Birinci Dünya müharibəsinin başlanması ilə Osmanlı imperiyasının süqut edəcəyinə və öz milli dövlətlərini yaradacaqlarına ümid edən ermənilər, Rusiyanın və Avropa dövlətlərinin köməyinə arxalanaraq dinc müsəlman əhalisinə qarşı cinayətlər törətdilər. Rusiya ordusunda xidmət edən 250 mindən çox erməni Şərqi Anadolu və Azərbaycan ərazilərində görünməmiş vəhşiliklər törətmiş, aralarında uşaqların, qadınların, qocaların üstünlük təşkil etdiyi yüz minlərlə türk müsəlmanı qətlə yetirmişdilər.

Rusiyada 1917-ci il Fevral və Oktyabr inqilablarından məharətlə istifadə edən ermənilər öz iddialarını bolşevizm bayrağı altında reallaşdırmağa nail oldular. Bakı quberniyasında hakimiyyəti ələ keçirmək üçün daşnak-bolşevik S.Şaumyan Qafqaz cəbhəsindən qayıdan başkəsən erməni zabit və əsgərlərini səfərbər edərək 1918-ci ilin yazında insanlığa qarşı görünməmiş cinayəti həyata keçirmiş, təxminən 15000 azərbaycanlı qətlə yetirilmişdi. Qanlı cinayətləri Qubada, Şamaxıda, Salyanda, Göyçayda, Kürdəmirdə də davam etdirən bolşevik qiyafəli ermənilər 50000 nəfərdən çox günahsız azərbaycanlını soyqırımına məruz qoymuşdular.

Birinci Dünya müharibəsinin Türkiyə üçün uğursuz başa çatmasına baxmayaraq, M.K.Atatürkün başçılığı altında milli istiqlal savaşı ermənilərin Türkiyə ərazisində dövlət yaratmaq arzularını gözündə qoydu. Osmanlı imperiyasına xəyanət edən ermənilər kütləvi surətdə öz hərbi dəstələri ilə birgə Şimali Azərbaycan torpaqlarına axışmağa başladılar. Hələ 1915–1916-cı illərdə 300000-dən çox erməni geri çəkilən rus ordusu ilə bərabər Qərbi Azərbaycanda (gələcək Ararat Respublikasının ərazisində) yerləşmişdilər [97, 74]. Bununla da, Azərbaycan xalqına qarşı soy-

qırımı və deportasiya siyasətinin yeni mərhələsi başlandı. Azərbaycan Xalq Cümhuriyyəti regionda sülhün və əmin-amanlığın təmin edilməsinə ümid edərək, 29 may 1918-ci ildə Azərbaycanın qədim mədəni və siyasi mərkəzlərindən biri olan İrəvanı yeni yaradılmış Ararat Respublikasına siyasi mərkəz olaraq güzəştə getdi. Düzdür, əvəzində erməni liderləri Azərbaycana ərazi iddialarından əl çəkəcəklərinə söz vermişdilər. Sonrakı hadisələr göstərdi ki, ermənilər üzərlərinə götürdükləri öhdəlikləri yerinə yetirmək barədə heç düşünmürdülər. Beləliklə, tarixdə ilk dəfə olaraq Cənubi Qafqazda – Azərbaycanın tarixi ərazisində erməni dövləti yaradıldı. Lakin Azərbaycan xalqının bu xoş məramı erməni daşnaklarını bəd əməllərdən çəkindirmədi. Əksinə, türk-müsəlman əhalisinə qarşı soyqırımı və deportasiya rəsmi Ararat Respublikasının dövlət siyasətinə çevrildi. Erməni parlamenti üzvünün də qeyd etdiyi kimi, onlara müsəlmanlardan azad edilmiş ərazi lazım idi [111, 104].

Sistemli terror və hədələrlə erməni hakimiyyəti azərbaycanlıları öz doğma ocaqlarından qovmağı və onların torpaqlarını, mülkiyyətini ələ keçirməyi öz qarşısına məqsəd qoymuşdu. A.Lalayan bu barədə yazırdı: «Ermənilər tərəfindən azərbaycanlıların məhv edilməsi çoxdan başlanmış və dövlət siyasəti səviyyəsinə qaldırılmışdı. Ona görə də təəccüblü deyildi ki, daşnakların idarəçiliyi zamanı, onların 30 aylıq hakimiyyətdə olduqları dövrdə (1918-ci il may – 1920-ci il noyabr) azərbaycanlı əhalinin 60%-i məhv edilmişdi [144, 80]. A.Lalayan digər əsərində həmin dövrdə Ermənistan ərazisində azərbaycanlı əhalinin sayının 77% azaldığını qeyd edir [145, 59]. Arxiv sənədlərinə görə Ermənistan Respublikasında 1920-ci ilin fevralına qədər öldürülmüş azərbaycanlıların sayı 100–120 min civarında idi [124, 47]. M.Avdeyevə görə, ümumilikdə İrəvan quberniyasında 250000 əhalisi olan 300 azərbaycanlı kəndi məhv edilmişdi [68]. Korkodyan daşnakların hakimiyyəti dövründə Ararat Respublikasında 565000 azərbaycanlı əhalinin öldürüldüyünü və qovulduğunu göstərir. Nəticədə, sovet hakimiyyəti qurulanda Ermənistanda cəmi 10000 azərbaycanlı qalmışdı [139, 185; 50, 33]. Ancaq Ermənistanın sovetləşməsindən sonra da bu torpaqların azərbaycanlılardan təmizlənməsi davam edirdi. Hətta 1922-ci ildə 60000 azərbaycanlının Ermənistan SSR-ə qayıtmasından sonra belə, onların sayı cəmi 72,596 nəfər təşkil etmişdi [50, 60, 66].

Azərbaycanın tarixi ərazilərində milli dövlətlərini yaratmağa müvəffəq olmuş ermənilər, bununla kifayətlənməyərək AXC-nin digər ərazilə-

rini – Zəngəzuru və Qarabağın dağlıq hissəsini ələ keçirmək üçün təcavüzkar müharibəyə başladılar. Həmin dövrdə təkcə Zəngəzurda erməni nizami ordu hissələri və quldur dəstələrinin fəaliyyəti nəticəsində azərbaycanlıların yaşadığı 120 kənd məhv edilmişdi.

Ermənistanda sovet hakimiyyəti qurulduqdan dərhal sonra 1920-ci ilin noyabrında Sovet Rusiyası Azərbaycanın Zəngəzur, Göyçə, Dərələyəz və digər ərazilərini, 1929-cu ildə isə Nüvədi, Tuğ, Eynadzor kəndlərini Ermənistan SSR-ə verərək, onun ərazisini 29800 kv. km-ə çatdırdı. Qarabağın dağlıq hissəsini silah gücünə belə, ələ keçirə bilməyən erməni təcavüzkarları Rusiyanın və bolşevik havadarlarının köməyi ilə 1923-cü ildə Azərbaycan ərazisində süni inzibati vahid – Dağlıq Qarabağ Muxtar Vilayətini yaratmağa nail oldular. DQMV, əslində, Azərbaycanın ərazi bütövlüyünə yönəlmiş siyasi akt – gec işə düşən mina idi.

1945-ci ildə Ermənistan SSR rəhbərliyinin Dağlıq Qarabağın Ermənistana verilməsi ilə bağlı Moskva qarşısında qaldırdığı iddialar sübut edirdi ki, erməni kommunist rəhbərliyi Azərbaycan torpaqlarını ələ keçirmək planlarında daşnakların sələfləridir. 1945-ci ilin payızında Ermənistan KP MK katibi Q.Arutinov İ.Stalinə və Q.Malenkova məktub göndərərək xaricdə yaşayan ermənilərin Sovet Ermənistanına qaytarılmasına – repatriasiyasına icazə verməyi xahiş etdi. Ermənistan SSR rəhbərliyinin müraciətinə baxan ÜİK(b)P Siyasi bürosu 21 noyabr 1945-ci il tarixində geniş qərar qəbul edərək ermənilərin repatriasiyasına öz razılığını vermiş və bu məsələ ilə bağlı SSRİ XKS-nin tədbirlər planını təsdiq etmişdi. 22 fevral 1946-cı ildə Siyasi büro SSRİ XKS və XXİK-nin birgə hazırladığı «Xarici ermənilərin Sovet Ermənistanına qaytarılması məsələsinə dair tədbirlər haqqında» xüsusi qərar qəbul etdi [102, 42]. Bəlli idi ki, sayı 1000000-a yaxın olması nəzərdə tutulan erməni əhali üçün Ermənistan SSR-də kifayət qədər torpaq yoxdur. Ona görə də onlar problemi – 1) Türkiyə və Azərbaycan torpaqlarının ələ keçirilməsi; 2) Ermənistan SSR-də yaşayan azərbaycanlıların qovulması yolu ilə həll etməyə çalışırdılar. Lakin İ.Stalinin Türkiyəni parçalamaq və onun torpaqlarını ələ keçirmək cəhdləri baş tutmadı. Ermənistan rəhbərliyinin DQMV-nin Ermənistana verilməsi barədə SSRİ siyasi rəhbərliyi qarşısında qaldırdığı məsələ də Azərbaycan KP MK katibi M.C.Bağırovun çevik mövqeyi sayəsində ermənilər üçün müsbət həll edilmədi. Ermənistan lideri Q.Arutinovun DQMV-nin Ermənistan SSR-ə

verilməsi təklifinə o, kontr təkliflə çıxış edərək Şuşa rayonu istisna olmaqla Dağlıq Qarabağın verilməsinə etiraz etmədiyini, əvəzində isə azərbaycanlıların yaşadığı Ermənistan SSR Əzizbəyov, Vedi və Qarabağlar rayonlarının Azərbaycan SSR-ə qaytarılmasını təklif etdi (34, 397–398).

Ermənistanın şovinist rəhbərliyi Sovet dövlətinin əli ilə Azərbaycan və Türkiyə ərazilərini ilhaq etmək cəhdlərinin uğursuzluğunu Ermənistan SSR-də yaşayan azərbaycanlı əhalidən intiqam almaqla çıxdı. Ermənistan rəhbərliyinin tələbi ilə SSRİ Nazirlər Sovetinin 1947-ci il 23 dekabr tarixli 4083 nömrəli və 1948-ci il 10 mart tarixli 754 nömrəli qərarları Azərbaycan xalqına qarşı növbəti tarixi cinayət aktları oldu. Bu qərarlar əsasında 1948–1953-cü illərdə 150000-dən çox azərbaycanlı Ermənistan SSR ərazisindəki dədə-baba yurdlarından kütləvi surətdə və zorakılıqla sürgün olundu. Bu erməni şovinist dairələrinin və SSRİ rəhbərliyinin cinayətkar siyasətinin nəticəsində mümkün oldu [52].

İ.Stalinin ölümü azərbaycanlıların bütünlüklə deportasiyasının qarşısını alsa da, onlara qarşı mənəvi terror davam edirdi. İrəvan Pedaqoji İnstitutunun Azərbaycan bölməsi, İrəvan Pedaqoji Texnikumu, C.Cabbarlı adına İrəvan Azərbaycan Dram Teatrı və onun nəzdində studiya-texnikumu, azərbaycandilli rayon qəzetləri bağlanmış, azərbaycanlıların yaşadıqları rayonlarda rəhbər vəzifəyə yalnız ermənilər təyin edilməyə başlamışdı. Mənəvi terrorun mühüm formalarından biri də bütün Ermənistan ərazisində olan türkdilli yer adlarının erməniləşdirilməsi olmuşdu.

Türkiyə və Azərbaycana qarşı ərazi iddiaları indi daha yüksək səviyyələrdən eşidilirdi. 1956-cı ildə İrəvan Dövlət Universitetinin partiya iclasında və Ermənistan Yazıçılar İttifaqının plenumunda Dağlıq Qarabağın və Naxçıvanın Ermənistana birləşdirilməsi haqqında açıq çağırışlar eşidildi [27, 108–109].

Antiazərbaycan əhvali-ruhiyyənin qızışdırılmasında erməni kilsəsi də xüsusi rol oynayırdı. Erməni Qriqorian kilsəsinin başçısı, katalikos I Vazgenin 1956-cı ildə SSRİ rəhbərliyinə göndərdiyi məktublarında açıq şəkildə Azərbaycana qarşı ərazi iddiaları irəli sürülür. Naxçıvan və DQMV-nin Ermənistan SSR-ə verilməsi təklif olunurdu [176, 45–46].

Erməni Qriqorian kilsəsinin təxribatçı fəaliyyəti başqa faktlarla da təsdiqlənir. Məsələn, Azərbaycan Respublikası Milli Təhlükəsizlik Nazirliyinin arxivindəki bir əməliyyat məlumatında yazılır: «8–10 mart ta-

rixlərində Bakıdakı erməni kilsəsinin dyakonu S.S.Davityan Ermənistanda olmuş, Katalikos I Vazgenin iqamətgahında iyeromonaxlar İsaxanyan, Mkrtçyan və dyakon Matevosyanla görüşmüşdü. Söhbət əsnasında sonuncular Bakıda və Sumqayıtdakı vəziyyətlə, DQMV ilə bağlı məsələdə Bakı ermənilərinin tutduğu neytral mövqe ilə maraqlanmış və demişdilər ki, onlar qorxaqdırlar, böyük işlər görməyə qadir deyillər, çünki «böyük işlər böyük qurbanlar tələb edir». Sonra Davityanın «Ermənistanda əhalinin çıxışları Bakı ermənilərinin vəziyyətinə təsir göstərə bilər» iradına onlar cavab vermişdilər ki, bunda heç bir qorxulu şey yoxdur, onları (Bakı ermənilərini – İ.M) DQMV uğrunda, Qarabağla bağlı planlar uğrunda qurban vermək olar. 11 mart 1988-ci il. (8)

Ermənistan rəsmi dairələrinin razılığı və təşəbbüsü ilə eyniməzmunlu zəhmətkeş məktubları həm Ermənistan SSR-dən, həm də DQMV-dən SSRİ mərkəzi orqanlarına göndərilirdi.

1965-ci ildə «erməni genosidinin» 50 illiyinin keçirilməsi antitürk, antiazərbaycan kampaniyasına yeni təkan verdi: Ermənistanda yaşayan azərbaycanlılara qarşı təqiblər, Naxçıvana və Dağlıq Qarabağa iddialar daha da gücləndi. 1966-cı ilin sentyabrında Ermənistan KP MK birinci katibi A.Koçinyanın və Ermənistan SSR Nazirlər Sovetinin sədri B.Muradyanın Sov.İKP MK məktubunda Ermənistanın bir qrup elm və mədəniyyət xadiminin XXIII qurultaya müraciəti öz əksini tapmışdı. Müraciətdə DQMV və Naxçıvan MSSR yaradılması ilə bağlı tarixi faktlar saxtalaşdırılır, Azərbaycanın bu ərazilərinə iddialar siyasi, iqtisadi və etnik amillərlə əsaslandırılırdı. Bu zaman ermənilər öz həyasız hərəkətlərini özlərinə xas olan riyakarlıqla bəzəyir, bu addımların «erməni və Azərbaycan xalqları arasında dostluq və qardaşlığın daha da möhkəmləndirilməsi» işinə xidmət etdiyini bildirirdilər [140, 30–43].

Daşnaklar «Qərbi Ermənistan» adlandırdıqları Türkiyənin şimal-şərq torpaqlarını ələ keçirməyin mümkünsüzlüyünü başa düşdükdən sonra «Böyük Ermənistan» yaradılması ideyasını qonşu sovet respublikalarının əraziləri hesabına həyata keçirməyi qarşılarına məqsəd qoymuşdular.

Yeri gəlmişkən, «vətənə qayıdış» devizi altında Ermənistan SSR-ə yaşamağa gəlmiş ermənilər arasında ən müxtəlif peşə sahibləri var idi. Onların respublikaya gəlişi ilə daşnak partiyasının erməni əhalisinə milliyyətçi təsiri də yenidən artmağa başladı.

Hətta sovet DTK-nın qüdrətli dövrlərində (50–80-ci illərdə) belə, daşnaklar sovet Ermənistanında və SSR-in digər yerlərində təxribat fəaliyyəti ilə məşğul olur, millətçi əhvali-ruhiyyəli, ekstremist dairələrə arxalanaraq, bütün vasitələrlə, o cümlədən terrordan istifadə etməklə öz sərsəm ideyalarını reallaşdırmağa çalışırdılar. 1956-cı ildə əsas məqsədi «erməni dövlətçiliyinin tam həcmdə dirçəldilməsi» olan «Vətənpərvərlər ittifaqı», 1963-cü ildə isə «Erməni gənclərinin ittifaqı» adlı gizli terrorçu təşkilatlar yaranmışdı. Həmçinin 1967-ci ildə İrəvanda təşkil edilmiş «Yenidən milli birləşmə» partiyası «Kiçik Asiyanı, Ermənistan SSR-i, Naxçıvanı, Dağlıq Qarabağı, Cavahetiyanı, Borçalını, hətta Rusiyanın Stavropol və Krasnodar, Həştərxan torpaqlarını özündə birləşdirən «Böyük Ermənistan» yaradılması tələbi irəli sürürdü [154, 27].

1977-ci il yanvarın 8-də 40 dəqiqə ərzində Moskva şəhərində üç partlayış baş verdi. Birinci partlayış $17^{33}$-də paytaxtın metrosunda qatarın Pervomaysk stansiyasına yaxınlaşan zaman baş vermişdi (F.Butkov hadisənin səhvən 1973-cü ildə baş verdiyini və 29 nəfərin həlak olduğunu göstərir). Partlayışın tuneldə deyil, açıq yolda baş verməsi qurbanların nisbətən az olmasına səbəb olmuşdu. 32 dəqiqədən sonra 25 oktyabr (indiki Nikolski) küçəsində, ondan 5 dəqiqə sonra isə Dzerjinski (indiki Lubyanka) meydanında daha iki partlayış baş vermişdi. Partlayışları heç kim öz üzərinə götürmədiyindən, onun ictimai diqqət cəlb edilməsi məqsədilə törədildiyi məlum olurdu. Yalnız iki ildən sonra qurbanların ümumi sayı haqqında məlumat verildi: 7 adam ölmüş, 37 adam yaralanmışdı. Maraqlıdır ki, dissident A.Saxarov hadisədən 4 gün sonra dünya ictimaiyyətinə müraciətdə bu partlayışın SSRİ-nin repressiv orqanlarının (DTK-nın) pravokasiyası olduğunu bildirmişdi [210, 209–210]. Partlayış törədildikdən altı ay sonra – 2 noyabr 1977-ci ildə həmin üsulla Kursk vağzalında yeni partlayış cəhdi olsa da, xoş təsadüf (partlayıcı qurğunun batereyası sıradan çıxmışdı – İ.M.) nəticəsində bu baş vermədi. Diversiya ilə bağlı aparılan gərgin təhqiqatlar cinayətin izini birbaşa İrəvana aparmış, bir müddətdən sonra terror aktının icraçıları – Akop Stepanyan və Zaven Baqdasaryan, daha sonra isə onun təşəbbüskarı və təşkilatçısı Stepan Zatikyan həbs edilmişdirlər. Məlum olmuşdu ki, onlar əsas məqsədi «Ermənistanın azad edilməsi və Türkiyə torpaqlarının ona birləşdirilməsi» olan, «Erməni birləşmiş millətçi partiyası»nın üzvləridir.

A.Saxarov və o vaxt SSRİ-də dissident təşkilatı olan «Helsinki qrupu» Brejnevə açıq məktub göndərərək bu terror aktını ermənilərin törətməsinə inanmadıqlarını, onun ermənilərə qarşı nifrət yaradacağını nəzərə alaraq geniş şərh edilməsinə qarşı çıxmışdılar. Ermənistan SSR rəhbərliyi dəhşətli aktın ermənilər tərəfindən törədilməsi faktını ilk vaxtlar tamamilə inkar edərək Moskvadan gəlmiş DTK müstəntiqlərinin «qanunsuzluğunu və özbaşınalığını» dayandırılmasını tələb etmişdi [210, 210; 174, 1004, 9 fevral]. Ermənistan rəhbərliyi cinayətin ermənilər tərəfindən törədilməsini gizlətmək üçün hər şeyi etmiş, o vaxt birinci katib olan K.Dəmirçyan terror aktı haqda mətbuatda informasiya getməsini belə qadağan etmişdi. Terror faktından o vaxtkı SSRİ rəhbərliyi siyasi nəticələr çıxarılmasından imtina etmiş və daşnak təbliğatına qarşı izahat işinin aparılması ilə bu fəlakətin qarşısını ala bilməyəcəyini başa düşmək istəməmişdi. Keçmiş SSRİ DTK-nın rəhbərlərindən biri olmuş F.Bobkovun qeyd etdiyi kimi, hətta bir neçə ildən sonra respublikada (Ermənistan SSR-də – İ.M.) millətçi əhvali-ruhiyyə artmağa və daşnaklar öz ideologiyalarını fəal surətdə yaymağa başlayanda, yerli rəhbərlik onlara qarşı tədbir görməmiş və yəqin ki, bunu təsadüfən etməmişdir [89, 291]. F.Bobkov sonra yazır ki, erməni millətinin müstəsnalığı nəzəriyyəsi respublika əhalisinə kiçik yaşlarından təlqin edilirdi. Məsələn, orta məktəbin 7–8-ci sinifləri üçün dərsliklərdə sual qoyulurdu ki, hansı dövlətlərin paytaxtlarında erməni məktəbləri var və aydın olur ki, SSRİ-nin paytaxtında belə məktəb olmasa da, bəzi xarici dövlətlərdə vardır. Görkəmli sovet musiqiçiləri, rəssamları, mədəniyyət və elm xadimlərindən söhbət gedəndə, bir qayda olaraq, artıq erməni soyadları misal çəkilirdi. Nəticədə təbii ki, daşnak təbliğatı əlverişli mühitə düşürdü [89, 291–292]. Ermənistanda olarkən F.Bobkov Dəmirçyanla bu barədə söhbət etmiş, lakin uzun söhbətdən heç nə çıxmamışdı. Ermənistan KP rəhbəri inadkarcasına göstərmişdi ki, bizdə heç bir qorxulu şey baş vermir. Qayıdarkən F.Bobkov onunla yenidən görüşmüş və daşnakların respublika ərazisində aktiv fəaliyyət göstərməsinə dair yeni faktlar gətirsə də, Dəmirçyan başqa cür reaksiya vermişdi. MK-nın növbəti plenumunda onun kommunistləri daşnak təsirinə qarşı mübarizəyə səsləməsi isə yalnız formallıq xatirinə, gözdən pərdə asmaq üçün edilmişdi. Bunun özü bir daha aydın sübut edir ki, əslində, daşnakların, bütün erməni millətçi dairələrin ekstremist, terror



**KAREN DƏMİRÇYAN**

**Sumqayıt hadisələri zamanı Ermənistan KP MK-nın birinci katibi vəzifəsində işləyib**

fəaliyyəti, antitürk, antiazərbaycan təbliğatı, əslində, Ermənistan SSR kommunist rəhbərliyi tərəfindən dəstəklənir və istiqamətlənirdi.

Məqsədyönlü, düşünülmüş antiazərbaycan siyasətinin həyata keçirilməsi nəticəsində 1979-cu ildə azərbaycanlılar Ermənistan SSR əhalisinin cəmi 5,3%-ni təşkil edirdilər. Halbuki XIX əsrin, həmçinin XX əsrin əvvəllərində indiki Ermənistan Respublikası ərazisində əksər yerlərdə erməni əhalisinin sayı elə bu rəqəm civarında idi. Nəticədə, Daşnaksütyun partiyasının əsas planı olan «türksüz Ermənistan» yaradılması tam həyata keçirilmişdi.

Ermənistandan fərqli olaraq, Azərbaycanda erməni millətinin sosial-iqtisadi, mənəvi-mədəni, təhsil ehtiyaclarının ödənilməsi üçün tam şərait yaradılmışdı. Ermənilər respublika idarəçiliyinin bütün strukturlarında ən yüksək vəzifələrdə təmsil olunmuşdular. Onlara göstərilən qayğının nəticəsi idi ki, həm respublikada, həm də ermənilərin kompakt yaşadıqları rayonlarda onların sayı artmaqda idi, ermənilər Azərbaycanda, M.Şacinyanın ifadəsi ilə desək, «yağ içində böyrək kimi bəslənirdilər» (каталис как сыр в масле) (2a, 551).

Bunu sovet hakimiyyəti illərində keçirilmiş əhalinin siyahıyaalınmasının məlumatları da təsdiq edir. Əgər 1926-cı ildə ermənilər Azərbaycanda 282000 nəfər təşkil edirdilərsə, 1939-cu ildə onların sayı 388000, 1959-cu ildə 442100, 1970-ci ildə 483500, 1979-cu ildə isə 475300-ə çatmışdı.

Bütün bunlar onu göstərir ki, 1988-ci il Sumqayıt hadisələri də digər bu tipli hadisələr kimi təxribat xarakterli olub, I Pyotrun dövründən başlamış, geopolitik baxımdan strateji əhəmiyyətə malik nöqtələrdə ermənilərin məskunlaşdırılması, həmin yerlərdən türk-müsəlman əhalinin didərgin salınaraq ermənilərin sayının süni surətdə artırılması kimi siyasi planlara xidmət edən hadisədir.

**1.2. Ermənistanın Azərbaycan SSR-in Dağlıq Qarabağ Muxtar Vilayətinə dair iddialarının əsassızlığı**

Ermənilər Dağlıq Qarabağ hərəkatına başlayarkən öz məqsədlərini ört-basdır etmək üçün əsasən, üç arqumentə (əslində, ağ yalana) əl atmış və bununla SSRİ və dünya ictimaiyyətini aldatmağa çalışmışlar.

1. Guya, Dağlıq Qarabağ erməni millətinin və erməni dövlətçiliyinin təşəkkül tapdığı tarixi Ermənistan torpağıdır və 1921-ci il iyulun 5-də Stalinin təzyiqi ilə Azərbaycana verilmişdir.
2. Tarixin bütün dövrlərində ermənilər Dağlıq Qarabağ əhalisinin mütləq əksəriyyətini (müxtəlif müəlliflərin iddialarına görə, hətta 94, 95, 98%) təşkil etmişlər.
3. Sovet dövründə Azərbaycan rəhbərliyi Dağlıq Qarabağ ermənilərinə qarşı milli ayrı-seçkilik siyasəti yeritmiş, onların milli-mədəni hüquqları tapdalanmışdır.

Birinci fikrin əsassızlığını dünya, rus və Azərbaycan tarixşünaslığı təkzibolunmaz faktlarla sübut etmişdir. Ermənilərin nəinki Dağlıq Qarabağa, hətta bütün Cənubi Qafqaza gəlmə olması, yalnız çar Rusiyasının köçürmə siyasəti nəticəsində bəzi bölgələrdə sayca üstünlük təşkil etməsi artıq tarix elminin aksiomudur və bu barədə əsərin birinci paraqrafında ətraflı bəhs edilmişdir (bax ətraflı: 71; 29; 33; 34; 43; 45; 71). Erməni həyasızlığının ən bariz nümunələrindən biri də RK(b)P Qafqaz bürosunun 1921-ci il iyulun 4-də və 5-də Dağlıq Qarabağ məsələsi ilə bağlı qəbul etdiyi sənədləri saxtalaşdırmaq cəhdidir (bu barədə bax ətraflı: 34; 101). Məsələnin geniş şərhinə varmadan onu qeyd etməklə kifayətlənmək olar ki, Qafqaz bürosunun 5 iyul tarixli iclasında qərara alınmışdı ki, «Yuxarı və Aşağı Qarabağın iqtisadi əlaqələrini, Yuxarı Qarabağın Azərbaycanla daimi əlaqələrini və müsəlmanlarla ermənilər arasında milli sülhün zəruriliyini nəzərə alaraq, Dağlıq Qarabağ Azərbaycan SSR hüdudlarında saxlanılsın («saxlanılması» – İ.M.), Dağlıq Qarabağa Şuşa şəhəri inzibati mərkəz olmaqla geniş muxtariyyət verilsin (130, 92). Beləliklə, Qafqaz



MİXAİL QORBAÇOV

**SSRİ Sov. İKP MK-nın sonuncu Baş katibi**

bürosu Dağlıq Qarabağın Ermənistanın tərkibinə daxil edilməsi haqqında öz əvvəlki qərarını ləğv edərək, Dağlıq Qarabağı Azərbaycanın tərkibində saxlamaq (orijinalda «оставить». – İ.M.) haqqında qərar qəbul etdi. Erməni müəllifləri Qafqaz bürosunun bu qərarını bölgəni mexaniki surətdə Ermənistanın tərkibindən çıxarıb, Azərbaycanın tərkibinə «daxil etmək» kimi təqdim edirlər. Bu zaman ən həyasız üsullara əl atmaqdan utanmayaraq adi sözləri belə («saxlamaq» və «daxil etmək») («оставить» və «включить») saxtalaşdırmağa çalışırlar. Çox təəssüf ki, 1988-ci ildə ermənilər bu saxtakarlıq hesabına, həmçinin o zamankı SSRİ rəhbərliyinin, hətta bir sıra görkəmli ziyalıları D.Saxarovu, A.Soljenitsını və b. öz tərəflərinə çəkməyə nail olmuşlar. M.S.Qorbaçov öz xatirələrində yazır ki, Balayan və Kaputikyanla görüşündə onlar ona çox diqqətlə seçilmiş sənədlər göstərmiş və o inanıb ki, Azərbaycanın o zamankı rəhbəri N.Nərimanov əvvəlcə Dağlıq Qarabağın «ana vətən»lə (Ermənistanla – İ.M.) yenidən birləşməsinə razılıq verib, lakin tezliklə bu razılığını geri götürüb (106, 503).

Çox təəssüf ki, obyektivliyi ilə seçilən Rusiyanın müasir tarixçilərindən bəziləri (R.Medvedyev, D.Volkoqonov, A.Şubin və b.) tarixi sənədlərlə tanış olmadan istər-istəməz erməni saxtakarlığına uyur və özləri də tarixi həqiqətləri təhrif edirlər. Məsələn, R.Medvedyev özünün «Советский Союз. Последние годы жизни» kitabında (159) Qafqaz bürosunun 4 iyul 1921-ci il tarixli qərarında «Dağlıq Qarabağın Ermənistan SSR-in tərki-

bində qalmasını» elan etdiyini, lakin tezliklə bu qərara yenidən baxaraq Dağlıq Qarabağı Azərbaycan SSR-in tərkibinə verdiyini» göstərir (158, 239). O, Dağlıq Qarabağın iqtisadi və coğrafi cəhətdən Azərbaycana yaxın olduğunu, bütün məktəblərdə tədrisin erməni dilində aparıldığını göstərsə də, məlumatsızlıq ucbatından Ermənistandan Dağlıq Qarabağa dəmiryolu və şose yolunun olmadığını göstərir. Halbuki regionun relyefi dağlıq ərazidə dəmiryolunun inşasını mümkünsüz edirdi, şose yolu isə açıq fəaliyyət göstərirdi. Həqiqət isə budur ki, 5 iyul 1921-ci il tarixli qərarla Ermənistanın Dağlıq Qarabağı ələ keçirmək cəhdi rədd edilmiş, Dağlıq Qarabağın Azərbaycan ərazisi olması bir daha təsdiqlənmiş, Dağlıq Qarabağı Azərbaycanın tərkibində saxlamaq və Azərbaycanın tərkibində muxtariyyət vermək məsələsi həll olunmuşdu.

Dağlıq Qarabağda erməni etnosunun sayca üstünlüyü barədə fikirlər də heç bir tənqidə tab gətirmir. Qarabağın dağlıq ərazilərində, ermənilərin XIX əsrdən başlayaraq yerləşdirilməsi nəticəsində onların burada sayının süni surətdə artmasını həm rus müəllifləri (A.Qriboyedov, V.A.Potto, M.Skibitski, P.Q.Butkov, S.Qlinka, N.Şavrov, N.Şopen, V.Veliçko və b.), həm də çar hökuməti və sovet dövlətinin rəsmi sənədləri (kameral təsvirlər, əhalini siyahıyaalma materialları, statistik materiallar, Qafqaz təqvimləri və s.) tam təsdiq edir (34, 229–260; 33; 35–42). Qeyd edək ki, Qarabağda əhalinin tərkibi haqqında məlumat verən ilk sənəd, Zaqafqaziyada rus məmurlarından Rusiya Daxili İşlər nazirinin 1811-ci il 19 iyun tarixli arayışı hesab oluna bilər (33, 36). Həmin sənəd 1972-ci ildə Yerevanda çap olunmuş «Присоединение Восточной Армении к России – I том» (186) kitabında da yerləşdirilmişdir. Həmin sənəddə Qarabağdakı 12000 ailənin 9500-nün müsəlman, 2500-nün erməni ailəsi olduğu qeyd edilmişdir. 1823-cü ildə Qarabağda aparılmış kameral sayım materiallarında Qarabağda 20095 ailənin, o cümlədən 15729 azərbaycanlı (78,3%) və 4366 erməni ailəsinin (21,7 faiz) yaşaması göstərilir (213, 39). Rusların Qarabağı ələ keçirmələri ilə azərbaycanlıların kütləvi surətdə İrana keçməsi və onların yerinə Türkiyədən və İrandan köçürülən ermənilərin yerləşdirilməsi baş verdi. 1811-ci ildə 4845, 1922-ci ildə isə 3000 azərbaycanlı ailəsi Qarabağı tərk etməli olmuşdu (34, 232, 35, 395; 108, 445). Qeyd edək ki, bu, azərbaycanlıların kütləvi köçməsinin rəsmən qeydə alınmış sayıdır. Ancaq bu, «Qarabağı nə qədər azərbaycanlı tərk etmişdir?» – sualına tam cavab vermir. Qlinka 1828-ci ildə üç ay ərzində 8000 erməni ailəsinin Arazdan şimala keçdiyini (105, 48–92), erməni müəllifi M.Barxudaryan

isə ən azı 12000-dən çox erməninin Dağlıq Qarabağ ərazisində yerləşdirildiyini (33, 37) yazırlar. Barxudaryan köçmə ermənilərin Qarabağın hansı kəndlərində yerləşdirildiyini də göstərmişdir (34, 249).

A.Xan-Açov adlı müəllif isə 1825-ci ildə İrandan Cənubi Qafqaza 18000-ə yaxın erməninin köçdüyünü göstərir (177, 267). Bu köçürülmələr nəticəsində Qarabağ əhalisinin tərkibində ciddi dəyişikliklər baş vermiş, 1823–1832-ci illərdə Qarabağda erməni ailələrinin sayı 4366-dan 6491-ə çatmış, yəni 2025 ailə çoxalmış, azərbaycanlı ailələrin sayı isə 15729-dan 13965-ə (1764 ailə) enmişdi (33, 38). Hətta mexaniki amillər sayəsində belə, ermənilər Dağlıq Qarabağda sayca tam üstünlük əldə edə bilməmişdilər.

XIX əsrin sonlarında Qarabağ əhalisinin etnik tərkibinə dair ən etibarlı mənbə Rusiya imperiyası əhalisinin I ümumi siyahıyaalınma materiallarıdır. Həmin materiallara görə, 1897-ci ildə Qarabağda – Şuşa, Cavanşir və Cəbrayıl qəzalarında müvafiq olaraq 88243, 19555 və 15750 (cəmi 123548) erməni və müvafiq olaraq 73910, 52041 və 49189 (cəmi 175140) azərbaycanlı yaşamışdır. Deməli, XIX əsr boyu heç vaxt ermənilər Dağlıq Qarabağda əhalinin 95,98 faizini təşkil edə bilməzdilər (33).

Ermənilər Qarabağın etnik tərkibi haqqında yalan məlumatlar yayaraq, guya, 1918-ci ildə Dağlıq Qarabağda 300–330 min erməni yaşadığını və «türk-Azərbaycan işğalı nəticəsində» onların 20 faizinin həlak olduğunu deyirlər (75). T.Köçərli «Кавказский календарь» məcmuəsinin məlumatlarına əsaslanaraq Şuşa, Cavanşir və Cəbrayıl qəzalarında 1917-ci ildə cəmi 349233 nəfər əhalinin yaşadığı, onun 207122 nəfərinin azərbaycanlı və 142111 nəfərinin erməni olduğunu göstərir (33, 40).

Hətta Qarabağın sözügedən 142000 nəfərlik erməni əhalisinin hamısının Dağlıq Qarabağda yaşadığını fərz etsək belə, onlar heç cür 300–330 min nəfər ola bilməzdilər. Ermənilər bu yalanları indiyə qədər davam etdirirlər.

BMT-yə, başqa təşkilatlara saxta məlumatlar göndərməklə dünya ictimaiyyətini çaşdırmaqla məşğuldurlar. Dağlıq Qarabağın 1918–1920-ci illərdə müstəqil olması, yaxud Ararat Respublikasının tərkibində olması haqqında iddialar da ağ yalandır. 1918-ci ilə qədər də, Azərbaycan Xalq Cümhuriyyətinin dövründə də Qarabağın dağlıq hissəsi Azərbaycanın tərkib hissəsi olmuş, bu bölgəni AXC hökumətinin general-qubernatoru idarə etmiş, burada Azərbaycanın qanuni hissələri yerləşmiş Azərbaycan hökumətinin rəhbərləri buraya mütəmadi səfərlər etmiş, bu bölgədə AXC-nin qanunları işləmişdi.

Hətta 1919-cu il avqustun 15-də Qarabağ ermənilərinin qurultayı Qarabağın dağlıq hissəsinin – ermənilər yaşayan Dizaq, Vərəndə, Xaçın və Çiləbörd rayonlarının müvəqqəti olaraq (məsələnin Paris Sülh Konfransında qəti həllinədək – İ.M.) Azərbaycan Respublikasının hüdudlarında hesab edilməsi haqqında qərar qəbul etmişdi. Ermənilər üçün bu faktlar sanki mövcud deyildi. Halbuki Qarabağın dağlıq hissəsinin Azərbaycana məxsusluğunu, hətta o zaman Cənubi Qafqazda yerləşən müttəfiqlərin ali komandanlığı da təsdiq etmişdir (33, 41–54). Beləliklə, həm AXC dövründə, həm də sovet dövründə Dağlıq Qarabağ siyasi-iqtisadi, inzibati-hüquqi cəhətdən Azərbaycanın tərkibində olmuşdur.

Ermənilərin Qarabağda məskunlaşması Dağlıq Qarabağın toponomikasına da öz təsirini göstərmişdi. Ermənilər buraya köçürülənə qədər bütün kəndlərin adları Azərbaycan-türk dilində idi. Ermənilər Qarabağda ya azərbaycanlıların yaşadıqları kəndlərdə məskunlaşır, ya da özləri yeni kəndlər salırdılar. Azərbaycanlılar yaşayan kəndlərdə yerləşdikdən sonra bu kəndlərin bəzilərinin adları olduğu kimi qalmış (məsələn, Ağbulaq, Xırmancıq, Tuğ, Daşaltı, Ballıca və b.), bəzi kəndlərin adları erməni dilinə dəyişdirilmiş (Ağdərə – Mardakert, Qozlu – Baquas, Qızılqaya – Artuyunqomer, Ballıqaya – Kuran, Ulubaba – Uraxac, Ağkənd – Stepakşen, Marağa – Marquşevan və s.), bəzilərinin isə adları ermənilər tərəfindən erməni dilinə uyğunlaşdırılmışdı (məsələn, Seyidbəyli – Seidmen, Şıx Dursun – Sıxtoraşen, Daşkənd – Daşuşen, Göyarx – Levonarx, Mehdibəyli – Mextişen və s.) (40, 157).

1923-cü ildə Azərbaycan ərazisində qondarma inzibati vahidin – Dağlıq Qarabağ Muxtar Vilayətinin (DQMV) yaradılması Azərbaycanın ərazi bütövlüyü əleyhinə gec işə düşən mina rolunu oynadı.

Maraqlıdır ki, DQMV-nin yaradılması haqqında Azərbaycan MİK-nın 7 iyul 1923-cü il tarixli dekreti Qafqaz bürosunun adıçəkilən 5 iyul 1921-ci il tarixli qərarına zidd idi. Belə ki, həmin dekretdə, mərkəzi Xankəndi olmaqla Dağlıq Qarabağın erməni hissəsindən Azərbaycan SSR-in tərkib hissəsi kimi muxtar vilayət təşkil olunması qeyd olunurdusa, qərarda əksinə, yaranacaq muxtar vilayətin inzibati mərkəzi Şuşa şəhəri göstərilmişdi. MİK-nın 7 iyul 1923-cü il tarixli dekretində, həmçinin Şuşa vilayətin tərkibinə də daxil edilməmişdi. Yalnız iki həftədən sonra iyulun 21-də Şuşanın da DQMV-nin tərkibinə daxil edilməsi haqda qərar qəbul edilmişdi. Yeni yaradılmış vilayətdə Şuşa yeganə şəhər idi və onun əhalisi, əsasən,

azərbaycanlılardan ibarət idi. Ermənilər Şuşanın mərkəz elan edilməsi ilə muxtar vilayətin hakimiyyət orqanlarının azərbaycanlıların nəzarəti altına keçə biləcəyindən qorxaraq kiçik yaşayış məntəqəsi olan və yenə də azərbaycanlıların yaşadığı Xankəndinin vilayətin mərkəzi təyin edilməsinə nail oldular. Daşnaklardan ibarət Dağlıq Qarabağ erməni komitəsi də Azərbaycan KP qəza komitəsinə çevrildi.

Qarabağın, Şuşa qəzasının azərbaycanlı əhalisi burada muxtar vilayətin yaradılmasını, Şuşanın və azərbaycanlılar yaşayan kəndlərin onun tərkibinə qatılmasını etirazla qarşılasalar da, onların etirazına Bakıda məhəl qoyulmadı (101, 4–9). 1924-cü il noyabrın 26-da qəbul edilmiş «Əsasnaməyə» görə Şuşa qəzasının 115, Cavanşir qəzasının 52, Karyagin qəzasının 30, Qubadlı qəzasının isə 1 kəndi (cəmi 198) də DQMV-yə birləşdirildi. Nəticədə, ermənilər üçün yaradılmış muxtariyyət ərazisi azərbaycanlıların yaşadıqları kəndlər hesabına genişləndirilərək Azərbaycanın gələcək dövlətçiliyi üçün əsas təhlükəli amilə çevrildi. 1923-cü il sentyabrın 18-də ermənilər Xankəndinin adını dəyişərək bolşevik-daşnak Stepan Şaumyanın şərəfinə Stepanakert qoydular. Maraqlıdır ki, bir müddət bu şəhərin adı rəsmi sənədlərdə «Stepankənd» kimi yazılırdı, lakin sonralar ermənilər rəsmən «Stepanakert» adının bərqərar olmasına da nail oldular (101, 8).

Azərbaycan torpaqları hesabına faktiki olaraq ikinci milli dövlət qurumuna nail olan ermənilər Azərbaycanın zəngin təbii-iqtisadi potensialından istifadə edərək nəinki kasıb Ermənistan SSR, elə Azərbaycan, onun digər muxtar qurumu olan Naxçıvan MSSR-lə müqayisədə özləri üçün daha zəngin həyat şəraiti yaratdılar.

Sovet hakimiyyətinin bütün dövrlərində DQMV-nin sosial-iqtisadi, mədəni inkişaf göstəriciləri Azərbaycanın və Naxçıvanın orta inkişaf göstəricilərindən yüksək olmuşdur.

Hələ İkinci Dünya müharibəsinə qədər Dağlıq Qarabağda yerli sənaye sahələrinin yaradılması üçün böyük işlər görülmüş, 42 sənaye müəssisəsi, illik gücü 1,5 milyon kilovat saatlıq 4 elekrtik stansiyası tikilmiş, möhkəm sənaye bazası yaradılmışdı. Müharibə ərəfəsində DQMV-də istehsal olunan sənaye məhsulunun 95%-dən çoxunu yeni tikilmiş müəssisələr verirdi (170, 44–45). Sənayeləşdirmə planı həyata keçirilərkən vilayətin erməni rəhbərliyi öz səlahiyyətlərindən sui-istifadə edərək yeni müəssisələrin, əsasən, erməni yaşayış məntəqələrində yaradılmasına nail olur, azərbaycanlı əhaliyə ögey münasibət bəslənilirdi.

Azərbaycan dövlətinin qayğısı sayəsində 1923–1941-ci illərdə Dağlıq Qarabağda mədəni-maarif sistemi xeyli inkişaf etmiş, məktəblərin, mədəniyyət müəssisələrinin, elmi təşkilatların, mətbuat orqanlarının geniş şəbəkəsi yaradılmışdı. Müharibədən əvvəlki illərdə DQMV-də məktəblərin sayı 104-dən 196-ya, müəllimlərin sayı 222-dən 1996-ya, şagirdlərin sayı isə 6404-dən 40766-a çatmışdı. Bu göstəricilərə görə Dağlıq Qarabağ Azərbaycanın orta göstəricilərindən xeyli irəlidə idi.

Mədəni-maarif müəssisələrinin inkişafına görə də vilayət respublika regionları arasında birinci yerdə idi. Ərazisi və əhalisi Naxçıvan MSSR-lə müqayisədə əhəmiyyətli dərəcədə aşağı olsa da, buradakı mədəni-maarif müəssisələrinin sayı muxtar respublika ilə müqayisədə xeyli çox idi. DQMV-də kitabxanaların sayı 1941-ci ildə 66, klubların sayı 151, körpələr evinin sayı 57 təşkil edirdi. Naxçıvanda isə bu rəqəmlər müvafiq olaraq 80, 105 və 31 idi (51, 29; 54; 63–69). Həmin dövrdə vilayətdə çıxan 9 qəzetin 7-si ermənicə nəşr olunurdu (197, 85). Ermənicə radio qovşağı fəaliyyətə başlamış, 1932-ci ildə Xankəndində Dram Teatrı yaradılmışdı.

Müharibədən sonra da Dağlıq Qarabağın sənaye və kənd təsərrüfatı inkişaf etmiş, yeni müəssisələr fəaliyyətə başlamışdı. Həmin illərdə burada yerli xammal əsasında şərab zavodları, tikinti materialları kombinatı, tikiş fabriki, xalçaçılıq fabrikləri, elektrotexnika zavodu, bir sıra yeyinti sənayesi müəssisələri tikilib istifadəyə verilmiş, sənaye məhsulları istehsalı 4,2 dəfə, 1923-cü illə müqayisədə isə 316 faiz artmışdı (170). Əgər 60-cı illərdə Azərbaycanda sənaye məhsulu 94 faiz, Naxçıvan MSSR-də 93,4 faiz artmışdısa, DQMV-də bu göstərici 181 faiz təşkil etmişdi (170, 201; 29). 1946–60-cı illərdə elektrik enerjisi istehsalı 5 dəfə artaraq 70 mln. kilovata çatmışdı. Vilayətin 99,5%-i elektrik enerjisindən istifadə edirdi ki, bu ümumrespublika göstəriciləri arasında ən yüksək rəqəm idi (20, 44).

Vilayətin kənd təsərrüfatının inkişaf göstəriciləri də respublika və Naxçıvanın göstəricilərini qabaqlayırdı. Belə ki, 1970-ci ildə gün ərzində adambaşına düşən ümumi məhsul Azərbaycanda 4,7 manat, Naxçıvan MSSR-də 3,5 manat, DQMV-də 5,9 manat idi (51, 35). Əhalinin strukturunda, tərkibində, sosial-mədəni və təhsil səviyyəsində də mütərəqqi dəyişikliklər baş vermişdi. Vilayətdə hər bir sakinə 8 $m^2$ mənzil sahəsi düşürdü ki, bu respublika səviyyəsindən 2,5 dəfə çox idi. Təəssüf ki, muxtar vilayətin azərbaycanlılar yaşayan məntəqələri vilayətdə həyata keçirilən tikinti-abadlıq işlərindən kənarda saxlanırdı.

Azərbaycan hökuməti müharibədən sonrakı onilliklərdə muxtar vilayətdə səhiyyənin inkişafına 42351 manat pul ayırmışdı. Bu, Naxçıvan MSSR-ə ayrılandan 2,7 dəfə çox olmuşdu. Bununla belə istifadəyə verilmiş 22 səhiyyə müəssisəsindən yalnız 1-i azərbaycanlılar yaşayan kənddə inşa edilmişdi (168, 186). Əhalinin hər 10000 nəfərinə bütün Azərbaycanda 85,7, Naxçıvanda 83,5, Gəncə–Qazax bölgəsində 84,2, DQMV-də isə 94,7 xəstəxana çarpayısı düşürdü (29, 170).

Mədəni-maarif müəssisələri – məktəblər, klublar, kitabxanalar, bir qayda olaraq, erməni kəndlərində inşa olunurdu. Əgər 1960-cı illərin sonlarında DQMV-də 56 uşaq bağçası, 27 məktəbdənkənar uşaq müəssisəsi, 187 kitabxana, 190 klub, 153 kinoqurğusu fəaliyyət göstərirdisə, Naxçıvan MSSR-də bu göstəricilər müvafiq olaraq 22, 12, 135, 122, 113 təşkil edirdi (173, 376; 143, 90; 51, 40).

Heydər Əliyev SSRİ-nin siyasi rəhbərliyindən istefa verdikdən sonra ona qarşı irəli sürülən ittihamlardan biri də, guya, onun Azərbaycan SSR-ə rəhbərlik etdiyi dövrdə Dağlıq Qarabağa ögey münasibət göstərməsi, vilayətin erməni əhalisinə qarşı ayrı-seçkilik siyasəti yeritməsi olmuşdu. Bunu həm erməni millətçiləri, həm də M.Qorbaçov başda olmaqla o zamankı SSRİ rəhbərliyi tez-tez təkrar edirdi. M.Qorbaçov öz kitabında yazır ki, Azərbaycan rəhbərliyi Qarabağın əhalisinə heç də Lenin münasibəti ruhunda yanaşmayıb, bəzi hallarda isə sadəcə olaraq, qeyri-insani münasibət göstərib (106, 504). Lakin həqiqət burasındadır ki, bütün Azərbaycanda olduğu kimi, Dağlıq Qarabağ da özünün ən coşqun inkişaf dövrünü məhz 1970-ci illər – 80-ci illərin I yarısında, Heydər Əliyevin Azərbaycana rəhbərlik etdiyi dövrdə yaşamışdı. Əslində, erməni millətçiləri Dağlıq Qarabağda separatizm hərəkatına başlayarkən istifadə etdikləri dezinformasiya siyasətinin tərkib hissələrindən biri də, guya, vilayətin sosial-iqtisadi və mədəni inkişaf sahəsində geri qalması, erməni əhalisinin milli-mənəvi ehtiyaclarına Azərbaycan rəhbərliyinin laqeyd yanaşması haqqında yalanlar olmuşdu.

DQMV-nin 1970–1985-ci illərdə sosial-iqtisadi, mədəni inkişafını əks etdirən göstəricilər ermənilərin və onların havadarlarının bu ağ yalanlarını tamamilə alt-üst edir. Həmin illərdə muxtar vilayətin inkişafı üçün 483 mln. manat vəsait ayrılmışdı ki, bu da əvvəlki üç beşillikdəkindən 2,8 dəfə çox idi. Həmin dövrdə ümumi dəyəri 470 mln. manat olan əsas fondlar, 15 sənaye müəssisəsi və istehsal gücləri istifadəyə verilmişdi (190, 23).

1970–1985-ci illərdə DQMV-də elektrik enerjisi istehsalı 1,6 mln. kilovat saatdan (K.S.) 74,1 mln. kilovat saata çatmışdı. Adambaşına düşən elektrik enerjisi təminatına görə vilayət respublikada birinci yeri tuturdu (müqayisə üçün 1985-ci ildə DQMV-də adambaşına 463 k.s. düşdüyü halda, Naxçıvanda bu rəqəm cəmi 237 k.s., Gəncədə 239 k.s. təşkil etmişdi (82, 1988, 23 mart). 1970–1985-ci illərdə sənaye məhsulunun ümumi həcmi 300 faiz artmışdı ki, bu da respublika səviyyəsindən 3 dəfə artıq idi (190, 58). Sənayedə məşğul olan əhalinin sayına görə DQMV yalnız Bakı–Sumqayıt rayonundan geri qalırdı. Sənayedə çalışanların adambaşına pul gəlirləri 1113,5 manat təşkil edirdi ki, bu da ümumrespublika göstəricilərindən 97,8 manat, Naxçıvan MSSR-dən isə hətta 170,4 manat çox idi. Həmin müddətdə DQMV-də inkişaf etmiş nəqliyyat, rabitə sistemi təşəkkül tapmışdı.

Aqanbekyan və digərlərinin DQMV-nin Ermənistanla sıx təsərrüfat əlaqələri haqqında uydurmaları da faktlar və rəqəmlər təkzib edir. Belə ki, Dağlıq Qarabağın müəssisələri Azərbaycanın digər iqtisadi rayonları ilə sıx istehsal-texnoloji əlaqələrə malik olduğu halda, Ermənistan SSR-in bu əlaqələrdə payı cəmi 0,3 faiz təşkil edirdi, özü də bu əlaqələr uzun və sabit kooperasiya münasibətləri səciyyəsi daşımırdı (191, 286). Ermənistandan da buraya cəmi 1,5 milyon manatlıq (110 milyon manatlıq idxala qarşı) mal idxal olunurdu ki (ümumi idxalın cəmi 1,4 faizi), bu da, əsasən, xalq istehlakı malları idi. DQMV-də iqtisadiyyatın inkişafı Azərbaycanın başqa regionları ilə sıx əməkdaşlıq və kooperasiya hesabına təmin edilirdi. Həmin regionlardan Dağlıq Qarabağa müxtəlif avadanlıq, metal məmulatı, tikinti materialları, yanacaq-energetika ehtiyatları, xammal və digər müxtəlif mallar göndərilirdi (18). Bu, DQMV iqtisadiyyatının Azərbaycan xalq təsərrüfat kompleksinin, respublika daxili əmək bölgüsünün üzvi hissəsi olduğunu əyani şəkildə təsdiq edir.

Göstərilən dövrdə kənd təsərrüfatı istehsalı təxminən 2 dəfə artmış, adambaşına düşən kənd təsərrüfatı məhsullarının həcminə (692 manat) görə vilayət ümumrespublika səviyyəsini (588 manat) ötüb keçmişdi. Əkinçiliyi daha da yüksəltmək üçün tədbirlər görülürdü. Lakin DQMV-də kifayət qədər məhsul götürüldüyü halda, dövlətə məhsul satışının səviyyəsi Azərbaycan üzrə orta rəqəmlərdən yüksək deyildi, kənd təsərrüfatı bitkilərinin əksəriyyəti üzrə isə hətta xeyli aşağı idi.

DQMV-nin iqtisadi yüksəlişinə göstərilən qayğı və diqqət əhalinin rifahının və məişətin yaxşılaşdırılmasına şərait yaratmışdı. Əhalinin pul

gəlirləri, əmanətçilərin sayı, əmanətlərin miqdarı, pərakəndə ticarət dövriyyəsinin həcmi və digər göstəricilər üzrə Dağlıq Qarabağ əhalisinin rifah halı Azərbaycanın digər bölgələrindən yüksək idi (191, 287–289). İctimai-iaşə, ticarət müəssisələrinin sayı da (hər 10000 nəfərə) respublika və Naxçıvan MSSR göstəricilərindən yuxarı idi. Məsələn, ticarət müəssisələrinin sayı Azərbaycan üzrə hər 10000 nəfərə 28, Naxçıvan MSSR 24, DQMV-də isə 42 olmuşdu. Özü də bu müəssisələrdə çalışanların 95 faizini ermənilər təşkil edirdi (69, 102). Vilayətdə mənzil tikintisi də sürətlə aparılırdı. Hər bir sakinə düşən mənzil sahəsi DQMV-də 14,6 $m^2$, Naxçıvan MSSR-də 9,5 $m^2$, Bakıda 11,7 $m^2$, bütün Azərbaycanda isə 10,9 $m^2$-ə bərabər idi (51, 44).

1978-ci ildə Yevlax–Stepanakert qaz xəttinin istifadəyə verilməsi nəticəsində 1985-ci ildə artıq DQMV əhalisi 100% qazla təmin edilmişdi, halbuki o vaxt Azərbaycanın bir çox rayonlarına qaz hələ çəkilməmişdi. O zaman H.Əliyev Naxçıvan MSSR-in qazla təmin olunması məsələsini həll etməyə çalışarkən onun qarşısında şərt qoyulmuşdu ki, Yevlax–Stepanakert–Gorus–Naxçıvan qaz kəmərinin çəkilib başa çatdırılması və Naxçıvana qaz verilməsi üçün bütün Dağlıq Qarabağ və Ermənistanın qaz keçən rayonları qazla təmin edilməlidir. Yalnız bu şərtlərlə Moskva Naxçıvanı qazla təmin etməyə razılıq vermişdi (38, 89). Respublika rəhbərliyinin səyləri nəticəsində 1979-cu ildə 26 km-lik Ağdam–Stepanakert dəmiryolunun çəkilib başa çatdırılması vilayətin iqtisadi həyatında mühüm hadisə oldu. Stepanakert şəhəri ilə Azərbaycanın sənaye mərkəzləri arasında birbaşa dəmiryolu rabitəsi yaradıldı.

Adambaşına düşən avtomobillərin, telefonların sayına görə də DQMV Azərbaycanda birinci yerdə dururdu. Əhalinin sağlamlığının qorunması sahəsində də muxtar vilayətdə müsbət dəyişikliklər baş vermişdi. 1985-ci ildə əhalinin hər 10000 nəfərə düşən xəstəxana çarpayılarının sayı Azərbaycanda 97,8 ədəd, Naxçıvan MR-də 94,6 ədəd, DQMV-də isə 104,6 ədəd təşkil edirdi. Əhalinin tibbi personalla təminatı göstəricilərinə görə də vilayət orta respublika göstəricilərini ötüb keçmişdi (171; 183, 289). Əhalinin idman qurğuları ilə təminatı sahəsində də vilayət birinci yerdə dururdu. O zaman Azərbaycanda mövcud olan 66 stadiondan 12-si DQMV-də yerləşirdi (69, 29–31).

Muxtar vilayətin əhalisinin gündəlik tələbat malları ilə kifayət qədər təmin olunmadığı barədə iddialar da həqiqətdən tamamilə uzaq idi.

DQMV-də ərzaq məhsulları istehlakının strukturu tamamilə normal idi. Məsələn, Stepanakertdə hər sakinə ildə 12 kq-dan çox yağ düşdüyü halda, Əli Bayramlıda (indiki Şirvan şəhəri) bu rəqəm 10 kq, Mingəçevirdə 11,5 kq, Kirovabadda 10,5 kq təşkil edirdi. Adambaşına süd və ət istehsalı üzrə də Stepanakert yalnız Bakıdan geri qalırdı (32, 1988-ci il 24 fevral). Vilayətdə iqtisadiyyatın sürətlə inkişaf etməsi Azərbaycan hökumətinin buraya əsaslı vəsait qoyması sayəsində təmin olunurdu.

Vilayətin gələcək inkişaf perspektivləri hələ hadisələr başlamamışdan əvvəl müəyyənləşdirilmişdi. Xalq təsərrüfatı planlarında Stepanakertdə iri kənd təsərrüfatı maşınları zavodunun tikintisini başa çatdırmaq, sənaye müəssisələrinin filiallarını yaratmaq, elektronika zavodunu, ipək fabrikini genişləndirmək, Şuşa və Hadrut rayonlarının kompleks sosial-iqtisadi inkişafı planlaşdırılmışdı.

Azərbaycanın digər rayonları ilə müqayisədə DQMV-nin mədəniyyəti daha sürətlə inkişaf etmişdi. 1970–1985-ci illərdə Azərbaycan hökuməti vilayətin inkişafı üçün 260431000 manat vəsait ayırmışdı ki, bu Gəncə–Qazax, Lənkəran–Astara və digər bölgələrə ayrılan vəsaitdən 2 dəfə artıq idi. Adambaşına düşən klubların sayına (267) görə DQMV keçmiş SSRİ-də birinci yeri tuturdu. 10000 nəfərə SSRİ-də 4,8, Azərbaycan SSR-də 5, Ermənistan SSR-də 3,8 klub düşürdü, DQMV-də bu rəqəm 15-ə bərabər idi. 300-dən 500-ə qədər əhalisi olan yaşayış məntəqələrinin hamısı klub müəssisəsi ilə təmin olunmuşdu. Halbuki respublika üzrə klublar olmayan yaşayış məntəqələri 40 faizə yaxın idi. 10000 nəfərə DQMV-də 13 kitabxana (Azərbaycan SSR üzrə 6, Ermənistan SSR üzrə 6, SSRİ üzrə 4,8), 11,2 kinoqurğu (Azərbaycanda 3, Ermənistanda 2,9, SSRİ-də 5,4) (51, 46–47) düşürdü. Bu göstəricilərə görə vilayət SSRİ-də qabaqcıl yerlərdən birini tuturdu.

Əhalinin məktəbəqədər uşaq müəssisələri ilə təminatında da DQMV (35%) ümumrespublika (20%) və Naxçıvan MR-in göstəricilərini (12%), ötüb keçmişdi.

Dağlıq Qarabağda məktəb sistemi də başqa regionlarla müqayisədə xeyli irəlidə idi. Əgər Naxçıvan MR-də hər məktəbə 296 şagird, hər müəllimə 10 şagird düşürdüsə, vilayətdə bu rəqəmlər müvafiq olaraq 177 və 8,5 təşkil edirdi (51, 46).

Vilayət ermənilərinin milli-mədəni ehtiyaclarının ödənilməməsi haqqında iddialar da Azərbaycan xalqına qarşı iftira və böhtandan başqa

bir şey deyildi. Həm Azərbaycanda, həm də DQMV-də erməni dilində elmi, mədəni, siyasi, bədii ədəbiyyat, dərsliklər kifayət miqdarda nəşr olunurdu. Sovet hakimiyyətinin son iki beşilliyində erməni yazıçılarının 84 adda ümumi tirajı 500000-dən çox olan kitabı çıxmışdı ki, onlardan 365600 tiraj (66 adda) elə erməni dilində idi. DQMV-də erməni dilində müntəzəm teleradio verilişləri yayılır, qəzetlər nəşr olunurdu.

Çox təəssüf ki, bu yalanlar indi də dünya və Rusiya mətbuatında, elmi ədəbiyyatda öz rolunu oynamaqdadır. Məsələn, tarixçi R.Medvedyev yazır ki, Dağlıq Qarabağda Azərbaycan hakimiyyəti erməni dilinin tədrisinə az qayğı göstərirdi, yerli pedaqoji institutda tədris yalnız Azərbaycan dilində (!) aparılırdı, Ermənistan tarixinin öyrənilməsi dayandırılmışdı. Erməni dilində ədəbiyyat nəşri və satışı ixtisar edilmiş, DQMV-yə erməni televiziyasının verilişlərinin ötürülməsi nizama salınmamışdı (158, 240). Vilayətin Ermənistanla mədəni, elmi və digər əlaqələrinə heç bir məhdudiyyət qoyulmurdu. Əksinə, Ermənistan SSR bir çox sahələrdə Azərbaycanın suveren hüquqlarını tapdalayır, onun səlahiyyətlərini mənimsəyirdi. Nə o vaxt, nə də indi Dağlıq Qarabağda Azərbaycan SSR-in rəhbərliyi tərəfindən ermənilərin milli hüquqlarının tapdalanması, erməni dilinin sıxışdırılması ilə bağlı nə SSRİ, nə Ermənistan, nə də ki, Dağlıq Qarabağ separatçıları bircə dənə də tutarlı fakt gətirə bilməyiblər.

Kadr siyasətinin həyata keçirilməsində, partiya, sovet, yerli icra hakimiyyəti, hüquq-mühafizə orqanlarında üstün mövqelər ermənilərdə idi. Üstəlik regionun yerli əhalisi olan azərbaycanlıların milli-mənəvi ehtiyaclarının ödənilməsinə vilayətin erməni rəhbərliyi daim ögey münasibət bəsləyirdi, onlar öz vətənlərində ikinci dərəcəli vətəndaşlara çevrilmişdilər.

Azərbaycanda ermənilərin, eləcə də digər millət nümayəndələrinin bütün hüquqları təmin edilsə də, Ermənistan SSR-də azərbaycanlı əhalinin ən adi vətəndaş hüquqları respublika rəhbərliyi və yerli orqanlar tərəfindən kobudcasına pozulurdu. Bunu Azərbaycan SSR-də və Ermənistan SSR-də erməni və azərbaycanlı əhalinin məşğulluq üzrə paylanması, məşğul əhali arasında bu millətlərin xüsusi çəkisi (1979-cu ilin əhali siyahıyaalınmasına görə) də tam təsdiq edir (191, 306–309). Əgər Azərbaycanda əhalinin ümumi çəkisində ermənilər 7,9 faiz idisə, onlar məşğul əhalinin 8,8 faizini təşkil edirdilər. Ermənistan SSR-də isə azərbaycanlılar ümumi əhalinin 5,3 faizini təşkil etmələrinə baxmayaraq,

məşğul əhalinin cəmi 4,5 faizini təşkil edirdilər. Ermənilər Azərbaycanda rəhbər orqanlarda 9 faiz, azərbaycanlılar isə Ermənistanda cəmi 2,1 faiz idilər. Mühəndis-texniki və səhiyyə işçiləri arasında Azərbaycanda ermənilər 11 və 9,5 faiz, Ermənistanda isə azərbaycanlılar 0,5 və 1,5 faiz təşkil edirdilər (191, 306–309).

Erməni millətçiləri və onların dəstəkçiləri Dağlıq Qarabağda baş verən etnodemoqrafik proseslərə də qərəzli yanaşır, onları saxtalaşdırmaqda davam edirlər. Regionda etnodemoqrafik şəraitin hansı amillər hesabına ermənilərin xeyrinə dəyişməsi haqqında biz artıq əvvəlki və bu paraqrafda bəhs etmişik. Sovet dövründə muxtar vilayətdə ermənilərlə azərbaycanlılar arasında kəmiyyət dəyişiklikləri baş verməkdə idi. Doğuşda, təbii artım səviyyəsindəki fərqlər muxtar vilayətin milli tərkibinə öz təsirini göstərirdi. Sovet dövrünün son 25 ilində doğum və təbii artım əmsalı azərbaycanlılarda ermənilərdən 1,6–1,7 dəfə yüksək idi.

Bütün bunlar aydın şəkildə göstərirdi ki, Dağlıq Qarabağ hadisələrinin kökündə erməni əhalinin hansısa sosial-iqtisadi, mədəni problemləri deyil, Ermənistanın Azərbaycana ərazi iddiaları, Dağlıq Qarabağı ilhaq etmək planları dururdu.

Sual olunur, bütün bu həqiqətləri erməni şovinistləri və onların Kremldəki havadarları bilirdilərmi? Əlbəttə, bilirdilər. Lakin onlara həqiqət deyil, yalan üzərində qurulmuş çirkin niyyətlərini və məqsədlərini həyata keçirmək üçün imkan lazım idi və onlar bu imkandan məharətlə istifadə etdilər.

Azərbaycan rəhbərliyi isə tarixi və real vəziyyəti saxtalaşdıranlara qarşı ciddi müqavimət göstərə bilmədi. Azərbaycan tədricən DQMV-nin idarə olunmasından kənarlaşdırıldı. Ermənistanın isə vilayətə siyasi, iqtisadi, mədəni, daha sonra isə hərbi ekspansiyası gücləndi. Ermənistan Respublikası öz ərazisindən sonuncu azərbaycanlıları da deportasiya etdikdən sonra Dağlıq Qarabağı və ətraf rayonların işğalını başa çatdırdı.

## II FƏSİL

## SUMQAYIT HADİSƏLƏRİ ƏRƏFƏSİNDƏ SSRİ-də VƏ AZƏRBAYCAN SSR-də SİYASİ VƏZİYYƏT

### 2.1. SSRİ-də siyasi və iqtisadi böhranın dərinləşməsi, milli münasibətlərin kəskinləşməsi

Xalqımızın, dövlətimizin yaşadığı faciələrin, fəlakətlərin, o cümlədən Sumqayıt hadisələrinin bir səbəbi də keçmiş SSRİ-də mövcud olmuş sosial-siyasi, mənəvi, ideoloji amillərdən qaynaqlanırdı. Həmin dövrdə Azərbaycanda cərəyan edən proseslər Sovet İttifaqında, eləcə də beynəlxalq aləmdə mövcud olmuş ictimai-siyasi vəziyyətlə vəhdətdə inkişaf edirdi.

1970–80-ci illərdə sovet cəmiyyətinin sosial strukturu kifayət qədər sabit və möhkəm olsa da, mütərəqqi dəyişikliklərə qadir deyildi. Bu baxımdan onun siyasi inkişafı xüsusi xarakter daşıyırdı. SSRİ-də təşəkkül tapmış sənaye cəmiyyəti Qərbi Avropa və Şimali Amerika ilə müqayisədə müəyyən fərqli cəhətlərə malik idi. SSRİ-nin siyasi, iqtisadi və sosial strukturları dövlətin tam nəzarəti altında, həddən artıq mərkəzləşdirilmiş strukturlar kimi yaradılmışdı. Sovetlərin sosial strukturu industrial cəmiyyətlərə xas olan təbəqələrdən ibarət idi: fəhlə və kolxozçular, marqinal qruplar, geniş orta sinif – ziyalılar, qulluqçular, menecment (təsərrüfat rəhbərləri) və hakim bürokratiya (nomenklatura). Sosial sistemin böhranı kəskinləşdikcə bu təbəqələr arasında ziddiyyətlər də artırdı. Nomenklaturanın imtiyazları, bürokratik aparatın səmərəsizliyi, məmurların zülmü və məsuliyyətsizliyi, korrupsiya hamıda hiddət doğururdu. Eyni zamanda əsas sosial təbəqələr sosial dövlətin üstünlükləri olan – təhsilin və səhiyyənin əlçatarlığına, sosial təbəqələşmənin dərin kök salmamasına və s. artıq öyrənmişdilər.

Yüksək tribunalardan inkişaf etmiş sosializm haqqında şüarlar səslənməsinə baxmayaraq, insanların yaşayış səviyyəsi və tələbatları ilə elan olunmuş real vəziyyət arasında kəskin fərqlər mövcud idi.

Nə qədər ki hərbi-siyasi, maddi ehtiyatlara malik idi, sovet sistemi iqtisadi inkişafı və sosial-siyasi sabitliyi təmin edirdi. Ona görə də cəmiyyət öz inkişafında elmi-texniki tərəqqi həddinə çatdıqda, postsənaye dövrünün vəzifələrini yerinə yetirmək zəruriliyi qarşısında durduqda, hakim elita bu vəzifələri dərk etmək və yerinə yetirmək iqtidarında olmadı.

SSRİ kimi sərt, qeyri-çevik modelə malik dövlətdə rəvan dəyişikliklər imkanı, demək olar ki, mövcud deyildi. Hakim elita dilemma qarşısında qalmışdı – dəyişikliklər dağıdıcı xarakter daşıyırdı, lakin onlarsız iqtisadiyyatın sonrakı inkişafı mümkün deyildi. İndustrial sistem öz inkişafının ən son həddinə çatsa da, elita postindustrial vəzifələri praktik olaraq dərk etmişdi. SSRİ-də mövcud olmuş sistem əməyin və həyatın alternativ formalarının qarşısını aldığından ETT-nin yeni mərhələsinə, postindustrial (informasiya) cəmiyyətinə, texnologiyaların genişmiqyaslı istehsalına keçid mümkün olmurdu. İnformasiya-texnoloji inqilab üçün sosial şəraitin olmaması SSRİ-nin həm fövqəldövlət kimi, həm dövlətlərarası rəqabətdə mövqeyinin zəifləməsinə, həm də onun əhalisinin sosial rifahının və təhlükəsizliyinin aşağı düşməsinə gətirib çıxarırdı.

Artıq 1980-ci illərin ortalarında SSRİ real sosial fəlakətə gətirib çıxara biləcək bütöv bir böhranlar kompleksi ilə üzləşmişdi. Birincisi, bu fövqəldövlət statusunun böhranı idi. SSRİ sürətlə silahlanmada geridə qalmağa başlamış, Əfqanıstan və digər hadisələr onun beynəlxalq nüfuzuna ciddi ziyan vurmuşdu. Əhali sovet iqtisadiyyatının Qərb ölkələrinin nailiyyətləri fonunda necə geri qaldığını artıq öz real həyatlarında hiss edirdi. İkincisi, ölkədə, guya, uğurla həll edilməsi elan olunan, əslində isə daha da kəskinləşən milli münasibətləri, etnodemoqrafik disproporsiyaları idarəetmənin imperiya sistemi və resursları getdikcə tükənən və zəifləyən sosial dövlətin köməyi ilə nizamlamaq daha da mürəkkəbləşirdi. Üçüncüsü, «dövlət sosializmi»nin, industrial dövlətin, inhisarçı cəmiyyətin böhranı da dərinləşirdi. Kütləvi, standartlaşmış istehsala, planlı iqtisadiyyata, bütün iqtisadi proseslərin bürokratik idarə edilməsinə əsaslanan işçilərin təşəbbüskarlığına mane olan sosial-iqtisadi münasibətlər sistemi istehsalın səmərəliliyinin artırılmasını, müdafiə sənayesinin və əhalinin artmaqda olan ehtiyaclarının ödənilməsi üçün tələb olunan məhsulların buraxılmasını təmin etmək iqtidarında deyildi. Bu isə digər problemlərin (ekoloji, ərzaq demoqrafik və s.) yaranmasına gətirib çıxarırdı. Dördüncü, totalitar siyasi sistemin böhranı da dərinləşirdi. Sovet adamları səs-

siz-səmirsiz idarə olunan obyekt rolu ilə barışmaq istəmirdilər. Baxmayaraq ki, kommunist ideologiyası SSRİ-də sovet demokratiyasının olduğunu, xalqın isə ölkənin sahibi olduğunu elan edirdi. Nomenklaturanın güzəştləri, bürokratik aparatın səmərəsizliyi, məmurların özbaşınalığı, korrupsiya hamıda nifrət hissi yaradırdı. Nəticədə, artıq 80-ci illərin ortalarında SSRİ genişmiqyaslı struktur böhranı ilə üzləşmişdi.

1980-ci illərin sonunda SSRİ-də yaranmış və onun süqutuna gətirib çıxaran siyasi, iqtisadi, mənəvi böhran əsası hələ 1917-ci ildə qoyulmuş sovet sosializminin ümumi böhranı idi. 70 il ərzində Sovet İttifaqı sosial-iqtisadi, mədəni sahələrdə, kapitalizm dünyası ilə rəqabətdə bir çox uğurlara imza atsa da, 50-ci illərin sonlarından başlayaraq ölkənin inkişaf templəri sürətlə aşağı düşməyə başladı (158, 103–109). Artıq 70-ci illərdə SSRİ bir sıra sahələr üzrə (əsasən, hasilat və xammal istehsalı sahələrində) ABŞ-ı ötüb keçsə də, iqtisadi inkişafın real göstəriciləri üzrə (əhalinin gəlirləri, istehsalın səmərəliliyi, əmək məhsuldarlığı və s.) mənfi dinamikaya malik idi. SSRİ-də, demək olar ki, sənaye istehsalı və bütövlükdə iqtisadiyyatın ekstensiv inkişaf ehtiyatları tam tükənmişdi. İqtisadi inkişafın əsas göstəricisi keyfiyyət ilə deyil, ümumi məhsul istehsalının kəmiyyət göstəriciləri ilə ölçülürdü. 1980-ci illərin əvvəllərində Qərb və SSRİ arasında iqtisadi yarışda ikinci getdikcə uduzmaqda idi. İqtisadiyyat, demək olar ki, çıxılmaz vəziyyətə düşmüşdü. İri iqtisadiyyatın inzibati metodlarla, mərkəzləşdirilmiş planlı sistemlə idarə edilməsi tamamilə səmərəsiz idi. SSRİ-də formalaşmış ictimai-siyasi və dövlət sistemi inkişafa və dəyişikliyə qadir deyildi. SSRİ bünövrəsi çökmüş, ancaq hələ də ayaq üstə dayanmış nəhəng binaya bənzəyirdi. Bu binanın bünövrəsini Sov. İKP və onun ideologiyası təşkil edirdi. Sovet İttifaqı ideoloji dövlət idi, onun ideologiyasında azad, demokratik, maddi və mənəvi cəhətdən yüksək cəmiyyətin qurulması ideyası üstünlük təşkil edirdi. Lakin SSRİ-də elan olunmuş azadlıq və demokratiyanın, maddi rifahın heç biri yox idi. Sovet iqtisadiyyatı dalana dirənmiş və inkişafın əksər stimullarını itirmişdi.

Ölkənin iqtisadi qüdrəti və iqtisadi səviyyəsi ümumi məhsul istehsalına görə deyil, adambaşına düşən ümumi daxili məhsul istehsalına görə ölçülürdü. Bu göstəriciyə görə SSRİ 20 kapitalist ölkəsi arasında 70 il ərzində yalnız İtaliyanı ötüb keçə bilmişdi.

Beləliklə, sovet cəmiyyətinin sonrakı inkişafı «dövlət sosializmi» modelindən qətiyyətlə imtina etməyi tələb edirdi. Bu mənada dəyişikliklər (yenidənqurma) qaçılmaz idi. Ancaq islahatların istiqamətləri, onların

nəticələri, SSRİ-nin bir fövqəldövlət kimi taleyi hakim elitadakı qüvvələr nisbətindən və beynəlxalq vəziyyətdən asılı idi.

İqtisadi və maliyyə dalanından çıxmağın əsas şərti yüksək səriştəli liderlərin mövcudluğudur. Lakin SSRİ belə liderlərə malik deyildi. Kadr çatışmazlığı, səriştəli liderlərin olmaması bu ölkənin əsas defisiti oldu.

1982–1985-ci illərdə ölkənin yaşlanmış liderlərinin bir-birini əvəzləməsi gedişində rejimdaxili qruplaşmalar gücləndi və mürəkkəb mübarizə nəticəsində hakimiyyətə M.Qorbaçov və onun komandası yiyələndi.

Tarixçi R.Medvedyev SSRİ-nin yaşadığı çoxtərəfli və dərin böhranın göstəricilərindən biri kimi kadr böhranını qeyd edir. Siyasi büro üzvlərinin orta yaş həddi 1980-ci ildə 75 il təşkil edirdi. Dövlətin və partiyanın işləri ilə modernləşən həyatla ayaqlaşmaq iqtidarında və həvəsində olmayan, ehkamçı baxışlara malik ahıl və xəstə insanlar məşğul olurdular. Ona görə də K.Çernenkonun qısamüddətli hakimiyyəti dövründə gənc M.Qorbaçovun bütün hakimiyyət riçaqlarını ələ keçirməsi və onun ölümündən sonra baş katib olması təəccüblü qarşılanmamalıdır. M.Qorbaçovu həm MK-nın əksər tərkibi, həm də güc nazirlikləri müdafiə edirdilər. R.Medvedyev qeyd edir ki, 1985-ci ildə intellektinə, siyasi qabiliyyətinə və işgüzar keyfiyyətlərinə görə Siyasi büronun ən güclü üzvü 62 yaşlı Heydər Əliyev idi. Lakin o, Moskvada cəmi iki il yarım idi işləyirdi və buraya müsəlman Azərbaycanından gətirilmişdi. Əliyev güclü iradəyə, böyük iş qabiliyyətinə və müstəsna hafizəyə malik idi. Həm də onun o vaxtlara görə parlaq siyasi bioqrafiyası var idi. Lakin onun Moskvanın hakimiyyət aparatlarında heç bir dəstək qrupu yox idi və o, heç bir iddia ilə çıxış etməyə çalışmırdı (158, 9–10). Sonralar M.Qorbaçov özü də etiraf etmişdi ki, yazılmamış ənənələrə görə H.Əliyevin dövlətin başına gətirilməsi mümkün deyildi. Çünki o nə rus idi, nə də slavyan. Heydər Əliyevin prinsipiallığı, obyektivliyi, haqsızlıqlara qarşı dözümsüzlüyü və başqa keyfiyyətləri ona baha başa gəldi. 1987-ci ilin oktyabrında H.Əliyev siyasi rəhbərlikdən uzaqlaşdırıldıqdan sonra ermənilər Qarabağı ilhaq etmək üçün açıq mübarizəyə başladılar.

1985-ci ilin aprel plenumunda M.Qorbaçov yeni təsərrüfat mexanizmi konsepsiyasını irəli sürdü: elmi-texniki tərəqqinin sürətləndirilməsi, vətən maşınqayırmasının yenidən qurulması, yeni maşın və avadanlığın istehsalı, yüksək texnologiyaların tətbiqi. Bunlarla yanaşı, iqtisadiyyatın idarə edilməsinin mərkəzsizləşdirilməsi, müəssisələrin hüquqlarının

genişləndirilməsi, təsərrüfat hesabının geniş tətbiqi, əmək kollektivlərinin məsuliyyətinin və maraqlarının yüksəldilməsi kimi cəlbedici ideyalar ortaya atıldı (106, 280). Cəmiyyətin sosial-iqtisadi inkişafının sürətləndirilməsi kursu götürüldü. «Sürətləndirmə» yeni komandanın ilk ikiillik (1985–1986) fəaliyyətinin «vizit kartı» oldu, 1987-ci ilin əvvəllərində isə yeni siyasətin əsas prinsipləri kimi «yenidənqurma» və «aşkarlıq» terminləri işlədilməyə başlandı.

Növbəti, XII beşillik planda milli gəliri 20–22%, sənaye məhsulunu 21–24%, kənd təsərrüfatını isə 2 dəfə artırmaq nəzərdə tutulurdu. Sənaye məhsulunun səviyyəsinə görə 2000-ci ildə ABŞ-a çatmaq vəzifəsi müəyyənləşdirilmişdi. Bütün bunlar «sürətləndirmə» konsepsiyasının əsassız, reallıqları nəzərə almayan, hətta avantürist xarakter daşıdığını sübut edirdi. Əvvəlki direktiv aktlar kimi bu qərarlar da heç bir nəticə vermədi. Yeni komandanın qəbul etdiyi ilk qərarlardan biri də sərxoşluq və alkoqolizmlə mübarizə haqqında oldu. Bu məqsədlə xüsusi komissiya yaradılmış və 1985-ci ilin mayında Sov.İKP və SSRİ Nazirlər Sovetinin qərarı qəbul edilmişdi. Həmin qərarla faktiki olaraq «quru qanun» tətbiq olunmağa başladı. Kampaniyanın əks nəticələrə gətirib çıxaracağını, büdcəyə ziyan vuracağını və buna görə də heç bir səmərəsi olmayacağını əsas gətirərək Siyasi büronun bəzi üzvləri ona qarşı çıxdılar. SSRİ Nazirlər Soveti sədrinin I müavini H.Əliyev bu qərarı düşünülməmiş və əsaslandırılmamış addım kimi qiymətləndirirdi. Sonralar bu qərarın nəticələrini qiymətləndirərkən hesablanmışdır ki, onun həyata keçirilməsi 1985–1986-cı illərdə üzüm sahələrinin $^{1}/_{4}$ hissəsinin məhv edilməsinə, büdcəyə yeri doldurulmaz dərəcədə ziyan vurulmasına, ölkədə inflyasiyanın, əmtəə defisitinin artmasına səbəb olmuşdu. İstehsalın artmasına baxmayaraq, mağazalarda şəkər, qənnadı məhsulları, tomat, spirt tərkibli kimyəvi maddələr tez zamanda yoxa çıxdı (180, 32–33). Sərxoşluqla mübarizənin ən yarıtmaz tərəflərindən biri o idi ki, bu kampaniya bütün SSRİ respublikalarında eyni tərzdə tətbiq edilmişdi. Halbuki alkoqol və spirtli içkilərin istehlakına görə milli respublikalar arasında ciddi fərqlər var idi. Nəticədə, hətta süfrə üzümünün istehsal edildiyi müsəlman respublikalarında, o cümlədən Azərbaycanda bu strateji məhsulun istehsalı üçün zəruri baza tam məhv edilmişdi və indiyə qədər öz əvvəlki potensialını bərpa edə bilməmişdir.

1986-cı ilin ortalarından «ölkənin sosial-iqtisadi inkişafının sürətləndirilməsi» ideyası artıq əhəmiyyətini itirməyə başladı. İqtisadi problemlər

açıq şəkildə özünü büruzə verirdi. 1985-ci ildə büdcə gəliri 17 milyard manat oldu, 1986-cı ildə isə bu rəqəm 3 dəfə artdı (Согрин В. Политическая история современной России. М., 1994, с. 21). Ölkənin maliyyə problemləri mürəkkəbləşirdi. Büdcə ilə bağlı eksperimentlər, neft gəlirlərinin azalması qiymətlərin və emissiyasının gizli artımına gətirib çıxarırdı.

İqtisadiyyatın inkişafının sürətləndirilməsi haqqında çıxışlara və şüarlara baxmayaraq, 1985-ci ildə ümummilli gəlir SSRİ-də rəsmi statistikaya görə cəmi 2,3% artmışdı. Bu 1981–1984-cü illərdəki ortaillik artım templərindən aşağı, 1976–1980-ci illərin göstəricilərindən isə daha da aşağı idi. Sənaye məhsulu cəmi 3,5%, kənd təsərrüfatı məhsulu isə cəmi 0,2% artmışdı. Ölkədə pərakəndə əmtəə dövriyyəsi 2% artdığı halda, xarici ticarət dövriyyəsi 1% aşağı düşmüşdü. İqtisadi inkişafın heç bir göstəricisinə görə 1985-ci ilin planı yerinə yetirilməmişdi. 1981–1985-ci illərə dair XI beşillik plan da yerinə yetirilməmiş oldu. 1987-ci ildə keçirilmiş Sov.İKP XXVII qurultayının qərarları SSRİ-nin iqtisadi inkişafının sürətləndirilməsini nəzərdə tuturdu. Lakin 1986-cı ilin inkişaf göstəriciləri bu ümidləri puça çıxardı. Çoxsaylı qərarların qəbul edilməsinə, inzibati tədbirlərə baxmayaraq, iqtisadiyyat böhrana düşməkdə idi. 1987-ci ilin göstəriciləri daha da pis oldu. Ümummilli məhsul cəmi 2,9% (1986-cı ildə 3,5%), sənaye məhsulu 3,8% (1986-cı ildə 4,4%), kənd təsərrüfatı məhsulları 0,6% aşağı düşmüşdü. İllik statistik məlumatlara görə 1985–1987-ci illərdə əhalinin real gəliri 2% artmışdı. Lakin bu aşağı göstəricilər belə, saxta idi, çünki əmtəə və xidmətlərin kəskin defisiti, gizli iqtisadiyyatda qiymət artımı daha yüksək idi (158).

Sovet iqtisadiyyatında böhranın ən ciddi göstəricisi dövlət büdcəsinin defisiti (xərclərin gəlirləri üstələməsi) oldu. Rəsmi göstəricilərə görə 1950–1980-ci illərdə büdcə gəlirləri xərcləri 2–3% üstələyirdi. Lakin artıq 1985-ci ildə bu nisbət təqribən 12 milyard mənfi saldo, 1986-cı ildə 47 milyard manat olmuşdu, 1987-ci ildə isə bu rəqəm 50 milyard manatdan çox təşkil etmişdi (173). Sonrakı illərdə bu fərq getdikcə dərinləşmişdi.

İqtisadi böhranın dərinləşməsinin bir sıra obyektiv və subyektiv səbəbləri var idi. Sovet büdcəsinin gəlirlərinin aşağı düşməsinin əsas səbəblərindən biri dünyada neftin qiymətinin aşağı düşməsi oldu. 60-cı illərdə dünya bazarlarında neftin qiyməti çox ucuz idi. Əsas istehlakçı olan Qərbi Avropa və Yaponiyaya neft, əsasən, Yaxın və Orta Şərqdən, İran körfəzindən aparılırdı. Ərəb–İsrail müharibəsi (1973), İranda islam inqi-

labı, sovet qoşunlarının Əfqanıstana müdaxiləsi neftin və digər enerji resurslarının qiymətinin dəfələrlə artmasına gətirib çıxardı. 1982-ci ildə neftin qiyməti 1972-ci illə müqayisədə 10 dəfə yüksək idi. Bu illərdə neft SSRİ-nin ixrac gəlirlərinin yarısını təşkil edirdi. 1973–84-cü illərdə Sovet İttifaqı neft satışından 200–250 milyard dollar gəlir götürmüşdü. Lakin 1980-ci illərdə Qərbi Avropada enerji tutumlu istehsalın modernləşdirilməsi, yeni, iqtisadi cəhətdən qənaətcil texnologiyaların tətbiqi, qaz istehsalının artması, Şimal dənizində neft yataqlarının kəşfi, eyni zamanda ənənəvi neft ölkələrində neft hasilatının sürətlə artması neftə olan tələbatın aşağı düşməsinə gətirib çıxardı. 1980-ci ildə, bir barrel neftin qiyməti 80 dollar, 1983-cü ildə 30 dollar, 1987-ci ildə, hətta 12 dollara qədər aşağı düşdü. SSRİ-nin valyuta gəlirləri 50% azalmışdı. Dolların və digər Qərb valyutalarının devalvasiyası da ölkənin valyuta ehtiyatlarının qiymətdən düşməsinə gətirib çıxardı (158; 219). Qərbi Sibirdən Qərbi Avropaya neft nəqli səmərəsiz oldu. Ölkə rəhbərliyinin iri neft-qaz sənaye kompleksləri tikmək hesabına vəziyyətdən çıxmaq cəhdləri də bir nəticə vermədi.

Maliyyə böhranının bir səbəbi də dövlət büdcəsinin əsas gəlir maddələrindən olan alkoqollu içkilər istehsalının və satışının ciddi surətdə azalması oldu. 1985-ci ildə bu maddə ilə dövlət büdcəsi 10 milyard manat, 1986-cı ildə 20 milyard, 1987-ci ildə isə 30 milyard manat itirdi. Antialkoqol kampaniyası 1988-ci ildə dayandırılsa da, alkoqollu içkilər istehsalını əvvəlki həcmdə yalnız 1991-ci ildə bərpa etmək mümkün oldu. Bəzi iqtisadçıların hesablamalarına görə büdcə bu səbəbdən 100 milyard manata yaxın valyutadan məhrum olmuşdu (158, 94–98). Sonralar M.Qorbaçov, N.Rıjkov və başqaları öz memuarlarında alkoqolizm əleyhinə kampaniyanın ağır nəticələr verdiyini etiraf etməli olmuşlar (106, 342; 188, 96). Bu kampaniyanın əsas təşəbbüskarları M.Qorbaçov, Y.Liqaçov və M.Solomentsev idi. Heydər Əliyev həm SSRİ-nin siyasi rəhbərliyində olduğu zaman, həm də sonralar M.Qorbaçovun bu avantürist qərarına qarşı qətiyyətlə çıxış etmiş, onun ağır nəticələrə gətirib çıxaracağını söyləmişdi (158, 37).

SSRİ-nin yeni partiya rəhbərliyi yaranmış mürəkkəb problemləri həll etmək iqtidarında deyildi. İdeoloji doqmatizm ona problemlərə adekvat reaksiya göstərmək imkanı vermədi. Çap dəzgahı işə düşdü. Dövriyyəyə külli miqdarda kağız pulların buraxılması, əmtəə defisitinin artmasına, inflyasiyanın güclənməsinə səbəb oldu. Ölkədə ən adi, gündəlik tələbat

malları defisitə çevrildi. Möhtəkirliyin, korrupsiyanın, gizli iqtisadiyyatın miqyası genişlənirdi. Əhalinin narazılığını aradan qaldırmaq üçün xaricdən yüksək qiymətlərə istehlak malları alınmağa başlandı. Bu isə öz növbəsində ölkənin kredit borclarının artmasına və qızıl valyuta ehtiyatlarının kəskin azalmasına gətirib çıxardı. Lakin bu addımlar da SSRİ-ni sosial-iqtisadi, siyasi böhrandan çıxarmağa kifayət etmədi.

Siyasi büronun tərkibində ziddiyyətlər artırdı. İrəli sürülmüş şüarlar nə qədər cazibəli olsa da, həyata keçirilmirdi. Köhnə təsəvvürlərdən, iş formaları və metodlarından azad, yeni təfəkkürlü kadrlara ehtiyac hər sahədə özünü göstərirdi. Mərkəzləşdirilmiş idarəetmə resursları tükənməkdə idi. Lakin dünyada ən mərkəzləşdirilmiş idarəetmə vertikalı – nomenklatura öz mövqeyini qoruyub saxlamışdı. 1987-ci ilin yanvarında Sov. İKP MK Plenumu «yenidənqurma və kadr siyasəti» məsələsini müzakirə etdi. Yeni siyasi xətt – «aşkarlıq və demokratiya» xətti qəbul olundu, partiya-dövlət vəzifələrinə təyinatda nomenklatura prinsipindən imtina etmək qərara alındı. Partiyada, sovetlərdə, təsərrüfat subyektlərində vəzifəli şəxslərin alternativ əsasda seçilməsi praktikası tətbiq olunmağa başladı. 1988-ci ilin yayında keçirilmiş XIX partiya konfransı ölkədə yeni ali dövlət hakimiyyəti orqanı olan – Xalq Deputatları Qurultayının yaradılmasına qərar verdi.

1988-ci ilin dekabrında SSRİ-nin konstitusiyasına dəyişikliklər və əlavələr haqqında qanun və «SSRİ xalq deputatlarının seçkiləri haqqında» qanun qəbul edildi. Bununla da, cəmiyyətin idarə edilməsində Sov. İKP-nin rəhbər rolu haqqında konstitusiya müddəası ləğv edildi.

Lakin partiya elitasının mühafizəkar qanadı dəyişikliklərə ciddi müqavimət göstərirdi. İqtisadi və siyasi sahədə yenidənqurma baş tutmurdu. Köhnə təsərrüfat prinsipləri hökm sürürdü. Alternativ seçkilər nomenklatura sisteminin sonuna çatdı, milli müxalifətin beşiyinə çevrildi və son nəticədə SSRİ-nin dağıdılmasının əsasını qoydu (180, 77).

Ölkədə iqtisadi vəziyyətin ciddi pisləşməsi, xalq kütlələrinin sosial vəziyyətinin ağırlaşması fonunda onların narazılığının artması – bütün bunlar M.S.Qorbaçov başda olmaqla Sov. İKP rəhbərliyini vəziyyətdən çıxış yolu axtarmağa, siyasi islahatları və ideoloji plüralizmi genişləndirməyə vadar edirdi.

1987-ci ilin əvvəllərindən başlayaraq «aşkarlıq», «demokratiya», «yeni təfəkkür» kimi şüarlar irəli sürülməyə başlandı. Siyasi həyatda bu

dönüş ziyalılar tərəfindən rəğbətlə qarşılansa da, ideologiya üzrə məsul olan partiya aparatında, hakimiyyət orqanlarında, güc strukturlarında başqa ovqat yaratmış oldu. Sovet İttifaqı kimi bir ölkədə məhz ideoloji və informasiya inhisarlığı Sov. İKP-nin vahid hakimiyyətinin əsas mənbəyi idi. Son nəticədə siyasi-ideoloji proseslər, demokratikləşmə prosesi Sov. İKP MK-nın nəzarətindən çıxdı və bu həm ölkədə, həm də partiyada siyasi böhranı dərinləşdirdi. Bu baxımdan 1986-cı ilin sonu – 1987-ci il mühüm mərhələ hesab edilməlidir. Bu mərhələdə ölkədə siyasi mühitin liberallaşdırılması istiqamətində mühüm addımlar atılmış, o cümlədən siyasi məhbuslar azad edilmiş, dissidentlərə qarşı təqiblərə son qoyulmuş, akademik D.Saxarov sürgündən azad edilmişdi. Mühüm addımlardan biri də Stalin repressiyalarının qurbanlarının reabilitasiyası oldu. Bu məqsədlə xüsusi komissiya yaradılmışdı. 1988-ci ilin yanvarında komissiya məlumat verirdi ki, 30–50-ci illərdə SSRİ-də 3778234 nəfər qanunsuz repressiyaya uğrayıb, onlardan 786098-i güllələnmişdir (122, 1989, №1). Lakin bu stalinizm cinayətlərinin qurbanlarının heç də tam siyahısı deyildi. Buraya sürgün olunmuş xalqlar, Qərbi Ukrayna, Qərbi Belorusiya, Pribaltikadan deportasiya edilənlər, hərbi əsirlər belə daxil edilməmişdi.

İnsanların gözü qabağında əvvəlki ideoloji stereotiplər və ehkamlar dağılırdı. İdeologiyada və mədəniyyətdə baş verən dəyişikliklər sonrakı dövrdə daha da genişlənirdi. Siyasi həyatın demokratikləşməsi insanların ictimai fəallığına böyük təsir göstərirdi. «Qeyri-formal» təşkilatların yaradılmasının əsas təşəbbüskarları yaradıcı ziyalılar və tələbələr idi. Ölkənin əksər ali məktəblərində tələbə-gənclər tərəfindən komsomolla birbaşa əlaqəli olmayan müstəqil ictimai təşkilatlar yaradılmasına başlanıldı. Bu təşkilatlar, adətən, 10–20 nəfərdən ibarət qruplar və dərnəklər formasında fəaliyyət göstərirdi. Oxşar proseslər Azərbaycanda da gedirdi. Müttəfiq respublikalarda millətçi şüarlarla çıxış edən kütləvi xalq cəbhələrinin – Ukraynada «Rux», Litvada «Soyudis», Latviya, Estoniya, Belorusiyada «Xalq Cəbhələri» yaradılması prosesi genişlənirdi. Aşkarlıq siyasəti siyasi təfəkkür və ideologiya ilə müqayisədə mədəni həyatda daha böyük dəyişikliklər yaratdı. Rejissor. T.Abuladzenin stalinizmin ifşasına həsr olunmuş «Покаяние» (Tövbə) filmi mədəni həyatda mühüm hadisəyə çevrildi. Sovet cəmiyyətinin eybəcərliklərinin ifşasına həsr edilmiş ədəbi-bədii, sənədli əsərlər qəzet-jurnal səhifələrində tez-tez görünməyə başladı. Bu əsərlərin bir çoxu 30–40, 50–60-cı illərdə yazılmış, lakin senzura ucbatından nəşr edilməmişdi.

Mədəniyyətdə müşahidə olunan əsas meyil stalinizm və onun qaydalarının tənqidi idi. Qəzet və jurnallar daha da kəskin, əvvəllər «qapalı» olmuş mövzulara müraciət edirdilər. Aşkarlığın oxucular tərəfindən dəstəklənməsi qəzet və jurnallara abunə yazılışının nəticələrində də özünü göstərirdi. «Известия» qəzetinə 2,5 milyon, «Аргументы и факты» qəzetinə isə 9 milyon abunə yazılmışdı (158, 173). Eyni zamanda mühafizəkar mövqelərdən çıxış edən mətbuat orqanlarının tirajı kəskin aşağı düşmüşdü.

SSRİ-də milli münasibətlər sovet cəmiyyətinin ən çox ziddiyyətlərin mövcud olduğu və bu ziddiyyətlərin aradan qaldırılması üçün normal mexanizmlərin olmadığı sahələrdən biri idi.

Dərinləşməkdə olan siyasi və iqtisadi böhran milli münasibətləri daha da mürəkkəbləşdirdi. Lakin onların həlli üçün SSRİ və Sov. İKP rəhbərliyində aydın təsəvvürlər yox idi. «Yenidənqurma» ideyasını irəli sürərkən, islahatların arxitektorları köklü ictimai-siyasi dəyişikliklər dövründə milli məsələnin necə böyük əhəmiyyət daşıdığını hələ tam təsəvvür etmirdilər. Onlara elə gəlirdi ki, sosial-iqtisadi problemlərdən fərqli olaraq, milli münasibətlər sahəsində az-çox sabitlik mövcuddur. 1987-ci ildə keçirilmiş Sov. İKP XXVII qurultayında qəbul edilmiş partiyanın yeni proqram redaksiyasında qeyd olunurdu ki, keçilmiş yolun nəticələri sübut edir: «keçmişdə» qalmış milli məsələ Sovet İttifaqında uğurla həll edilmişdir. Bizim ölkəmizdə milli münasibətlərə həm millətlərin və xalqların daha da çiçəklənməsi, həm də könüllülük, bərabərlik, qardaşlıq, əməkdaşlıq əsasında dönmədən baş verən yaxınlaşması xasdır».

M.Qorbaçovun siyasəti etnososial proseslərə impuls versə də, onların əsas səbəbləri daha əvvəldən mövcud olmuş ziddiyyətlərlə əlaqədar idi. Xalqlar dostluğundan dəm vurulsa da, millətlərarası düşmənçiliyi aradan qaldırmaq mümkün olmamışdı. Bu baxımdan sovet cəmiyyəti XX əsrin digər çoxmillətli cəmiyyətlərinə çox oxşayırdı.

Yenidənqurma dövründə milli münaqişələrin gərginləşməsi həm etnik, həm də sosial-siyasi amillərlə əlaqədar idi. Qonşu xalqlar arasında gərginliklər, «SSRİ-dən çıxmaq» cəhdləri yalnız iqtisadi problemlərlə bağlı deyildi. SSRİ elan edildiyi kimi xalqların sarsılmaz dostluğu ittifaqı deyil, əslində, müstəqil dövlətçiliyi əlindən alınmış, lakin azadlıq arzuları sönməmiş millətlərin zorla bir sistemdə birləşdirildiyi unitar dövlət idi. Yenidənqurma ölkə daxilində siyasi iqlimin dəyişməsinə gətirib çıxardı. İndi artıq iğtişaşları yatırmaq üçün repressiyadan istifadə etmək

mümkün deyildi. Siyasi həyatın demokratikləşməsi, azadlıqların genişlənməsi milli hərəkatların inkişafına ciddi təkan vermiş oldu. Düzdür, milli hərəkatların yeni yüksəlişinin tarixçilər hələ yenidənqurmadan bir neçə il əvvəl başladığını söyləyir, buna misal kimi, 1978-ci il Tbilisi və Orconikidze hadisələrini göstərirlər. Lakin o zaman milli həyəcanları qan tökülmədən aradan qaldırmaq mümkün olmuşdu. «Perestroyka»nın ilk illərində (1985–1987-ci illərdə) milli respublikalarda baş qaldıran suverenlik hərəkatına Mərkəz müəyyən qədər loyal münasibət göstərsə də, sonrakı dövrlərdə prosesin nəzarət altından çıxmasından narahat olaraq daha sərt və repressiv metodlara əl atmağı zəruri hesab etdi (1989-cu il Gürcüstan hadisələri, 1990-cı il Bakı faciəsi, 1991-cı il Vilnüs hadisələri, Orta Asiyada iğtişaşlar və s.).

Xronoloji cəhətdən yenidənqurma dövrünün ilk etnik münaqişəsi 1986-cı ilin yazında Yakutskda yakut tələbələrin çıxışları olmuşdu. Münaqişə ilə əlaqədar, hətta Sov. İKP MK katibliyinin «Yakutsk şəhəri gəncləri arasında bəzi neqativ təzahürlər haqqında» xüsusi qərarı da qəbul olunmuşdu (180, 107). Yakut tələbələrin çıxışının əsas səbəbləri muxtar respublikada ruslaşmanın yakut milli varlığına təhlükə yaratması, yakutların dilinin, mədəniyyətinin sıxışdırılması və s. milli problemlərin getdikcə kəskinləşməsi idi.

1986-cı ilin dekabrında Alma-Atada baş vermiş hadisələr isə bütün ölkə üçün şok oldu. 1986-cı il dekabrın 16-da Qazaxıstana 1964-cü ildən rəhbərlik edən Dinmühəmməd Kunayev Qazaxıstan KP MK I katibliyindən azad edilərək (rəsmi məlumatlara görə öz ərizəsi ilə – İ.M.), onun yerinə Ulyanov Vilayət Partiya Komitəsinin birinci katibi Q.V.Kolbin gətirildi. Respublika rəhbərliyində bu dəyişiklik ictimaiyyət arasında, xüsusən ziyalılar və tələbələr arasında böyük əks-səda yaratdı. Dekabrın 17-də səhərdən bir neçə min qazax gənci Alma-Atada MK-nın qabağındakı meydana toplaşaraq respublikaya kənardan qeyri-qazaxın təyin edilməsinə öz etirazlarını bildirdilər. Növbəti gün nümayişlər daha geniş şəkildə davam etdi. Etirazçıların radikallaşmasından qorxan hakimiyyət nümayişi qüvvə tətbiq etməklə dağıtmaq qərarına gəldi. Daxili qoşunların köməyi ilə şəhərdə sabitliyi təmin etmək mümkün oldu. Etirazlar yatırıldıqdan sonra onun iştirakçılarına qarşı heç bir tədbir görülmədi, baxmayaraq ki, 200-ə yaxın tələbə Qazaxıstan Dövlət Universitetindən qovuldu. 18 dekabrda Siyasi büroda Alma-Ata hadisələri geniş müzakirə

olundu. Lakin hadisələrin analizində yenidən ənənəvi yanaşma və ənənəvi qərarlar verildi. Hər şey kadr siyasətindəki səhvlərlə bağlandı. Daha yüksək səviyyədə milli siyasətdə buraxılmış səhvlərdən heç kim danışmadı (180, 108). Halbuki Qazaxıstan SSR-də milli münasibətlərlə bağlı – əhalinin regional yerləşməsində, miqrasiyada, xalqlararası münasibətlərdə, iqtisadi sərvətlərin regionlar və millətlər arasında paylanmasında, qazaxların dilinin, mədəniyyətinin inkişaf etdirilməsində çox ciddi problemlər var idi. Təsadüfi deyildir ki, müasir Qazaxıstanda 1986-cı ilin dekabr hadisələri milli müstəqillik uğrunda mübarizənin mühüm mərhələsi hesab edilir.

1987-ci ildə Krım tatarlarının problemi ön plana çıxdı. Krım tatarları Krım yarımadasının əsas sakinləri olub, 1944-cü ildə alman faşistləri ilə əməkdaşlıqda ittiham olunaraq Orta Asiyaya, əsasən, Özbəkistana sürgün olunmuşdular. Onlardan bəziləri isə Qazaxıstanda və Sibirdə yerləşdirilmişdi. 1950-ci illərdə digər sürgün olunmuş xalqlar (çeçenlər, inquşlar, qaraçaylar) öz vətənlərinə qaytarılsalar da, Krım tatarlarına bu qərar şamil edilməmişdi. Tatarların reabilitasiya olunmaq və öz vətənlərinə qayıtmaq uğrunda mübarizəsi 1960-cı illərin ortalarında başlamışdı. 1967-ci ildə, nəhayət, onların reabilitasiyası və hüquqların bərpası haqqında fərman qəbul edildi. Lakin fərmanda Krım tatarlarının «yaşadıqları yeni rayonlarda artıq kök saldıqları» iddia olunmuş, buna görə də onların Krıma qayıtmalarına icazə verilməmişdi. 1987-ci ildən onlar öz vətənlərinə qayıtmaq üçün piket və nümayişlər keçirməyə başlamış, hətta Moskvada MK-nın binası qarşısında etirazlar təşkil etmişdilər. Onların problemlərinin həlli məqsədilə A.A.Qromıko və E.Şvardnadzenin rəhbərliyi ilə komissiya yaradılmışdı. Nəhayət, Krım tatarlarına Krıma qayıtmağa icazə verilsə də, onların milli muxtariyyəti bərpa edilmədi (199).

1987–1988-ci illərdə yəhudilərin və almanların SSRİ-dən emiqrasiyası artmışdı. Moskvanın özündə antisemit xarakterli «Память» (Yaddaş) adlı aqressiv və səs-küylü qrup meydana gəlmişdi. Gürcüstanda respublika hakimiyyəti ilə muxtariyyətlər – Cənubi Osetiya və Abxaziya arasında münasibətlər gərginləşirdi. Moldaviya faktiki olaraq üç cəbhəyə – Rumıniyaya, türkdilli Qaqauziya və rusdilli Pridnestrovyeyə inteqrasiya arzusunda olanlara bölünmüşdü.

Tədqiqatçılar M.Qorbaçovun uzun müddət bitkin milli siyasətinin olmadığını və yalnız hadisələrə reaksiya verdiyini bildirirlər.

M.Qorbaçov milli məsələlərlə bağlı problemləri süni şəkildə kimlərinsə qızışdırdığı problem kimi qəbul edərək, təqribən 1990-cı ilə qədər iddia edirdi ki, respublikalarda olan münaqişələr sosial xarakter daşıyır, onlara əsassız olaraq milli rəng verilir.

Sovet rəhbərliyi etnomilli problemlərin vaxtında alternativ həllinə nail ola bilmədiyindən proseslər onun nəzarətindən çıxmağa başladı. Hətta ittifaq müqaviləsinin yenidən hazırlanaraq qəbul edilməsi təklifi belə, respublikaların müstəqilləşmə cəhdlərinin qarşısını ala bilmədi. SSRİ-dən ayrılaraq müstəqil dövlət yaratmaq ideyası əksər respublikaların əhalisi tərəfindən dəstəklənirdi.

Şübhəsiz, ağır sosial-iqtisadi şəraitdə etnik-milli münasibətlər mövcud siyasi böhranın daha da dərinləşməsinə gətirib çıxarmışdı. Getdikcə qanlı və həlli mümkün olmayan münaqişələr səviyyəsinə çatmış milli problemlər son nəticədə SSRİ-nin süqutu və tamamilə yeni geosiyasi vəziyyətin yaranması ilə nəticələndi.

### 2.2. Ermənistan SSR-in Azərbaycan SSR-ə qarşı ərazi iddialarının və Dağlıq Qarabağda etnik separatizmin güclənməsi

1985-ci ilin əvvəllərində SSRİ-də başlayan sosial-siyasi dəyişikliklər bütün milli respublikalarda olduğu kimi, Azərbaycanda da ictimai-siyasi həyatda canlanma yaratdı. Azərbaycan SSR-də uzun illərdən yığılıb qalmış problemlər yenidənqurmanın yaratdığı aşkarlığın və demokratikləşmənin genişlənməsi ilə əlaqədar özünü açıq şəkildə göstərməyə başladı. Lakin ölkəni bürüməkdə olan siyasi, iqtisadi böhran bu problemlərin aradan qaldırılmasına, birinci növbədə, respublikanın milli suveren hüquqlarının təmin edilməsinə ciddi şəkildə mane olurdu. Yeniləşmə prosesləri ağır gedirdi. Köhnə inzibati-amirlik sisteminin tərəfdarları ilə yenilik tərəfdarları arasında kəskin ziddiyyətlər Azərbaycanda da özünü göstərirdi. Bununla yanaşı, adamları siyasətə, idarəçiliyə yadlaşdıran şərait tədricən aradan qalxırdı. Əhalinin siyasiləşməsi prosesi ləng də olsa gedirdi.

1980-ci illərin II yarısında partiya və dövlət sənədlərində, rəsmi yığıncaqlarda Azərbaycanda mövcud olan ictimai-iqtisadi şərait ciddi tənqid olunur, onun səbəbləri açılıb göstərilirdi. Mövcud problemləri aradan qaldırmaq üçün konkret vəzifələr müəyyən olunsa da, əməli nəticələr əldə edilmədi. Əksinə, vəziyyət daha da pisləşdi. SSRİ-ni bürümüş sosial-iqtisadi böhran Azərbaycan iqtisadiyyatında, cəmiyyətin digər sahələrində

də özünü bariz göstərirdi. Bununla yanaşı, demokratiyanın genişlənməsi iqtisadi həyata yeni siyasi qüvvələrin gəlməsinə şərait yaratdı.

Erməni millətçiləri Moskvadakı himayədarlarına güvənib «yenidənqurma»nın yaratdığı imkanlardan bəhrələnərək Azərbaycan torpaqları hesabına – «Böyük Ermənistan» yaratmaq kimi sərsəm ideyalarını reallaşdırmaq üçün yenidən fəallaşdılar. Hələ 1984-cü ilin oktyabrında Azərbaycanın Qazax və Gədəbəy rayonlarından min hektarlarla ərazi Ermənistana verildi. Torpaqların Ermənistana verilməsi xalqda ciddi narazılıq yaratdı. Xalqın etiraz çıxışları hərbçilərin köməyi ilə yatırıldı. Erməni təxribatçıları Bakıda yenicə təmir olunmuş Opera və Balet Teatrının binasını yandırmaqla, şəhər nəqliyyatında partlayış törətməklə Azərbaycanda ictimai-siyasi sabitliyi pozmaq niyyətində olduqlarını nümayiş etdirdilər. Z.Balayan, S.Xanzadyan, S.Kaputikyan, P.Qazaryan kimi təxribatçı erməni «ziyalı»larının 1980-ci illərin ortalarında nəşr etdirdikləri əsərlər azərbaycanlılara, türklərə qarşı nifrət hisləri aşılayır, milli münasibətlərin qızışdırılmasında detanator rolunu oynayırdı.

1985-ci ildə yaranmış əlverişli şəraitdən istifadə edilərək daşnak partiyasının Afinada keçirilmiş XXIII qurultayında Böyük Ermənistan uğrunda «mübarizənin yeni mərhələsinə başlamaq» çağırışı irəli sürüldü (136; 3, 1990, 29 dekabr).

1986-cı ildən Azərbaycanın Dağlıq Qarabağ bölgəsində ermənilərin separatçı təbliğatı və hərəkətləri açıq və geniş xarakter almağa başladı.

«Qara bağ» kitabının müəllifi, britaniyalı Tomas de Vaal adıçəkilən kitabında Qarabağ separatizminin bəzi gizlinlərinə işıq salıb. O yazır ki, o zaman Ermənistanın dövlət plan komitəsində işləyən, keçmiş bakılı İqor Muradyan adlı erməni 80-ci illərdə Qarabağ təcavüzkar separatizminin mərkəzində durub: Sumqayıt hadisələrindən bir il əvvəl 1986-cı ilin fevralında Muradyan məktubun layihəsini Moskvaya aparıb partiyanın MK-nın doqquz erməni üzvünün və görkəmli alimin onu imzalamasına nail olmuşdu. Ən nüfuzlu imza Qorbaçovun iqtisadi məsələlər üzrə müşaviri akademik A.Aqanbekyana aid idi (207, 38).

«Muradyan xatırlayırdı ki, Aqanbekyan məktubu imzaladığı evə gələndə bilmirdi ki, hara gedir və onu nə üçün aparırlar. İmzasını qoymazdan əvvəl o orada 4 saat qaldı. Və bu 4 saat ərzində iki litrə yaxın araq içdi» (207, 38). Bu sitatda iki mühüm məqam var. Birincisi, Qarabağ separatizmi haqda məktubun imzalanması iki litr arağın təsiri altında olub və bu vəziyyətdə başlanan separatizm təbii ki, təcavüzkar olmalı idi.

İkinci məqam isə sual xarakterlidir. Görəsən, akademik Aqanbekyanı, SSRİ Kommunist partiyasının baş katibinin iqtisadi məsələlər üzrə müşavirini hansı böyük qüvvə aparırdı ki, o nə hara getdiyini, nə də nə üçün getdiyini bilmirdi? Kim onu belə bir qeyri-müəyyən görüşə getməyə vadar etmişdi? Bu suala dəqiq cavab yoxdur. Amma ehtimal etmək olar ki, bu qüvvə DTK-dan aşağı statusda ola bilməzdi.

Təcavüzkar Qarabağ separatizminin SSRİ-nin çox güclü deyil, ən güclü, qüdrətli qüvvələri tərəfindən hazırlandığını sübut edən daha bir sübut. Tomas de Vaal İqor Muradyanla söhbəti barədə yazır ki, o, Daşnak partiyasının SSRİ-dəki və hətta xaricdəki dərnəkləri ilə əlaqəyə girərək Qarabağa silah daşıyırmış: «İqor Muradyan paralel olaraq təxribatçılıq işi ilə də məşğul olurdu. O, Yerevandakı və xaricdəki gizli dərnəklərin vasitəsilə qadağan olunmuş millətçi-radikal «Daşnaksütyun» partiyasının üzvləri ilə əlaqəyə girdi. O, hətta silah əldə etməyə başladı. Muradyanın sözlərinə görə, 1986-cı ilin yayında Qarabağ erməniləri daşnakların köməyi ilə xaricdən yüngül atıcı silahlar almağa başladılar. Nəticədə, silah gətirilməsi müntəzəm olaraq həyata keçirildi. Həm də «nə üçünsə Çexiya istehsalı olan silahlar çoxluq təşkil edirdi». Bu silah, əsasən, Dağlıq Qarabağa gedirdi. «Dağlıq Qarabağda bütün təşkilatlar silahlanmışdı. Bütün yerli komsomolçuların şəxsi silahı vardı» (207, 39). Bunları separatçıların əlaqələndiricisi İqor Muradyan Tomas de Vaala danışıb. Hər şeydən əvvəl, SSRİ-ni və bu ölkədə həyatın nə qədər nəzarətdə olduğunu bilən hər kəsə məlumdur ki, 1986-cı ildə Çexiya istehsalı olan silahı Dağlıq Qarabağa daşıyıb orada təşkilatları silahlandırmaq yalnız və yalnız ali rəhbərliyin, xüsusilə də DTK-nın nəzarəti altında həyata keçirilə bilərdi. Silahın məhz sosialist ölkəsi olan Çexoslovakiya istehsalı olması da bu arqumenti xeyli gücləndirir. Eyni zamanda İqor Muradyanın komsomolçuların silahlandırılması haqda məlumatı da DTK və ali rəhbərlik arqumentini möhkəmləndirir. Ona görə ki, DTK-nın güclü nəzarəti altında olan, partiya ilə sıx bağlı komsomol təşkilatı üzvlərinin silahlandırılması DTK-dan və ali siyasi rəhbərlikdən gizli qala bilməzdi. Ermənilərin silahlandırılaraq azərbaycanlıların üzərinə təcavüzə şirnikləndirilməsinin SSRİ-nin yüksək hakimiyyət orqanlarından qaynaqlandığını sübut edən daha bir fakt. Xüsusi təyinatlı «Vityaz» dəstəsinin keçmiş komandiri, Rusiya qəhrəmanı, polkovnik Sergey Lısyuk deyir: «DQMV-də əhalidən silahların yığılması ən mühüm məsələ idi. Bizə silahların yığılması haqda əmr gəlirdi və biz silahların yığılması üçün hə-

rəkətə keçən kimi ikinci əmr gəlirdi ki, silahların yığılması əməliyyatını dayandırın. Bir qədər sonra eyni proses yenidən təkrar olunurdu. Mənim xatirimdədir ki, 5–7 dəfə belə vəziyyət yarandı və belə əmrlər hökumətin ən yüksək səviyyələrindən gəlirdi» (14).

SSRİ Baş prokurorunun müavini olmuş Viktor İlyuxinin də başına Sergey Lısyukun əhvalatı gəlib. Ondan radikal-millətçi «Qarabağ» təşkilatı ilə bağlı cinayət işlərini Ermənistan müstəntiqlərinə təhvil verilməsini tələb ediblər. «Biz Ermənistanda «Qarabağ» təşkilatının bütün tərkibini həbs etmişdik. …Materiallar artıq məhkəməyə göndərilmək üçün hazır idi. Birdən Qarabağ komitəsi ilə bağlı bütün materialların yerli müstəntiqlərə, yəni ermənilərə təhvil verilməsi barədə komanda gəldi. …Baş prokuror Aleksandr Suxarev etiraf etdi ki, əmri Mixail Qorbaçov verib» (14; 15).

Tomas de Vaalın Muradyandan gətirdiyi sitatda daha bir maraqlı məqam var. Muradyan əlaqələndirici olsa da, silahların Çexiya istehsalı olmasına təəccübləndiyini ifadə edir. Bu onu göstərir ki, hətta erməni koordinatorlar da silahın kim tərəfindən alındığı və kim tərəfindən daşındığı haqda məlumatsız idilər. Muradyan xaricdəki ermənilərlə Ermənistandakı və Moskvadakı kommunist erməniləri birləşdirmişdi (207, 38–39).

Akademik Ramiz Mehdiyev bununla bağlı göstərir: «1988-ci ilin fevralında Sumqayıtda baş vermiş hadisələrlə əlaqədar faktların öyrənilməsi göstərir ki, bu dəhşətli plan «Daşnaksütyun» partiyası tərəfindən hazırlanmışdı. Bu plan Stepanakertdə (Xankəndi) mitinqlərə başlamaq və Dağlıq Qarabağı Azərbaycandan ayırmaq üçün bir bəhanə kimi düşünülmüşdü. Separatçı hərəkata başçılıq etmək «Qarabağ» komitəsinə və «Krunk»a həvalə olunmuşdu. Sumqayıt hadisələrinin təşkilatçıları öz ənənələrinə sadiq qalaraq, hətta bu planın həyata keçirilməsi barədə göstərişlərə tabe olmayan, həmin təşkilatların emissarlarına «xərac» ödəməkdən imtina edən soydaşlarına da rəhm etmirdilər. Elə görüntü yaratmaq tələb olunurdu ki, guya, azərbaycanlılar ermənilərə qarşı terror təşkil etmişdilər (14).

Sumqayıt hadisələrinin təşkilatçıları arasında digərləri ilə yanaşı, sonralarda Ermənistanın prezidenti olmuş Serj Sarkisyan və Robert Koçaryan da var idi. Onlar ilk vaxtlarda gizli fəaliyyət göstərirdilər. Erməni millətçi separatizminin ideoloqlarından biri Zori Balayana gəldikdə isə o, azərbaycanlıların qanına susamışdı. Bütövlükdə qeyd etmək lazımdır ki, bu sərsəm ideya praktik olaraq Ermənistan SSR-in bütün ali rəhbərliyinə hakim kəsilmişdi. Mən bunu Ermənistan KP MK-nın birinci katibi Karen



**VİKTOR ÇEBRİKOV**

**Sumqayıt hadisələri ərəfəsində SSRİ DTK-nın sədri olub**

Dəmirçyan ilə Yerevanda görüşərkən yəqin etdim. 1988-ci il aprelin əvvəlində mənim başçılıq etdiyim, nazir Zakir Bağırov, akademik Bəkir Nəbiyev, AzTV-nin sədri Elşad Quliyev və başqalarının daxil olduğu Azərbaycan nümayəndə heyəti Ermənistanda azərbaycanlıların sıxışdırılması səbəblərini aydınlaşdırmaq məqsədilə respublika rəhbərliyinin qərarı ilə İrəvana göndərilmişdi. Açıq və sərt söhbət oldu. Biz ağlabatan cavab ala bilmədik. Həmin görüşdən özümüz üçün çıxardığımız yeganə nəticə bu oldu ki, Ermənistan rəhbərliyi Dağlıq Qarabağda separatçı qüvvələrin əməllərini təşviq edir, azərbaycanlıların sıxışdırılması və Ermənistandan qovulması isə çoxdan düşünülmüş planların tərkib hissəsidir» (14).

SSRİ DTK sədrinin birinci müavini olmuş Filip Bobkov da öz xatirələrində «Daşnaksütyun»la, xaricdə olan başqa ermənilərlə SSRİ-dəki ermənilərin birləşdiyini yazır. Məsələ ondadır ki, xaricdəki ermənilərin də əksəriyyəti elə DTK tərəfindən maliyyələşirdi. Əlimizdə olan arxiv sənədləri bunu birmənalı olaraq sübut edir. Bu sənədlərdə Ermənistan SSR-in rəhbərliyi, konkret olaraq K.Dəmirçyan Sov.İKP-nin və SSRİ DTK-nın rəhbərliyinə yazır ki, xaricdəki erməni qəzetlərini maliyyələşdirmək lazımdır. Onun Mərkəzi Komitəyə ünvanladığı 25 iyun 1986-cı il tarixli, tam məxfi qrifli məktubda Livandakı «Kanç», Fransadakı «Aşxar», ABŞ-dakı «Lraber», Argentinada çıxan «Sevan» erməni qəzetlərinə, hamısına birlikdə ildə 60000 ABŞ dolları yardım etmək haqda müraciət olunurdu.



**FİLİP BOBKOV**

**1985–1991-ci illərdə SSRİ DTK sədrinin birinci müavini olub**

7 avqust 1986-cı il tarixli DTK-nın sədri V.Çebrikovun və MK katibi, Siyasi büro üzvü A.Yakovlevin imzaladıqları sənəddə isə Ermənistan Kommunist Partiyasının təklifi dəstəklənir. Nəhayət, Sovet İttifaqı Kommunist Partiyasının Mərkəzi Komitəsinin katibliyinin avqustun 14-də imzalanmış qərarı əsasında xaricdə fəaliyyət göstərən «tərəqqipərvər erməni təşkilat və qəzetlərinə» ildə 60000 dollar həcmində yardım edilməsi haqda SSRİ Maliyyə Nazirliyinə göstəriş verilir.

Hər şey aydındır. F.Bobkov «КГБ и власть» kitabında yazır ki, K.Dəmirçyan radikal-millətçi «Daşnaksütyun» partiyasının Ermənistandakı nümayəndələrini və terrorçu ASALA təşkilatının da Ermənistandakı strukturlarını və əlaqələrini ört-basdır etməyə çalışırdı (89, 292). Aydındır ki, erməni terrorçu təşkilatı ASALA da o zaman SSRİ xüsusi xidmət orqanları tərəfindən Türkiyəyə qarşı yönəldilən terror təşkilatıdır. Xaricdəki erməni terrorçularının hədəfləri SSRİ-nin əsas geosiyasi və ideoloji düşmənləri sayılan Türkiyə, İsrail və Almaniya idi. Elə buna görədir ki, erməni terror qrupları türk diplomatlarını qətlə yetirir, yəhudi idmançıları Almaniyanın Münhen aeroportunda terrora məruz qoyur, SSRİ-nin dəstəklədiyi Fələstin Azadlıq Hərəkatı, şəxsən Yasir Ərəfatla terror sahəsində əməkdaşlıq edirdilər və bütün bunlar xaricdəki erməni qəzetlərinin və qeyri-leqal silahlı təşkilatlarının da SSRİ-nin xüsusi xidmətləri ilə əlaqəli olduğunu sübut edir. Bütün bunlar o fikri təsdiqləyir ki, Ermənistan,



**VLADİMİR KALİNİÇENKO**

**1979–1992-ci illərdə SSRİ Baş prokurorunun yanında xüsusi mühüm işlər üzrə müstəntiq vəzifəsində işləyib. Bir müddət Sumqayıt hadisələrinin istintaqında SSRİ prokurorluğunun işinə rəhbərlik edib**

Dağlıq Qarabağın erməni icması və SSRİ rəhbərliyi, DTK məhz silahlı münaqişə yolu ilə azərbaycanlıları Ermənistandan qovmaq, Qarabağı Azərbaycandan ayırmaq, münaqişələr və toqquşma ssenarilərini həyata keçirmək planı qurmuşdular. Sumqayıt talanları isə həmin planın tərkib hissəsi idi. Amma heç də bütün Sovet və DTK rəhbərliyi bu məsələlər haqda xəbərdar deyildilər. V.Kaliniçenko göstərir ki, bütün baş verənlər dəqiq dirijorluqla idarə olunurdu. Biz hamımız işin nə yerdə olduğundan xəbərdar idik. Bu, kortəbii baş vermiş etiraz aksiyası deyildi. Bütün baş verənlərin qarşısını vaxtında almağa imkan var idi (14; 15).

Ermənilərin antiazərbaycan fəaliyyətinin qızışmasına Moskvada Qorbaçovun əhatəsində olan erməni lobbisi də mühüm təsir göstərirdi. Kütləvi informasiya vasitələrində M.Qorbaçovun arvadı R.Qorbaçovanın Parisdə səfərdə olarkən erməni diasporunun nümayəndələri ilə görüşməsi haqqında məlumatlar öz əksini tapmışdı. Həmin görüşlərdə R.Qorbaçovanın ermənilərdən bəxşiş alması və əvəzində onlara hansı vədləri verməsi faktı da diqqətdən yayınmamışdı. Lakin həmin şəraitdə vədləri yerinə yetirmək mümkün olmadığından az sonra Yerevanda bəxşişlərin geri qaytarılması tələbi ilə mitinqlər keçirilməyə başlandı. Ermənistandan Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi tələbi ilə dünya dövlətlərinə və beynəlxalq təşkilatlara 300000 erməninin imzası ilə müraciətnamələr göndərildi (12, 236). 1987-ci ilin yazında Afinada «Erməni məsələsi




**SSRİ DTK sədrinin birinci müavini olmuş Filip Bobkovun «DTK və hakimiyyət» kitabının üz qabığı**

və türk eksponsionizmi» mövzusunda konfrans keçirildi. Erməni genosidi faktı 1987-ci il iyulun 18-də Avropa parlamenti tərəfindən tanındı. Erməni genosidi qurbanlarına xatirə günü təsis edildi (182, 14). Bütün bunlar onu göstərir ki, Qərbdə də erməni millətçiliyini qızışdıranlar var idi. Ona görə ki, SSRİ-də separatizmin qızışması və SSRİ-nin bir dövlət olaraq zəifləməsi Qərb dövlətlərinin marağında idi.

Qəbul edilmiş sənəd birbaşa SSRİ-də yaşayan erməniləri nəzərdə tutmasa da, Avropa Parlamentinin kommunist və sosialist fraksiyalarının birgə təşəbbüsü idi və yeni siyasi təfəkkür erasının başlandığını elan etmiş M.Qorbaçova bir növ mesaj idi. SSRİ-də bu mesaj dərhal qəbul edildi və «Qarabağ» avantürasına start verildi.

Erməni hərəkatının qızışmasında Moskvada kommunist rəhbərliyində mövqe tutmuş müəyyən liberal dairələr də katalizator rolunu oynadılar. DQMV-nin Azərbaycandan qoparılıb Ermənistana verilməsi haqqında tələblərlə bağlı imza toplanması faktorundan «demokratik idarəetmə» forması kimi istifadə edilməyə başlandı. Təsadüfi deyildir ki, erməni mətbuatında gedən materiallarda göstərilirdi ki, bu dairələrin ən nüfuzlu nümayəndələrindən biri, Sov. İKP-nin demokratik qanadının lideri hesab olunan Aleksandr Yakovlev və onun ətrafı Qarabağ prosesinin stimullaşdırılmasında böyük rol oynamışlar (166). Artıq 1987-ci ilin avqustunda Qarabağ ermənilərinin nümayəndə heyəti Moskvaya gedərək

Qarabağın Ermənistana «yenidən birləşməsi» tələblərini özündə əks etdirən müraciəti mərkəzə təqdim etdi. Müraciət 75000-dən çox imzadan, 10 cilddən ibarət idi. Suren Ayvazyanın müraciətə əlavə edilmiş məktubunda Qorbaçovdan təkcə Dağlıq Qarabağın deyil, Naxçıvan MR-in Ermənistana verilməsi tələb olunurdu (207, 41, 391).

Nüfuzlu sovet erməniləri xaricdə də Qarabağ məsələsini qaldırmağa, erməni diasporunu bu məsələyə qatmağa çalışırdı. Z.Balayan, A.Mikoyanın oğlu Sergey Mikoyan Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi ideyasını ABŞ-da, digər ölkələrdə erməni diasporuna məxsus qəzetlərdə təbliğ edirdilər. Məhz erməni diasporunun ABŞ hakimiyyət dairələrinə güclü təsiri nəticəsində sonralar bu ölkə Dağlıq Qarabağ məsələsində açıq-aşkar antiazərbaycan mövqe tutdu.

Beləliklə, «Qarabağ» hərəkatı artıq çoxdan sınaqdan çıxarılmış sxem üzrə inkişaf edirdi: əvvəlcə ölkə hüdudlarından kənarda problemin qaldırılması – onun beynəlxalq strukturlarda müzakirəsi – daha sonra yerlərdə «xalqın iradəsinin ifadə olunmasının» təmin edilməsi. Bircə şey qalırdı: xalqın arzu və istəyinin SSRİ-nin yuxarı hakimiyyət eşelonlarında dəstək qazanmasını nümayiş etdirmək.

Elə həmin ildə Parisdə keçirilmiş erməni milli konqresində SSRİ-dəki, demokratik dəyişikliklərdən «DQMV-nin Ermənistana yenidən birləşməsi ilə bağlı erməni xalqının qanuni tələblərini həyata keçirmək» üçün istifadə etmək haqqında qərar qəbul edildi. 1987-ci ilin oktyabrında H.Əliyevin Sov. İKP Siyasi bürosundan istefasından üç gün sonra Yerevanın Puşkin meydanında rəsmi Ermənistanın dəstəyi ilə yaradılmış və əsas məqsədi Azərbaycanın Dağlıq Qarabağ bölgəsini ilhaq etmək olan bədnam «Qarabağ» komitəsinin ilk açıq mitinqi keçirildi (182, 24).

Lakin nə qədər ki, Heydər Əliyev SSRİ rəhbərliyində təmsil olunurdu, ermənilər onun nüfuzundan çəkinərək Azərbaycana qarşı açıq hərəkətə başlamırdılar. Buna görə də erməni lobbisi M.Qorbaçova təzyiq göstərərək 1987-ci ilin oktyabrında H.Əliyevi siyasi rəhbərlikdən uzaqlaşdırmağa nail oldu.

Ermənilər «Qarabağ» avantürasının həyata keçirilməsində əsas maneə kimi Heydər Əliyevi görür və onun siyasi rəhbərlikdən istefasını özlərinin əsas qələbələrindən biri hesab edirdilər.

İngilis tədqiqatçısı Tomas de Vaal da bunu sonralar təsdiq etmişdir. Onun yazdığına görə, Qarabağ fəalları Ermənistan Kommunist Partiya-

sının rəhbəri Karen Dəmirçyanın susqun dəstəyini qazana bilmişdilər və onların nəzərincə, Qarabağın ayrılmasının əsas əleyhdarı və bütün prosesin qarşısını ala biləcək Azərbaycan patriarxı Heydər Əliyevi nüfuzdan salmaq üçün kampaniyaya başladılar (207, 38). Heydər Əliyevi işdən uzaqlaşdırdıqdan sonra Dəmirçyan SSRİ-nin ali partiya rəhbərliyindəki opponentinin siyasi qurbanına çox sevindiyini bildirmişdi: «Biz ən əsas işi bacardıq – (Qarabağ) hərəkatına qədər Əliyevi yıxdıq. Bu çox mühüm idi» (207, 38–39). Sonralar Heydər Əliyev öz istefasının doğurduğu nəticələri təhlil edərək göstərirdi: «Azərbaycan üçün bəla ondan başladı ki, 1987-ci ildə ermənilər bizim azərbaycanlıların bəziləri ilə yığışdılar, mənim Kremldən istefa verməyimə nail oldular. Bundan iki ay sonra Dağlıq Qarabağda üsyan, münaqişə başlandı. O vaxtdan ermənilərin bir məqsədləri var idi ki, Heydər Əliyevi Kremldən uzaqlaşdırsınlar. Çünki bilirdilər ki, mən Moskvada oturmuşam və belə məsələlərin qaldırılmasına yol verməyəcəyəm. Məni Kremldən uzaqlaşdırdılar. Amma təkcə onlar yox, bizim bədxah azərbaycanlılar da bu işə kömək etdilər. Onlar birləşərək məni Kremldən uzaqlaşdırdılar. Bundan sonra Azərbaycan nə günə düşdü» (4, 571–572).

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev də bu prosesləri təhlil edərək göstərirdi: «1987-ci ildə Heydər Əliyev SSRİ-nin siyasi rəhbərliyindən uzaqlaşdırıldıqdan sonra Azərbaycanın problemləri başlandı. Ondan iki həftə sonra erməni lobbisi tərəfindən başlanılmış kampaniya nəticəsində Dağlıq Qarabağı Azərbaycandan ayırıb Ermənistana birləşdirmək ideyası ortaya qoyuldu. Bu ideya ətrafında Ermənistan və onun havadarları Azərbaycana qarşı işğalçılıq siyasətinə başlamışdılar. Heydər Əliyev amili, onun gücü imkan vermirdi ki, belə iddialar ortaya qoyulsun. Onun istefasından iki həftə sonra bu planlar reallaşmağa başlamışdı» (3, 2012, 11 may).

Xalqın gözündən salmaq, adını ləkələmək üçün mətbuatda Heydər Əliyevə qarşı böhtan və şəratma kampaniyasına start verildi.

M.Qorbaçovun yaxın silahdaşlarından biri olan Sov.İKP MK katibi Y.Liqaçov Bakıya gələrək Heydər Əliyevin Azərbaycana rəhbərliyi ərzində onun fəaliyyətinin yoxlanılması (əslində, əleyhinə kompromat toplanması – İ.M.) üçün komissiya yaradılması ilə bağlı respublika rəhbərliyi qarşısında məsələ qoydu. Azərbaycanda ikinci «özbək işi» – guya, iqtisadi cinayətkarlıq üzrə qərəzli istintaq işləri başlandı.

M.Qorbaçovun müşavirlərindən biri akademik Abel Aqanbekyan 1987-ci ilin noyabrında Parisdə erməni diasporunun nümayəndələri ilə görüşür və «Humanite» qəzetinə müsahibə verir. Müsahibəsində o qeyd edir ki, respublikanın (Ermənistan SSR-in – İ.M.) şimal-şərqində yerləşən (?!) Qarabağın Ermənistana verilməsinə çox şad olardım. Bir iqtisadçı kimi, hesab edirəm ki, o Azərbaycandan daha çox Ermənistanla bağlıdır. Bu ideyanın reallaşması üçün Sovet rəhbərliyinə təklif verdiyini qeyd edən akademik ümid etdiyini bildirmişdi ki, «yenidənqurma və demokratiya şəraitində bu problem öz həllini tapacaqdır» («Humanite» qəzeti, 1987, 18 noyabr: 182, 20; 148, 11). Xüsusi vurğulamağa ehtiyac var ki, Aqanbekyanın bu çıxışı Avropa Parlamentinin erməni məsələsinə dair qətnaməsindən 4 ay sonra səsləndi.

Sovet siyasi sisteminə bələd olanlar yaxşı bilirdilər ki, baş katib M.Qorbaçovun yaxın silahdaşlarının bu cür təkliflə xarici mətbuatda açıq şəkildə çıxış etməsi («Humanite» qəzeti Frana Kommunist Partiyasının orqanı idi – İ.M.) Sovet rəhbərliyinin icazəsi olmadan baş tuta bilməzdi. Bu isə istər-istəməz erməni separatçılarının arxasında Moskvanın bəzi hakim dairələrinin durduğunu təsdiq edirdi.

Yuxarı eşelonlarda Aqanbekyanın sözlərinə etiraz bildirilməməsi «erməni məsələsi»nin ölkənin lideri tərəfindən dəstəklənməsi haqqında fikirlərin həqiqətdən uzaq olmadığını göstərirdi. Buna görə də Yerevan Dövlət Universiteti nəzdində etnopsixologiya mərkəzinin rəhbəri Svetlana Luryetin fikirləri ilə razılaşmamaq mümkün deyildir: «Tam əminliklə demək olar ki, ermənilər Qarabağ uğrunda mübarizəyə başlayarkən əmin idilər ki, onlar Moskvanın icazəsi və dəstəyi ilə hərəkət edirlər» (193).

Nəticədə yuxarıdan başlayan hərəkat yüksələn xətlə inkişaf etməyə başladı və 1988-ci ilin əvvəlində Qarabağ problemi ümumittifaq səviyyəsinə qalxdı. «Azərbaycanlıların erməniləri sıxışdırması», «DQMV-də qədim xalqın mədəniyyətinin fəlakətli vəziyyəti» haqqında uydurmaların Ermənistandan və Stepanakertdən müvafiq ittifaq qurumlarına çatdırılması mərhələsi başladı.

Elə həmin ayda M.Qorbaçovun arvadı R.Qorbaçova ikinci dəfə erməni diasporunun və daşnak partiyasının nümayəndələri ilə bu dəfə ABŞ-da görüşdü. Daşnaklar ona qiymətli hədiyyələr – üstündə «Arsax» yazılmış 62 karatlıq brilyant boyunbağı, sırğa və s. bağışladılar. Məlumdur ki, M.Qorbaçov əksər qərarlarını öz arvadının diktəsi və təsiri ilə

qəbul edirdi. Bununla da, onsuz da SSRİ rəhbərinə güclü təsiri olan erməni lobbisi onun arvadının simasında yeni təsir vasitəsi qazanmış oldu.

Əslində, Dağlıq Qarabağ separatizminin ideoloqları və ilhamçıları təkcə Yerevanda deyil, həm də M.Qorbaçovun yaxın ətrafında oturmuşdular (Şahnəzərov, Aqanbekyan, Osipyan, Sitaryan və başqaları). Elə ermənilərin «Milli müqəddəratının müstəqil təyin edilməsi birliyi», «Siyasi məhbusların müdafiəsi üzrə erməni komitəsi» kimi təşkilatları Moskvada yaradaraq, açıq fəaliyyət göstərmələri də bunun sübutu idi (184, 1988, 4 aprel).

Eyni vaxtda erməni müəlliflərinin ittifaq və Ermənistan mətbuatında bir-birinin ardınca azərbaycanlıları aşağılayan, onların tarixini, mənəvi-mədəni dəyərlərini saxtalaşdıran məqalələri dərc olunmağa başladı. 1987-ci ilin payızında antiazərbaycan təbliğatı daha geniş vüsət aldı. «Дружба народов» jurnalında şairə Silva Kaputikyanın «şöhrətli Andronikin» yolunu təkrar etmək və Azərbaycan kəndlərindən silahla, kəfənlə («С берданкой и саваном». – İ.M.) keçmək çağırışı səsləndirən şeirləri çap edildi (148, 12).

Əlbəttə, Azərbaycan ictimaiyyətində ermənilərin əsassız iddiaları, tarixi saxtalaşdırmaq cəhdləri ciddi narahatlıq və narazılıq doğurmaya bilməzdi. Lakin Azərbaycanın ərazi bütövlüyünə qarşı açıq hərəkətlərin qarşısını vaxtında almaq, milli maraqları müdafiə etmək üçün xalqın həqiqi birliyinə nail olmaq əvəzinə, respublika rəhbərliyi passivlik nümayiş etdirir, gözləmə mövqeyi tutur, hadisələrin arxasınca gedirdi.

«Qarabağ» komitəsinin Azərbaycan ərazisində – Dağlıq Qarabağda açıq fəaliyyət göstərməsi, burada «Krunk» adlı separatçı təşkilatın yaradılması və onun pozucu fəaliyyəti, DQMV-nin Ermənistana birləşdirilməsi uğrunda «Miatsum hərəkatı»nın genişlənməsi Bakıda heç bir əks-sədа doğurmadı, onlara qarşı tədbirlər görülmədi. Bütün bunlar erməniləri daha da şirnikləndirir, onların hərəkətləri aşkar silahlı mübarizə xarakteri daşımağa başlayırdı.

1988-ci ilin yanvarında Dağlıq Qarabağdan bir qrup erməni Moskvaya gedərək Sov.İKP MK və SSRİ Ali Sovetinə muxtar vilayətin Ermənistana birləşdirilməsi haqqında yenidən müraciət etdi. Sənədlərinin qəbul edilməsi və hökmən baxılacağı haqda onlara söz verilməsi ermənilərdə ümid yaratdı ki, onların tələbləri mütləq nəzərə alınacaqdır (99, 193–195). Belə şəraitdə ermənilər uzun illər ərzində həyata keçirdikləri məqsədi tam reallaşdırmağa, Ermənistan SSR ərazisində yaşayan son azərbaycanlıları da öz doğma torpaqlarından deportasiya etməyə nail ol-

dular. Bu məqsədlə bütün tədbirlər görülmüş, xüsusi silahlı dəstələr yaradılmışdı. Ermənistanın Qafan və Mehri rayonlarından erməni vəhşiliyindən qaçıb yaxa qurtarmış ilk qaçqınlar 1988-ci il yanvarın 25-də Azərbaycana pənah gətirdilər (208, 33). İlk azərbaycanlı qaçqınların məhz 25 yanvarda Qafan rayonundan gəlmələrini bir neçə mənbə təsdiq edir. Qorbaçov Fondu da Ermənistanın Qafan və Mehri rayonlarından yanvarda bir neçə yüz azərbaycanlı qaçqın gəldiyini göstərir (214). Qaçqınların yeni dəstələri fevralın 18–23-də təqiblərdən qaçaraq Azərbaycana gəldi.

1988-ci il fevralın 12-də Yerevanda «Qarabağ» komitəsi böyük mitinq keçirdi. Mitinqdə «Ermənistanı türklərdən təmizləməli», Ermənistanda ermənilər yaşamalıdır və başqa millətçi şüarlar səslənirdi (12, 737). Moskvanın susması və ermənilərə Ermənistanda, Dağlıq Qarabağda azad şəkildə mitinq və nümayişlər keçirməyə imkan verməsi mərkəzin ermənilərin tələblərini müdafiə etməsi kimi qiymətləndirildi və erməniləri inandırdı ki, Qarabağ kampaniyası qısa zamanda onların qələbəsi ilə başa çatacaqdır. Tezliklə mitinqlər dalğası Dağlıq Qarabağın mərkəzi Stepanakert şəhərini bürüdü. Əvvəlcə bir neçə yüz nəfərdən ibarət bu aksiyaların iştirakçılarının sayı tezliklə 10000-ə çatdı. Yerevanda və Stepanakertdə mitinq və şüarlar eyni idi: «Dağlıq Qarabağ Ermənistana birləşdirilməlidir». Nümayişlərin açıq antikonstitusiya xarakteri daşımasına baxmayaraq, bu aksiyaların dayandırılması üçün Moskva və Bakı rəhbərliyi heç bir addım atmadı. Tezliklə mitinqlər kütləvi tətillərə keçdi. Yerevanın və DQMV-nin bütün müəssisələrində işlər dayandırıldı.

Ermənistanın özündə azərbaycanlı əhaliyə qarşı əsl soyqırımı siyasəti həyata keçirilirdi. Silahlı quldurlar gecələr azərbaycanlıların evlərinə soxulur, qadına, qocaya, uşağa aman vermirdilər. Fevralın 21-də ermənilər Yerevandakı müsəlman məscidini yandırdılar, Aşıq Ələsgərin, Səməd Vurğunun abidələri təhqir edildi. Minlərlə azərbaycanlı real ölüm təhlükəsindən qurtulmaq üçün illər boyu topladığı mal-dövlətini ermənilərə qoyaraq böyük çətinliklərlə Azərbaycana gəlməyə məcbur oldu. Yüzlərlə insan işgəncələrə, aclığa, soyuğa tab gətirməyərək yolda həlak oldu. Onların acı taleyi haqqında nə dünya, nə SSRİ, nə də ki, Azərbaycan mətbuatı bircə kəlmə yazdı. Yalnız sonralar «Советская Россия» qarlı dağlar aşaraq Naxçıvana pənah gətirmiş ayaqyalın, alt köynəyində olan uşaqların şəklini vermiş və aşağıda qeyri-müəyyən şəkildə yazmışdı: «Gəlin axtarmayaq bu uşaqlar kimindir, «bunlar bizim uşaqlarımızdır». Lakin bu uşaq-

ların hamısı azərbaycanlı idi (148, 14). Fevralın 18 və 23-də Azərbaycana yeni didərginlər dəstəsinin gəlişi ilə onların sayı 4000 nəfərə çatdı. Rusiya tədqiqatçısı Konstantin Voyevodski qaçqınlar məsələsi ilə bağlı bildirir ki, Moskvadan daxil olmuş siqnallara görə fevralın 20-ə təyin olunmuş azərbaycanlıların soyqırımının qarşısını almaq üçün Qafan rayonuna hərbi hissə göndərilmişdi. Azərbaycanlıları kütləvi şəkildə qovmaqla ermənilər bir tərəfdən onların arasında vahimə salıb və Ermənistanı hamılıqla tərk etməsinə, digər tərəfdən isə Azərbaycanda ictimai-siyasi vəziyyətin gərginləşdirilməsinə can atırdılar. Məqsəd Azərbaycanda gələcəkdə milli zəmində törədiləcək təxribatları, Dağlıq Qarabağ münaqişəsini azərbaycanlıların adına yazmaq üçün süni zəmin hazırlamaq idi (60, 45).

Mitinqlərin ardınca «öz iradəsini sərbəst ifadə etmək» növbəsi yerlərdə partiya-sovet orqanlarına verildi. 1988-ci il fevral ayının 15–18-də DQMV-nin Şuşadan başqa bütün rayon sovetləri DQMV-nin Azərbaycan SSR-in tərkibindən çıxarılaraq Ermənistan SSR-ə verilməsini nəzərdə tutan qərar qəbul etdilər. Mitinqlərin tələbi ilə vilayət sovetinin fevralın 20-də keçirilmiş sessiyasında müvafiq qərar qəbul edildi. Qərarda, həmçinin SSRİ-nin rəhbər orqanlarına müraciət edilərək qaldırılmış məsələni müstəqil həll etmək təklifi öz əksini tapmışdı (12, 238). Bu genişlənmiş prosesin «yuxarı»dan tənzimlənməsini təsdiq edir, çünki yenidənqurmanın sovet qaydalarını hələ tam sıradan çıxara bilmədiyi bir dövrdə vilayət orqanları belə sanksiyalaşdırılmış, təcrübəli çıxış edə bilməzdilər.

Vəziyyəti sabitləşdirmək üçün Moskvadan Azərbaycana və Ermənistana göndərilmiş nümayəndələrin qeyri-müəyyən mövqeyi münaqişənin daha da qızışmasına gətirib çıxardı. Azərbaycanda olan təmsilçilər xalqlar dostluğundan, sərhədlərin toxunulmazlığından danışır, İrəvandakılar isə əksinə, ermənilərin tələblərinin qanuni olduğunu göstərirdilər.

Ermənistanda azərbaycanlılara qarşı zorakılıq və qətllərə, Yuxarı Qarabağda ermənilərin separatçı tələblərinə qarşı münaqişə zonasında yaşayan azərbaycanlılar xüsusən qəti etiraz edirdilər. Aran Qarabağdan toplaşaraq Dağlıq Qarabağda münaqişəni başlanğıcda həll etmək, onun böyüyüb daha canlı münaqişəyə çevrilməsinin qarşısını almaq üçün yürüşə hazırlaşan azərbaycanlıları rəsmi Bakının göstərişi ilə dayandırdılar.

1988-ci il fevralın 21-də Sov. İKP Siyasi bürosunda Dağlıq Qarabağ hadisələri ilk dəfə geniş müzakirə olundu. Qərar Ermənistan və Dağlıq Qarabağın erməni icmasının ərazi iddialarına nəinki birmənalı rədd ca-

vabı verir, eyni zamanda bu məsələni qaldıranlara qarşı ciddi ittihamlar irəli sürürdü. Qərarda deyilirdi:

«Son günlər Azərbaycan SSR-in Dağlıq Qarabağ Muxtar Vilayətində erməni əhalisinin müəyyən bir hissəsi Dağlıq Qarabağı Ermənistan SSR-in tərkibinə daxil etmək tələbi ilə çıxış etmişdir. Ekstremist əhvali-ruhiyyəli ayrı-ayrı şəxslərin məsuliyyətsiz çağırışları nəticəsində ictimai asayişin pozulması halları olmuşdur. Sov. İKP Mərkəzi Komitəsi Dağlıq Qarabağ Muxtar Vilayətində hadisələr haqda məlumatları nəzərdən keçirərək, belə hesab edir ki, mövcud milli-ərazi quruluşunu dəyişdirmək məqsədi güdən hərəkətlər və tələblər Azərbaycan SSR və Ermənistan SSR zəhmətkeşlərinin mənafelərinə ziddir, millətlərarası münasibətlərə zərər vurur» (21).

Göründüyü kimi, Mərkəzi Komitənin qərarında ərazi məsələsini qaldıranlar millətçi və ekstremist şəxslər adlandırılaraq məsuliyyət onların və passivlik göstərən partiya rəhbərliyinin üzərinə qoyulur. Bu qərar, demək olar ki, həm Azərbaycanda, həm də Ermənistanda ehtirasların sakitləşməsinə səbəb oldu. Ermənilər başa düşdülər ki, SSRİ rəhbərliyi onların ümidlərinin əksinə olaraq, Dağlıq Qarabağa iddiaları təmin etməyəcək. Halbuki «Qarabağ» komitəsinin üzvü Rafael Qazaryan deyirdi: «Biz Qorbaçovun bu məsələni bir həftəyə həll edəcəyinə inanırdıq» (208, 47).

Rəsmi sənədlərdə sərhədlərin dəyişilməzliyi prinsipi vurğulansa da, SSRİ rəhbərliyi, şəxsən M.Qorbaçov ermənilərin antikonstitusion çıxışlarının qarşısını almaq üçün zəruri addımların atılması əleyhinə çıxış edir, ermənilərin bu hərəkətlərini yenidənqurma və aşkarlığın təzahürü kimi qəbul edir və bununla, əslində, onlara dəstəyini nümayiş etdirirdi. Məsələn, Siyasi büronun 29 fevral 1988-ci il tarixli iclasında o, Ermənistanda keçirilən mitinqlərlə bağlı deyirdi: «Biz bilirik ki, orada ekstremist elementlər var. Lakin qeyd etməliyəm ki, hətta Yerevanda yarım milyon insan toplaşdıqda belə, ermənilərin intizamı yüksək səviyyədə idi və orada heç bir antisovet çıxış yox idi. Müəyyən qrupları çıxmaq şərti ilə demək olar ki, bütün kütlə bizim – Siyasi büro üzvlərinin portretləri ilə hərəkət edirdi. Yalnız ekstremistlər öz müqəddəratını təyinetmə barədə şüarlar səsləndirirdilər. Lakin heç bir çıxış işi antisovet düşmənçiliyə gətirib çıxarmırdı. Tanınmış insanlar çıxış edirdi – xalq artistləri, rəssamlar, bir sözlə, nüfuzlu adamlar. Bütün diqqət Dağlıq Qarabağ ətrafındakı vəziyyətə yönəlmişdi. Erməni mədəniyyətinə hörmətsizlik edildiyi, həmçinin erməni muxtariyyətinin hüquqlarının məhdudlaşdırılmasından, onların vətənləri ilə əlaqələrinin kəsilməsindən danışılırdı (116).

Moskvanın göstərişi ilə Stepanakertə göndərilmiş Siyasi büro üzvlüyünə namizədlər Sov. İKP MK katibi G.P.Razumovski və P.Demiçev Sov. İKP MK Siyasi bürosunun qərarını ermənilərə çatdıraraq «mövcud milli-ərazi quruluşunun dəyişdirilməsinə yönəldilmiş hərəkət və tələblərin Azərbaycan SSR və Ermənistan SSR zəhmətkeşlərinin maraqlarına zidd» olduğunu bildirdilər (32, 1988, 23 fevral).

Fevralın 22-də Stepanakertdə vilayət partiya fəallarının yığıncağında Dağlıq Qarabağ Muxtar Vilayətində baş vermiş mənfi halları aradan qaldırmaq sahəsində təxirəsalınmaz tədbirlər müzakirə edildi. Yığıncaqda Sov. İKP MK Siyasi bürosu üzvlüyünə namizəd, Sov. İKP MK katibi G.P.Razumovski çıxış edərək dedi: «Son vaxtlar Sov.İKP MK-nın, SSRİ Ali Soveti Rəyasət Heyətinin və digər mərkəzi orqanların ünvanına DQMV-nin erməni əhalisinin göndərdiyi məktublarda və ərizələrdə vilayəti Ermənistan SSR ilə birləşdirmək xahiş edilir. Dağlıq Qarabağın özündə baş verən çıxışların gedişində də bu cür tələblər irəli sürülür. Deməliyəm ki, Sov. İKP MK mövcud milli-ərazi quruluşunu dəyişdirmək məqsədi güdən hərəkətləri və tələbləri Azərbaycan SSR və Ermənistan SSR zəhmətkeşlərinin mənafelərinə zidd hərəkətlər və tələblər kimi qiymətləndirir. Belə hərəkətlər və tələblər onların millətlərarası münasibətlərinə ziyan vurur, əgər indi məsul tədbirlər görülməsə, ciddi nəticələrə gətirib çıxara bilər. Bütün bunlar ayrı-ayrı şəxslərin məsuliyyətsiz çağırışları və hərəkətləri, habelə respublikaların partiya və sovet orqanlarının passiv, gözləmə mövqeyi nəticəsində mümkün olmuşdur. Bu respublikaların rəhbərliyi vəziyyətin qiymətləndirilməsinə səthi yanaşmışlar» (167).

G.P.Razumovskinin çıxışının sonrakı hissəsi təhlil üçün çox böyük maraq doğurur. O, Dağlıq Qarabağdakı iqtisadi vəziyyəti və vilayətin Azərbaycanla iqtisadi baxımdan daha sıx əlaqəli olduğunu sübut edərək deyir: «Dağlıq Qarabağ Muxtar Vilayəti dinamik surətdə inkişaf edir. Dəmiryolu, elektrik xətləri, qaz kəmərləri – bütün bunlar DQMV-ni Azərbaycan SSR ilə ən sıx surətdə bağlayır. Vilayətdə çoxlu sənaye müəssisəsi işləyir: Stepanakert isə iri sənaye və mədəniyyət mərkəzinə çevrilmişdir. Faktlar göstərir ki, çox mühüm iqtisadi və sosial göstəricilər üzrə Dağlıq Qarabağ Muxtar Vilayəti bir çox hallarda orta respublika səviyyəsini qabaqlayır. Əlbəttə, istər respublikada, istərsə də vilayətdə heç də bütün məsələlər həll edilməmişdir, iqtisadi və mədəni sahələrdə nöqsanlar hələ çoxdur, lakin bu, həyatdır. Vaxtı çatmış problemlər əməli surətdə, konkret

işlərlə həll edilməlidir. Lazım gəlsə, SSRİ hökuməti sosial-iqtisadi və mədəni inkişaf məsələlərinə aid təklifləri nəzərdən keçirməyə hazırdır» (19, 5). Bununla da, Razumovski iqtisadi-sosial göstəricilərə istinadən Dağlıq Qarabağın bir sıra göstəricilərinin Azərbaycan üzrə ümumi orta göstəricilərdən qabaqda olduğunu bəyan edir və erməni icmasının Azərbaycandan məhz sosial-iqtisadi vəziyyəti əsas gətirərək ayrılmaq istəklərinin əsassız olduğunu sübut edir. Başqa tərəfdən, Mixail Qorbaçovun erməni müşaviri akademik Aqanbekyan Fransada olarkən «Humanite» qəzetinə verdiyi müsahibədə Dağlıq Qarabağın iqtisadi baxımdan Ermənistanla daha sıx bağlı olduğunu və vilayətin Ermənistana birləşdirildiyi təqdirdə daha sürətlə inkişaf edə biləcəyini iddia etməsi də faktlarla təkzib edilir. Reallıq da, Razumovskinin çıxışı da göstərir ki, Dağlıq Qarabağ vilayəti dəmiryolları, elektrik xətləri, qaz kəmərləri vasitəsilə məhz Azərbaycanla sıx bağlıdır. Odur ki, erməni separatizminə iqtisadi-sosial, mədəni inkişaf baxımından hər hansı haqq qazandırmaq mümkün deyildir.

Ancaq bir məqam diqqəti cəlb etməyə bilməz. Mixail Qorbaçov reallığın və G.Razumovskinin sözlərinin, əksinə olaraq 12 dekabr 1988-ci ildə SSRİ Mərkəzi Televiziyasının və Ermənistan televiziyasının müxbirləri ilə söhbətində ermənilərə ehmallı ümidlər verərək onların separatçı tələblərində haqlı olduqlarına dair fikirlər səsləndirir. Məsələn, o, sözügedən müsahibədə deyir: «Zənnimcə, özlüyündə Qarabağ problemi var. Onun kökləri var və həmin problem ona görə kəskinləşmişdir ki, Azərbaycanın keçmiş rəhbərliyi hansı mərhələdəsə bu əhaliyə düzgün, Lenin ənənələri ruhunda yanaşmamış, sadəcə olaraq bəzən insan kimi yanaşmamışdır. Bu isə adamları incitmişdir. Biz bunu pisləyirik» (32, 1988, 13 dekabr). Bununla da, M.Qorbaçov Ermənistanın və ermənilərin separatçı hərəkətlərinə haqq qazandırdığını deyir və MK-nın 1988-ci il fevralın 21-də qəbul edilmiş qərarına, Razumovskinin çıxışındakı müddəalara tam zidd bəyanatlar verir, bununla da, erməniləri təcavüzkar hərəkətlərə ruhlandırırdı. Məsələ ondadır ki, Mixail Qorbaçovun şəxsi mövqeyinin praktik olaraq Mərkəzi Komitənin və Siyasi büronun mövqeyindən əhəmiyyətli dərəcədə fərqləndiyi dəfələrlə özünü büruzə verirdi. Qorbaçovun şəxsi çıxış və hərəkətlərinin MK-dan, Siyasi büronun kollektiv qərarlarından fərqlənməsinin səbəbləri isə ayrıca araşdırma mövzusudur. Məsələn, Sov. İKP Mərkəzi Komitəsinin «Dağlıq Qarabağda hadisələrə dair» 21 fevral tarixli qərarının müddəaları G.Razumovskinin 22 fevral

1988-ci il Stepanakertdəki çıxışının müddəaları ilə üst-üstə düşür. Ona görə ki, MK və Siyasi büro üzvləri qəbul edilmiş qərarın müddəaları əsasında hərəkət və çıxışlar etməli idilər. Ancaq Mixail Qorbaçovun Azərbaycan və Ermənistan zəhmətkeşlərinə, xalqlarına 26 fevral 1988-ci il tarixli müraciətində isə MK-nın qərarından bir cümlə belə yoxdur. Mixail Qorbaçovun müraciətində MK-nın qərarında özünə yer almış Dağlıq Qarabağın Azərbaycandan ayrılmasını birmənalı pisləyən, milli-ərazi quruluşunun dəyişməsinin qəbuledilməz olması haqda müddəalar yoxdur. Eyni zamanda MK-nın qərarında separatçılar «ekstremist əhvali-ruhiyyəli şəxslər» adlandırılırdı. Mixail Qorbaçovun Baş katib kimi müraciətində isə həmin şəxslər birmənalı pislənmirdi. Mixail Qorbaçov bu müraciəti ilə erməniləri separatizmdən əl çəkməyə çağırmır, əksinə, «Dağlıq Qarabağda yığılıb qalan nöqsanlar», «həyatımızda həll edilməmiş problemlər» haqda danışmağa, xalqlar dostluğuna aid ümumi mühakimələrə üstünlük verir. M.Qorbaçov bilərəkdən, ya bilməyərəkdən artıq o zaman insanlarda ikrah doğuran «xalqlar dostluğunun Lenin prinsipləri»ndən danışır və bununla da, yanan ocağa yağ tökürdü (32, 1988, 27 fevral). O, MK-nın tövsiyələri haqda desə də, konkretləşdirməkdən çəkinərək ikili oyun aparırdı.

Bununla da o, separatizm tərəfdarlarının ümidlərini qırmamağa çalışırdı. Onun aqressiv separatçılara, radikal millətçilərə ümid verdiyini və onların Ermənistanda nüfuzunun qaldırılmasına xidmət edən hərəkətlərə yol verdiyini göstərən başqa faktlar da var. Məsələn, milli-ərazi quruluşunun dəyişməz olması haqda MK-nın qərarı barədə müraciətin edildiyi gün, fevralın 26-da o, Silva Kaputikyan və Zori Balayan kimi radikal faşistləri Kremldə qəbul etmiş və onlara Azərbaycana qarşı hərəkətlərində ardıcıl olmaq üçün ümid vermişdi.

Erməniləri qanunsuz hərəkətlərdən çəkindirmək üçün təsirli tədbirlər görülmədi. Fevralın 23-də Vilayət Partiya komitəsinin birinci katibi, Azərbaycana loyal münasibəti ilə seçilən B.S.Gevorkovun yerinə Q.A.Poqasyanın seçilməsi vəziyyəti daha da gərginləşdirdi. Yeni rəhbərlik tamamilə separatizmin və qanunazidd əməllərin iştirakçısına çevrildi.

Beləliklə, MK-nın 21 fevral qərarındakı fikirlərdən və Razumovskinin Stepanakertdəki çıxışından Ermənistanda məyus oldular, Azərbaycanda isə qərardan razı qaldılar və qısa pauza yarandı. Mixail Qorbaçov və komandası bir tərəfdən ərazi dəyişikliyini SSRİ-nin mövcudluğu üçün

təhlükə sayırdı, eyni zamanda Qarabağın Ermənistana birləşdirilməsi üçün heç bir ciddi siyasi-psixoloji, tarixi əsas olmadığı üçün Ermənistanın xeyrinə qərar qəbul etməyə cəsarət etmirdi. Ancaq sonrakı hadisələr belə əsasların, əlverişli siyasi-psixoloji bazanın yaradılmasına yönəldi. Vəziyyəti Ermənistanın xeyrinə dəyişmək lazım idi. Bu dəyişikliyi isə yalnız Azərbaycan tərəfinin səhv hərəkəti stimullaşdıra bilərdi. Pauza müddətində Ermənistan tərəfindən Azərbaycanda ictimaiyyəti qıcıqlandırmağa yönəldilmiş bir neçə hərəkət edildi. İlk hərəkət fevralın 22-də Dağlıq Qarabağda – Əsgəranda baş verdi. Başqa bir təxribat cəhdi isə Naxçıvan şəhərində oldu. Bu hadisə çox böyük əks-səda doğurmasa da, fevralın son günlərində ermənilərin təxribatlar sahəsində fəallığının bir nümunəsi olaraq diqqəti cəlb edir. Məsələn, 1988-ci il fevralın 26-da Yerevan şəhərinin sakinləri, erməni millətçiləri V.Aleksanyan və Z.Xaçaturyan aldatma yolu ilə Naxçıvan şəhəri, Nizami küçəsi 57, mənzil 3-də yaşayan Q.Hüseynovun mənzilinə daxil olmuş, ona və qızı S.Hüseynovaya bıçaqla ağır bədən xəsarəti yetirmişdilər (22).

Çox böyük ehtimalla ermənilər Sumqayıtda olduğu kimi, Naxçıvanda da əks-reaksiya doğurmağa, Naxçıvan əhalisini ermənilərə qarşı hücuma təhrik etməyə cəhd ediblər. Ancaq Əsgəranda olduğu kimi, Naxçıvanda da bu cəhd alınmamışdı. Vladimir Qalkin bu barədə deyirdi: «Azərbaycanlılarla ermənilər arasında ilk qarşıdurma fevralın 22-i, Əsgəran rayonunda baş verdi. 2 azərbaycanlı öldürüldü, ilk qan axıdıldı». Fevralın 22-də Əsgəranda erməni snayperi üzümlükdə işləyən iki azərbaycanlını öldürdü. Filip Bobkov bu barədə yazır: «Fakt faktlığında qalır. İlk qurbanlar azərbaycanlılar oldu. Üzümlükdə işləyən iki nəfər, kəndli və balaca oğlan erməni atıcısına şübhəli göründü və fevralın 22-də 1988-ci ildə həmin iki nəfər öldürüldü» (89, 295–296). Ancaq təxribata istənilən reaksiyanı almaq mümkün olmadı. Azərbaycanda bu təxribata Bakıda verilə biləcək reaksiyanın qarşısını ala bildilər. Ağdamdan Əsgərana hücum etmək istəyən azərbaycanlıları sakitləşdirmək mümkün oldu. Həmin hadisədə öldürülmüş 23 yaşlı Əli Hacıyev və 16 yaşlı Bəxtiyar Quliyev Qarabağda erməni təcavüzünün ilk qurbanları oldular. Qəzəblənmiş ağdamlıların Stepanakertə hücumunun qarşısını yalnız Xuraman Abbasovanın fədakar hərəkəti aldı. Həmin gün Ağdamla Əsgəranın inzibati sərhədində olmuş Filip Bobkov Azərbaycan xalqının müdrikcəsinə təxribata qarşı emosiyalarını boğmasının şahidi olduğunu yazır (296). Hakimiyyət orqanları

təxribata yol verməmək üçün öldürülənlərin azərbaycanlı olduğunu gizli saxlamağı məqbul saydı. Filip Bobkov da azərbaycanlıların öldürülməsi haqda məlumatın gizli saxlanmasını doğru addım hesab edir. Bu məlumat Azərbaycan tərəfindən gizlədilirdi ki, emosiyalar coşmasın. Amma SSRİ prokurorluğunun sonrakı iki addımı emosiyaların yenidən coşması üçün siqnal oldu. Fevralın 27-də SSRİ Baş prokurorunun müavini Aleksandr Katusev Mərkəzi televiziya və Azərbaycan radiosu ilə çıxış edərək gözlənilmədən Əsgəranda həlak olanların milliyyətini hadisədən 5 gün sonra açıqlamaq qərarına gəldi. S.Şahmuradyan bu hadisə haqda yazır ki, A.Katusevin çıxışının mətni Dağlıq Qarabağ Vilayət partiya komitəsinin birinci katibi G.Poqasyanla razılaşdırılmışdı və Poqasyan öldürülənlərin milliyyətinin açıqlanmamasını xahiş etmişdi. A.Katusev özünün əvvəlki iki çıxışı zamanı öldürülənlərin etnik mənsubiyyəti haqda susmuşdu. Ancaq bir neçə gündən sonra belə qərara gəldi ki, öldürülənlərin məhz azərbaycanlı olduğunu bəyan etmək lazımdır» (203).

Aleksey Zverev «Qafqazda mübahisəli sərhədlər. Qafqazda etnik münaqişələr, 1988–1994-cü illər» əsərində yazır: «SSRİ Baş prokurorunun müavini A.Katusev fevralın 27-də mərkəzi televiziya ilə çıxış edərək milli mənsubiyyəti vurğulayaraq iki azərbaycanlı gəncin qətlə yetirilməsi haqda məlumat verdi. Bu çıxış mümkündür ki, katalizator rolunu oynadı. Bir neçə saatdan sonra Bakıdan 25 kilometr məsafədə, Sumqayıtda erməni talanı başladı. Açıq-aşkar o vaxtdan bir neçə ay əvvəl hazırlanmış talan qəddarlığı ilə yadda qaldı və üç gün davam etdi». Beləliklə, Aleksey Zverev də Sumqayıt talanının bir neçə ay əvvəl hazırlandığını və A.Katusevin çıxışının təxribat xarakterli katalizator rolu oynadığını təsdiqləyir (117).

O zaman Sumqayıtda yaşamış Konstantin Pxakadze Yerevanda 10 may 1988-ci ildə verdiyi ifadədə bu məsələ haqda deyir: «Talan məhz Baş prokurorun müavini Katusevin çıxışından sonra başlandı. Məhz belə oldu. Məhz bundan sonra qırğın başladı. Axı onlar fevralın 26-da öldürməyə hazırlaşmırdılar. Amma Katusevin çıxışından sonra başladılar öldürməyə» (231).

Fevralın 26-da M.Qorbaçovun Azərbaycan və Ermənistan xalqlarına müraciəti dərc olundu. Müraciətdə Dağlıq Qarabağ məsələsinin gərginliyə və qanundankənar hərəkətlərə gətirib çıxarmış kəskin və dramatik vəziyyətə çatdırılması qeyd olunur, «yaranmış vəziyyətin aradan qaldırılmasına, Azərbaycanda və Ermənistanda yığılıb qalmış konkret iqti-

sadi, sosial, ekoloji və digər problemlərin bütün ölkədə həyata keçirilən yenidənqurma və yeniləşdirmə siyasəti ruhunda həll edilməsinə səy göstərmək çağırışı səslənmişdi (32, 1988, 27 fevral).

Elə həmin gün Qarabağ hərəkatının ideoloqlarından olan Z.Balayanı və S.Kaputikyanı Moskvada əvvəlcə A.Yakovlev, sonra isə M.Qorbaçov qəbul etdi. Qəbulda Qorbaçovun müşavirlərindən biri əslən Qarabağdan olan Georki Şahnazarov da iştirak edirdi. Yakovlevin Mikoyanın ailəsində tərbiyə almış Kuznetsov adlı köməkçisinin təşkil etdiyi görüşdə Qorbaçovun ölkənin rəhbəri kimi obyektivlik və tərəfsizlik göstərməməsi, münaqişə tərəflərinin yalnız birinin nümayəndələrini qəbul etməsi azərbaycanlıların haqlı narazılığına səbəb oldu. Bu görüş haqqında məlumat ildırım sürəti ilə yayıldı və azərbaycanlılar Sov.İKP MK-nın 21 fevral tarixli qərarının onları aldatmaq üçün qəbul olunduğunu və özlərinin aldanmış olduqlarını başa düşdülər. Həmin görüş haqqında onun iştirakçılarının memuarları qalmışdır (216, 206; 199, 18–20; 106, 503–504; 207, 50–52).

M.Qorbaçov Siyasi büroda çıxışlarının birində Kaputikyan və Balayanla söhbətini yada salaraq onlara dediyi sözləri bir də təkrarlamışdı: «Demişdim ki, biz bu məsələnin tarixini bilirik, bu, təmiz məsələdir. Onun səbəbləri xaricdədir, bizim hüdudlarımızdan kənarda. Tarixin erməni xalqını pərən-pərən saldığını biz hamımız çox gözəl bilirik və anlayırıq. Mən burada iki səbəb görürəm: bir tərəfdən Qarabağın özündə çoxlu boşluqlar buraxılıb, üstəgəl xalqın özündə olan emosional başlanğıc. Tarixən bu xalqın başına gələnlər beyinlərdə oturub və ona aid olan hər şey belə reaksiya doğurur. Bu səbəblər (ermənilərin narazılığının səbəbləri – İ.M.) həmişə orada olub, indi də var. Ermənistandan Dağlıq Qarabağa aparan yollar başlı-başına buraxılmış, mədəni əlaqələr pozulmuşdu. Bu, bilərəkdən edilirdi. Dağlıq Qarabağda türk mediabazları (!) yayımlanır, erməni televiziyaları yox. Bütün bunlar əhaliyə toxunur axı. Bir sözlə, onlar hislərlə mahiranə oynayırlar – sizə deyim ki, bu, ciddi tədqiq olunası məsələdir, onlar əbəs yerə bunu etmirlər» (116).

Erməni ziyalıları öz mövqelərinin doğruluğunu sübut etmək üçün guya, əhalinin əksəriyyəti ermənilərdən ibarət olan Naxçıvanın taleyini misal gətirmiş, guya, Türkiyənin SSRİ-nin əksər ərazilərinin öz ərazisi hesab etdiyi hansısa xəritəni təqdim etmişdilər. Bununla onlar Qorbaçovdan ermənilərə heç olmasa hansısa güzəştlər ediləcəyi haqqında söz almağa nail olacaqlarına ümid etdiklərini gizlətmirdilər.

Həmin görüşdə S.Kaputikyanın «Ermənistana qayıtdıqdan sonra biz deyə bilərikmi ki, Baş katib Qarabağ ermənilərinin hüquqlarını təmin edəcəyinə söz veribdir?» sualına Qorbaçov cavab vermişdi ki, təkrar edirəm, bütün zəruri tədbirlər görüləcəkdir (Будет сделано все необходимое. – İ.M.), ancaq ərazi məsələlərini qaldırmayın (199, 503–504). M.Qorbaçov Dağlıq Qarabağın Ermənistana verilməsi ideyasını qəbul etməsə də, vilayətdə mədəni və iqtisadi islahatlar keçirəcəyinə söz verdi. O, ermənilərin irəli sürdüyü 20 şikayəti öz dəftərinə yazmış, vilayətin ehtiyaclarına o zaman üçün böyük məbləğ olan 400 milyon manat pul ayırmışdı (söhbət Sov. İKP MK və SSRİ Nazirlər Sovetinin 24 mart 1988-ci il tarixli 21 maddəlik qərarından gedir – İ.M.). Ermənilər isə əvəzində nümayiş və tətilləri bir ay dayandırmağa söz vermişdilər (207, 52). Bu gün, hətta Rusiya müəllifləri Dağlıq Qarabağ hadisələrini işıqlandırarkən etiraf edirlər ki, Qorbaçovun həmin dövrdə erməni ictimaiyyətinin nümayəndələri ilə görüşməsi münaqişə tərəfləri arasında etimadsızlığın artması şəraitində düzgün addım deyildi və istər-istəməz onu göstərirdi ki, Moskva bu münaqişədə bir tərəfin mövqeyini tutur (180, 112–113).

M.Qorbaçovun S.Kaputikyanla Z.Balayanı qəbul etməsi və Əsgəranda öldürülənlərin məhz azərbaycanlı olmaları haqda rəsmi məlumat hər iki tərəfə qızışdırıcı təsir göstərdi. Azərbaycanlılar rəhbərlik tərəfindən aldadıldıqlarını və ermənilər tərəfindən təcavüzə məruz qaldıqlarını, M.Qorbaçovun ermənilərə ümid verməsini, ərazi iddialarının gündəlikdən çıxmadığını görüb etiraz etməyə başladılar. Ermənilər isə Qorbaçovun Silva Kaputikyan və Zori Balayanı qəbul edib onlara ümid verməsindən ruhlandılar və ərazi iddiaları üçün küçəyə çıxanların sayı artmağa başladı.

Vəziyyətin sakitləşməyə doğru getdiyi bir məqamda Qorbaçovun Kaputikyan və Balayanı qəbul edərək onlara ümid verməsi bütün SSRİ rəhbərliyində də anlaşılmazlıq yaratmışdı. Ən mühüm ziddiyyət ondadır ki, MK-nın fevralın 21-də qəbul etdiyi qərarda Azərbaycana qarşı ərazi iddialarını və yazdıqları kitablarda azərbaycanlılara qarşı faşist ideyalarını irəli sürmüş bu adamlar ekstremist adlandırılmışdılar. Amma üstündən 5 gün keçdikdən sonra SSRİ-nin rəhbəri, Kommunist partiyasının baş katibi rəsmən ekstremist elan olunmuş adamları qəbul edib onlarla bir saatdan çox daxili siyasi və geosiyasi məsələləri müzakirə edir. Həm də üç erməninin əhatəsində. Bu, anlaşılmazlıq yaratmışdı. Məsələn, DTK sədrinin 1-ci müavini Filip Bobkov bununla bağlı yazır: «Qarabağda və-

ziyyət bir neçə gün də gərgin olaraq qaldı. Ola bilər ki, Silva Kaputikyanla Zori Balayanın əvvəlcə Yakovlev, sonra da Qorbaçov tərəfindən qəbul edilməsi xəbəri yayılmasaydı, vəziyyət sakitləşərdi. Bu görüşün nə üçün lazım olduğunu demək çətindir. Ola bilər ki, rəhbərlik ziyalıların nüfuzundan istifadə edib düyünü bərkitmək istəyirdi (89, 296).

Filip Bobkov Azərbaycan Televiziyasına verdiyi müsahibədə deyirdi: «Sumqayıtda hər şey Kaputikyanın çıxışından sonra başladı. O, Moskvada Qorbaçovla görüşüb Yerevana qayıtdıqdan sonra radioda çıxış etdi. Təbii ki, bu radio verilişi Sumqayıtda da yayımlanırdı. Məhz həmin çıxışdan sonra bu situasiya yarandı. Həmin günün səhəri MK katibi ilə Sumqayıtda idik, hər şey çox sakit idi. Lakin artıq axşam bu hadisə baş verdi – Kaputikyanın çıxışından sonra» (14).

Vitali Vorotnikov da bu məsələ haqda deyirdi: «DQR-də münaqişə Sov. İKP Siyasi bürosu üçün gözlənilməz oldu. Ancaq buna qədər belə şayiələr gəzirdi ki, erməni ziyalılarının nümayəndələri Moskvaya gəliblər ki, DQR-in Azərbaycandan ayrılıb Ermənistanın tərkibinə verilməsi üçün razılıq alsınlar. Və onlara elə görünmüşdü ki, onların xahişi anlaşıqlı qarşılanmış və bəyənilmişdi. Nümayəndələr qayıdıb bəyanat verdilər ki, Moskva onların iddiasını dəstəkləyib» (234).

SSRİ DİN Qoşun qrupları rəisi general Henrix Malyurkin təsdiq edir ki, Kaputikyan Yerevana qayıtdıqdan sonra yerli televiziya ilə çıxışında öz təəssüratlarını bölüşərək deyirdi: «Söhbət dörd saata yaxın çəkdi. Yoldaş Qorbaçov bizim «Dağlıq Qarabağ» sözünü tez-tez təkrar etdiyimizi görüb dedi: «Məncə, bu söz Arsax deməkdir» (151).

M.Qorbaçov üç gündən sonra, fevralın 29-da keçirilmiş Siyasi büronun iclasında Balayanla Kaputikyanı qəbul etməsi haqda danışır və etiraf edir ki, onların qəbul edilməsi ekstremistlərdə ruh yüksəkliyi yarada bilən amildir. Amma guya, başqa yol da yoxdur. Siyasi büronun üzvləri onun bu çıxışına heç bir razılıq əlaməti göstərmirlər. M.Qorbaçov da hərəkətinin doğru olmadığını və «Politbüro» üzvlərinin onun bu hərəkətinə mənfi yanaşdıqlarını bildiyi üçün Siyasi büronun fevralın 29-dakı yığıncağında uzun-uzadı Kaputikyanla Balayanı nə üçün qəbul etdiyinə haqq qazandırmağa çalışır və hətta Leninin də çətin məqamlarda xoşagəlməz adamlarla görüşdüyünü deyir. Balayanı millətçi, qatı millətçi adlandırmaqla yanaşı, onu istedadlı və ermənilər arasında nüfuzlu adam kimi xarakterizə edir. «Millətçidir, həm də qatı millətçidir. İstedadlı şəxsdir.

33 kitab yazıb. …Moskvada Kaputikyan onu dartıb gətirdi və xahiş etdi ki, 5 dəqiqəliyə qəbul edim. Fikirləşdim ki, niyə boyun qaçırım, burda hər şeydən istifadə etmək lazımdır. Deyim ki, mən nə düşünürəm. Bundan sonra onlara çətin olacaq. İndi onlar mənimlə bağlıdılar. Çətin məqamlarda Lenin də ən xoşagəlməz adamlarla da görüşürdü». Bu açıq-aydın haqlı olmadığını bilən adamın özünə haqq qazandırmaq cəhdləridir. Və M.Qorbaçov Siyasi büroda erməni millətçilərini şirnikləndirməsinə məhz belə haqq qazandırırdı (116).

Daha sonra M.Qorbaçov da etiraf edir ki, Baş katibin bu xoşagəlməz adamları qəbul etməsi onların Ermənistanda nüfuzunu artırır. Qorbaçov sözügedən iclasda deyir: «Birbaşa demək lazımdır ki, əvvəldən aydın idi ki, onlar nə üçün buraya can atırlar. Onlar özlərinə nüfuz qazanırlar. Onlar istəyirdilər ki, öz təsirlərini möhkəmləndirsinlər. Açığını deyək ki, heç bizə də bu görüşdən qaçmaq olmazdı. Onlar ziyalıların böyük nümayəndələridir. Yeri gəlmişkən, hər ikisi kommunistdir» (116). Bununla da, Qorbaçov həqiqəti öz dilindən səsləndirərək özünü sığortalayır və aydın olur ki, deməli, Qorbaçov belə adamların qəbul edilməsinin Ermənistanda qatı təcavüzkar millətçilərin nüfuzunu artıracağını və onları daha radikal hərəkətlərə ruhlandıracağını bilirdi, amma yenə onları qəbul etmişdi. Odur ki, Baş katibin eyni bir görüş haqda həm Azərbaycana qarşı faşist ideyalarının daşıyıcılarının nüfuzunun qaldırılmasına xidmət etməsi və paralel olaraq onları situasiyanı sakitləşdirmək üçün qəbul etməsi haqda fikirləri bir-birinə daban-dabana ziddir.

Həm də maraqlı bir məqam var. M.Qorbaçov və köməkçisi, milliyyətcə Qarabağ ermənisi olan G.Şahnazarov S.Kaputikyan və Z.Balayana bir ay gözləməyi məsləhət görürlər. Yəni bir aydan sonra vəziyyətin onların xeyrinə dəyişəcəyinə dair onlara ümid verirlər. Məsələ ondadır ki, Sov. İKP MK-nın sərhədlərin dəyişməsinə etiraz edən qərarını gündəlikdən çıxarmaq üçün M.Qorbaçov və Ermənistanın millətçilərinin azərbaycanlıların günahkar olduğu, bütün dünyanı lərzəyə gətirəcək böyük bir hadisəyə ehtiyacları vardı. Onlar bu hadisəni gözləyirdilər. Məsələn, M.Qorbaçovun S.Kaputikyan və Z.Balayanla görüşündə onlara «gedin bir ay gözləyin» cavabı verilir. Söhbət belə olur. S.Kaputikyan və Z.Balayan M.Qorbaçov və G.Şahnazarovdan Ermənistanda adamlara nə cavab verəcəklərini soruşurlar. Təbii ki, M.Qorbaçov onlara «bu sizin probleminizdir» deyə bilərdi. Ancaq çox müəmmalıdır ki, onlar dördlükdə – eyni

ideyanın daşıyıcısı olan silahdaşlar kimi adamlara nə deyəcəkləri haqda birgə düşünürlər. Kiçik pauzadan sonra birdən G.Şahnazarov deyir: «Deyin ki, millətlərarası məsələyə dair konfrans olacaq və bir ay gözləmək lazımdır». Əgər fevralın 21-də MK-nın birmənalı sərhədlərin dəyişdirilməməsi haqda qərarı elan olunmuşdusa, separatçılar ekstremist elan edilmişdilərsə, bir aydan sonra bu məsələyə yenidən necə qayıtmaq olardı? Təbii ki, yalnız Sumqayıt hadisəsi kimi hamını şoka sala biləcək ciddi bir partlayışın olması və situasiyanın dəyişməsi nəticəsində bu məsələ başqa bir kontekstdə yenidən müzakirəyə çıxarıla bilərdi.

Ən maraqlı məqam isə budur: Tomas de Vaal «Qara bağ» kitabında yazır: «Moskvadan qayıtmış Silva Kaputikyan televiziya ilə, Zori Balayan isə mitinqdə çıxış edərək mitinqləri bir ay müddətinə saxlamağın vacibliyini deyirlər. Silva Kaputikyan ermənilərə vəd verərək deyir: «Biz bu məğlubiyyəti qələbəyə çevirəcəyik». Bundan sonra hadisələrin inkişafında qısa pauza yaranır: Yerevan mitinqlərinin təşkilatçıları öz çıxışlarını bir ay müddətinə saxlamağa razılaşırlar. Ancaq elə səhəri gün hər şey dəyişdi. Yerevana Azərbaycanın Sumqayıt şəhərindəki qəddar kütləvi qırğınlar haqda məlumatlar daxil olmağa başladı» (207, 52).

F.Bobkov bu görüşlə bağlı yazır ki, bu görüşlərin nə üçün lazım olduğunu demək çətindir. Nə üçün Moskvada ancaq erməniləri qəbul etmişdilər? Bu, açıq-aşkar, nümayişkaranə tərəfkeşlik nəyə lazım idi?.. Azərbaycanlılarda hakimiyyətin bu hərəkətləri nəinki təəccüb doğurdu, hətta onlarda belə hiss oyatdı ki, onları satıblar. Ermənilər isə sevinirdilər, həm də Moskvadan qayıdan S.Kaputikyan və Z.Balayan birmənalı olaraq bildirmişdilər ki, Qarabağ münaqişəsində Qorbaçov ermənilərin tərəfindədir (89, 296).

M.Qorbaçov başda olmaqla SSRİ rəhbərliyi sözdə milli-ərazi quruluşunun, sərhədlərin dəyişilməzliyini müdafiə etsə də, faktiki olaraq dolayısı ilə ermənilərin iddialarının doğru olduğunu dəstəkləyirdilər. Elə buna görə də münaqişənin başlandığı ilk gündən Azərbaycan rəhbərliyinə və ziyalılarına etimadsızlıq göstərilmiş, böhranın həllindən onlar kənarlaşdırılmışdı. Lakin etiraf edilməlidir ki, o zamankı Azərbaycan rəhbərliyi də yaranmış şəraitdə hadisələrin yedəyində getməyi üstün tutdu, proseslərin qarşısını almaq üçün heç bir preventiv tədbir görmədi. Bunu hadisələrin başlanması dövründə Azərbaycan mətbuatının təhlili də sübut edir. O zaman Azərbaycanda nəşr olunan qəzetlərdə təqribən martın əvvəllərinə qədər ermə-

nilərin Dağlıq Qarabağla bağlı iddiaları, hərəkətləri, Ermənistan SSR-də azərbaycanlılara qarşı zorakılıqlar, onların kütləvi şəkildə öz torpaqlarından qovulması haqqında heç bir məlumata rast gəlinmir. Əvəzində xalqlar dostluğu, sosialist beynəlmiləlçiliyi mövzularına geniş yer verilirdi.

Danılmaz faktdır ki, münaqişə başlayandan Sumqayıt hadisələrinə qədər Azərbaycanda yaşayan ermənilərə qarşı heç bir qanunazidd hərəkət törədilməmiş, bircə erməninin belə burnu qanamamışdı. O zaman Azərbaycan rəhbərliyi Ermənistanın hərəkətinə adekvat reaksiya versəydi, ermənilər elə o zaman Qarabağı tərk etməli olardılar. Bu, Azərbaycan tərəfindən Ermənistanın azərbaycanlılara qarşı qəddarlığına cavab kimi, məcburiyyət qarşısında atılan ədalətli addım olardı (T.Köçərli). Lakin Azərbaycan rəhbərliyi nəinki erməniləri Dağlıq Qarabağdan çıxarmadı, əksinə azərbaycanlıların Ermənistandan qovulması, onların kütləvi surətdə Azərbaycana gəlməsi barədə məlumatları belə xalqdan gizli saxlamağa üstünlük verdi. Azərbaycanlıların Dağlıq Qarabağda yerləşdirilməsi ilə bağlı ictimaiyyətin tələblərinə qarşı çıxaraq, Şuşa rayonunda müvəqqəti yerləşmiş az-çox qaçqını belə dərhal oradan çıxardı.

O vaxt Azərbaycan SSR rəhbərliyinə daxil olan şəxslərdən biri, akademik T.Köçərli də etiraf edir ki, Dağlıq Qarabağ hadisələri başlayandan Azərbaycan rəhbərliyinin Dağlıq Qarabağ məsələlərinə dair müstəqil mövqeyi və müstəqil siyasəti yox idi. Siyasətdə uzaqgörənlik, çeviklik və təşəbbüskarlıq çatışmırdı. Hadisələrin ardınca gedirdik, onların inkişafını proqnozlaşdıra bilmirdik. Mərkəzə inam sindromu hər şeyi üstələyirdi (34, 405).

Beləliklə, 1988-ci ilin fevral ayının son onilliyində regionda gərgin hala gətirilmiş vəziyyəti alovlandırmaq üçün bütün şərtlər yetişmişdi: ermənilərin Azərbaycana ərazi iddiaları, azərbaycanlıların Ermənistandan tərxis olunması, qaçqınlar ordusunun yaranması. Yalnız qığılcımı alovlandırmaq çatışmırdı ki, bu da prosesləri idarə edənlər üçün çətin olmadı və Sumqayıt təxribatı törədildi.

# III FƏSİL

## SUMQAYIT FİTNƏKARLIĞININ MAHİYYƏTİ VƏ MƏQSƏDLƏRİ

### 3.1. Sumqayıt hadisələrinin törədilməsinin sosial-siyasi şəraiti

Sumqayıt şəhərinin gənc şəhər kimi formalaşması XX əsrin 20–30-cu illərində SSRİ-də sənayeləşmə və modernləşmə siyasətinin həyata keçirilməsi ilə sıx bağlıdır. Bakının inkişaf etmiş sənaye mərkəzinə çevrilməsi paytaxtın elektrik enerjisinə tələbatının artmasına gətirib çıxardı. O zaman indiki Sumqayıt şəhəri ərazisində istilik elektrik mərkəzinin tikilməsi bu tələbatın ödənilməsində əsas mərhələlərdən biri oldu. Abşeron yarımadasında zəngin neft-qaz ehtiyatlarının olması burada alüminium, kübrələr, sintetik kauçuk istehsalına şərait yaradırdı. Yeni sənaye müəssisələrinin Bakı şəhərində tikilməsi üçün münasib şərtlərin olmadığını nəzərə alaraq onları Abşeronun şimal-qərb zolağında – Sumqayıtda yerləşdirmək planlaşdırılmışdı. İkinci Dünya müharibəsindən sonra Sumqayıtda iri sənaye obyektlərinin tikintisi geniş vüsət aldı. Burada boru-prokat zavodu, sintetik kauçuk, kimya kombinatları və digər istehsal müəssisələri tikildi. Sumqayıt, zəhmətkeşlərin müasir beynəlmiləl birlik arzularını təcəssüm etdirəcək nümunəvi sovet şəhəri kimi layihələndirilmiş və tikilmişdi. Həqiqətdə isə Sumqayıt münasib yaşayış şəraiti olmayan, narazı, bütöv lümpen proletariat sinfini doğurdu (207, 56).

1938-ci ildə Sumqayıta şəhər tipli qəsəbə, 1949-cu ildə isə respublika tabeli şəhər statusu verildi. Bakının yaxınlığında yeni sənaye mərkəzinin təşəkkül tapması burada əhalinin sürətlə artmasına gətirib çıxardı. XX əsrin 30–40-cı illərində sənaye qəsəbəsi kimi təməli qoyulan Sumqayıtın ilk inşaatçıları, qurucuları və ilk sakinləri icbari əmək cəzasına məhkum edilmiş məhbuslar, işsizlik ucbatından kəndləri tərk edərək buraya bir parça çörək dalınca gələn gənclər idilər. Müharibədən sonra inkişaf edən Sumqayıtda dustaq, əsir və məhkumların gücündən maksimum

istifadə edilmişdi. Alman əsirlərin şəhərin tikintisində zəhməti olmuşdu. Alman əsirləri sonralar öz vətənlərinə qayıtsalar da, azərbaycanlı məhbuslar, icbari əmək cəzasına məhkum olunmuşların əksəriyyəti üçün Sumqayıt daimi iş və yaşayış yeri oldu. Şəhər əhalisinin sayı sürətlə artırdı. Artıq 1949-cu ildə burada 17200 nəfər yaşayırdı və əhalinin sayı 1939-cu ilə nisbətən 11800 nəfər artmışdı (189, 11; 2, 83).

Sumqayıt şəhərinin inkişafının bu spesifik xüsusiyyətləri, əhalinin tərkibi, sosial-iqtisadi problemlərin kəskinliyi burada sosial etirazlar üçün münbit şərait formalaşdırırdı.

N.Xruşşov dövrünün ən kütləvi etiraz hadisələrindən biri 1963-cü il noyabrın 7-də Oktyabr inqilabının 46-cı ildönümündə Sumqayıtda baş verdi. Bütün ölkədə olduğu kimi, Sumqayıtda da həmin gün bayram nümayişləri keçirilir, N.Xruşşov başda olmaqla sovet rəhbərliyinin ünvanına şüarlar və alqışlar səsləndirilirdi. Lakin Sumqayıtda bəzi nümayişçilər öz əllərində Stalinin portretini tutaraq ümumi dəstəyə qoşulmuş və bununla da standart ssenari üzrə keçirilən tədbirin pozulmasına səbəb olmuşdular. Yerli rəhbərliyin Stalinin portretini fəhlələrin əllərindən almaq cəhdləri çaxnaşmaya səbəb olmuş, milis və nümayişçilər arasında başlayan toqquşma bir neçə saat davam etmişdi. Etirazçılar Xruşşovun, digər partiya və sovet liderlərinin portretlərini cırmış, faktiki olaraq nümayiş baş tutmamışdı. Hətta Ənvər Mahmudov adlı bir nəfər «Sov. İKP MK və Sovet hökuməti rəhbərlərini yıxmağa» çağırmışdı. Etirazçılar sonra şəhər milis idarəsinə hücum edərək həbs olunmuş yoldaşlarını azad etməyi tələb etmiş, milis binası və yaxınlıqdakı maşınlar yandırılmışdı. Yalnız Bakıdan göndərilmiş əlavə qüvvələrin köməyi ilə iğtişaşı yatırmaq mümkün olmuşdu. İğtişaşçılardan 6 nəfəri 3 ildən 6 ilə qədər azadlıqdan məhrum edilmişdi. Sumqayıt hadisələrinin təhqiqi bu hadisələrdə milli amilin heç bir rol oynamadığı, əksinə, etirazçılar arasında müxtəlif millətlərin nümayəndələrinin olduğunu göstərmişdi (135, 431–436).

1963-cü il Sumqayıt hadisələrinin təhqiqi ilə Azərbaycan DTK məşğul olmuşdu. İğtişaşlara dair sənədlərdən də (107) məlum olur ki, bu hadisələr spontan şəkildə baş vermişdir, onlara hər hansı mütəşəkkil rəhbərlikdən söhbət gedə bilməz. Ancaq bəzi mülahizələrə görə Sumqayıtda 1963-cü ildə baş vermiş toqquşma da N.Xruşşova qarşı təşkil edilmişdi. Yeri gəlmişkən, Sumqayıt talanından 25 il əvvəl baş vermiş həmin toqquşmalarda da xaricilərə qarşı çıxışlar təşkil olunmuşdu. 1963-cü ilin no-

yabrına aid olan sənədlərin birində yazılır: «Noyabrın 15-də Kuba Respublikasının SSRİ-dəki səfiri Karlos Olivers Sançes onun xahişi ilə Sov. İKP MK-nın şöbəsində qəbul edildi. Yoldaş Olivers dedi ki, bu günlərdə Azərbaycan SSR-in Sumqayıt şəhərində təhsil alan 4 nəfər kubalı Kuba səfirliyinə gələrək səfirə bildiriblər ki, Sumqayıt şəhərində yerli əhali tərəfindən ruslara və xaricilərə qarşı millətçi təzahürlər müşahidə olunur. 7 noyabrda Sumqayıtda stalinçi nümayiş olub və onun gedişində bəzi milis bölmələri dağıdılıb, milis rəisi və rus əsgəri öldürülüb, xeyli adam yaralanıb. Səfir deyib ki, kubalıları döyüblər və onlara deyiblər ki, onları Qafqaz qanunlarına öyrədəcəklər». Yenə Sumqayıt və yenə millətlərarası toqquşma ssenarisi.

Sumqayıtda 1963-cü ildə bu hadisənin də baş verməsinin siyasi zəmini stalinçilərlə xruşşovçuların qarşıdurması olmuşdu. Nümayişçilər stalinizmi müdafiə edən şüarlar səsləndirmişdilər və «rədd olsun Xruşşov» deyə qışqırmışdılar. Sumqayıtın təxribatlar üçün əlverişli meydan olması orada qarşıdurmaların təkrar-təkrar müşahidə olunması ilə təsdiq olunur.

Xruşşova qarşı nümayişlər 1956-cı ildə Tbilisidə də baş vermişdi. Nümayişçilər «rədd olsun Xruşşov, yaşasın Stalin» şüarı ilə çıxış etmişdilər. 1963-cü ildə Sumqayıtdakı qarışıqlığın da Xruşşova qarşı yönəlməsinin arxasında məhz Xruşşovu devirməyə hazırlaşan xüsusi xidmət orqanlarının – DTK-nın dayandığı şübhə doğurmur. Xruşşov DTK-nı Stalinin zamanındakı səlahiyyətlərindən məhrum etmişdi, buna görə də DTK onun hakimiyyətdən uzaqlaşdırılmasında əsas rol oynamışdı. O zaman da sovet xüsusi xidmətləri bu tipli təxribatın həyata keçirilməsi üçün məhz Sumqayıtı seçmişdilər. Görünür, 1988-ci ildə də təxribat üçün məhz Sumqayıtın seçilməsinin tarixi əsaslarının və DTK-nın təcrübəsinin olması az rol oynamayıb. 1963-cü ildəki təxribat da, 1988-ci ildəki talan-təxribat da, azərbaycanlıların Ermənistandan qovulması, Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi və Kremldəki siyasi qruplaşmaların hakimiyyətini qoruyub saxlamağa çalışan güc strukturları ilə onların idarəetmə səlahiyyətlərini məhdudlaşdırmağa çalışan siyasi qrup arasında mübarizənin nəticəsi idi.

Sonrakı illərdə Sumqayıtda əhalinin artım tempi daha da güclənmiş, sakinlərin sayı 1970-ci ildə 135000-ə, 1988-ci ildə 258200-ə çatmışdı (189, 24–25; 2, 186). Sumqayıt şəhərinin əhalisinin ortaillik artımı 70–80-ci il-

lərdə altı-yeddi min arası təşkil etmişdi. 1981–1991-ci illərdə şəhərdə həbs yerlərindən azad edilmiş 2812 adam məskunlaşmışdı. Onlardan üçdə biri 1987–1988-ci illərdə buraya gəlmişdi (189, 31–32).

Sumqayıtın iri sənaye, mədəniyyət, elm mərkəzinə çevrilməsində keçmiş SSRİ-nin müxtəlif regionlarından gəlmiş xalqların nümayəndələrinin xidmətləri vardır. Bu şəhər əhalisinin milli tərkibində də özünü göstərmişdir. Belə ki, 1959-cu ildə burada 10-dan artıq millətin nümayəndəsi yaşayırdısa, 1970-ci ildə onların sayı 15-ə, 1979-cu ildə 77-yə, 1989-cu ildə isə 81-ə çatmışdı (189, 9; 2, 189–190). Buna baxmayaraq, şəhər əhalisinin mütləq əksəriyyətini azərbaycanlılar təşkil edirdi. 1979-cu ilin əhali siyahıyaalınmasının nəticələrinə görə azərbaycanlılar ümumi şəhər əhalisinin 68,8 faizini, ruslar 18 faizini, ermənilər 6,7 faizini təşkil edirdilər (9, v.71). Şəhər əhalisinin əsas artım mənbəyini də milli ayrı-seçkilik ucbatından Ermənistan SSR-dəki dədə-baba yurdlarını tərk edən azərbaycanlılar təşkil edirdi. İkinci Dünya müharibəsindən sonra Sovet hökumətinin həyata keçirdiyi ermənilərin repatriasiyası siyasəti nəticəsində yurd-yuvalarından qovulmuş azərbaycanlıların bir çoxu üçün Azərbaycanın digər regionları kimi, Sumqayıt və Abşeronun yaxın əraziləri də yeni vətən oldu. Təbii ki, onların yaddaşında Ermənistan SSR-də onlara qarşı tətbiq edilmiş milli ayrı-seçkiliyin acı xatirələri özünə yer tapmaya bilməzdi. 1988-ci ilin fevralında təxribatçı qüvvələr də bundan detanator kimi istifadə etməyə cəhd göstərmişdilər.

Şəhər əhalisinin orta yaş həddi 25 il təşkil edirdi, özü də hər beş sakindən birinin məhkumluğu var idi (207, 57). Hadisələr ərəfəsində burada 1500-dən çox əvvəllər məhkum olunmuş şəxs yaşayırdı və onlar 1987-ci ildə cinayət məsuliyyətinə cəlb olunmuşların 30,9 faizini təşkil edirdilər (9, v.74).

Ermənilərin Sumqayıtda ilk məskunlaşması da elə 30–40-cı illərə təsadüf edir. Sumqayıtlı müəlliflərdən H.Sadıqov, R.Məmmədov və H.Alıyev ermənilərin Sumqayıtda məskunlaşmasından 1988-ci ilin məlum hadisələrinə qədər onların hansı şəraitdə yaşadıqları ilə bağlı çox maraqlı faktlar üzə çıxarmışlar. Sumqayıtın əsası qoyulandan buradakı müəssisələrin rəhbər işçiləri arasında, bir qayda olaraq, ermənilər üstünlük təşkil etmişlər. Özü də bu vəzifələr aşağı və ya orta səviyyəli deyil, ən yüksək vəzifələr (zavod direktoru, baş mühəndis, direktor müavini, idarə rəisi, baş mühasib, partkomun sədri və s.) hesab olunurdu. Ermənilər müxtəlif vaxtlarda şəhər ida-

rəetmə orqanlarında, ticarət və iaşə obyektlərində də ən yüksək vəzifələri tutmuşdular. Bu vəzifələrin adicə sadalanması çox şeylərdən xəbər verir. Dövlət Bankının sədri, Sənaye Bankının sədri, xəstəxananın baş həkimi, mağaza müdiri, sovxoz direktoru, daş karxanasının müdiri, şəhər ticarətinin direktoru, ictimai iaşə trestinin müdiri, stadionun direktoru, şəhərin baş arxitektoru, mədəniyyət və istirahət parkının direktoru, ağac emalı zavodunun direktoru və s. (189, 147–148). Partiya, sovet, komsomol, həmkarlar, inzibati-hüquq, kommunal, tikinti, maarif, səhiyyə, idman və b. sahələrdə də ermənilər ən yüksək vəzifələrdə çalışırdılar.

Məlum Sumqayıt hadisələrindən sonra ermənilər öz ənənələrinə sadiq qalaraq Sumqayıtda, bütövlükdə Azərbaycanda ermənilərə qarşı ayrı-seçkilik siyasəti yeridildiyini bütün dünyaya car çəkməyə başladılar. S.Zolyan familiyalı birisi həyasızcasına bəyan etmişdi ki, «Sumqayıt sovet Azərbaycanında 70 il hökm sürən milli zülm siyasətinin təbii nəticəsidir» (203, 8–9).

H.Sadıqovun və R.Məmmədovun kitabında Sumqayıtda ermənilərin belə «ayrı-seçkiliyə məruz qalması»nı sübut edən bir sıra maraqlı faktlar da toplanmışdır. Belə görünür ki, əhalinin maddi-rifah halının bir sıra göstəricilərinə görə ermənilər Sumqayıtda azərbaycanlılardan qat-qat yaxşı şəraitdə yaşayırmışlar. Şəhərin, demək olar ki, bütün erməni əhalisi öz şəxsi mənzillərində yaşayırdılar. Bu, əslində, şəhər rəhbərliyinin «xüsusi siyasəti»nin nəticəsi idi. 60–70-ci illərdə Sumqayıt şəhər icraiyyə komitəsinin mənzil məişət komissiyasının sədri, pasport-masa rəisi erməni millətinin nümayəndələri idilər. Bu zaman «naxalstroy» adlandırılan gecəqondularda 1988-ci ilin əvvəlinə olan məlumatlara görə 2150 ailə yaşayırdı ki, onlardan 1331 ailə «ölü zonada» məskunlaşmışdı. Bu ailələr içərisində bircə dənə də olsun erməni ailəsi yox idi (189, 146). Şəhər əhalisinin telefon rabitəsi ilə təminat səviyyəsi 20% təşkil etdiyi halda, ermənilərin yaşadıqları mənzillərin əksəriyyətində telefonlar quraşdırılmışdı. 1988-ci ildə şəhər əhalisinin ixtiyarında olan 5809 şəxsi avtomobildən 592 (10 faizdən çoxu) ermənilərə məxsus idi. 1987-ci ildə əhalinin əmanət kassalarında saxladığı əmanətlərin ümumi həcmi 115700000 idi ki, onun 25000000 manatı (21,6 faizi) ermənilərin idi. Halbuki, ermənilər şəhər əhalisinin ümumi sayında yalnız 5,6 faiz təşkil edirdilər (189, 146). Bu, ermənilərin Sumqayıtda necə «ağır», «dözülməz» şəraitdə yaşadıqlarını açıq sübut edir. Məhz onlar üçün yaradılmış belə münbit şəraitin nəticəsi

idi ki, Sumqayıt şəhəri təşəkkül tapandan Dağlıq Qarabağın erməni əhalisinin buraya kütləvi axını başlamışdı. Bunu Z.Balayan da təsdiq edir. O, hətta Sumqayıtda fəhlələrin əsas dilinin erməni dili olduğunu, 1988-ci ilin fevralında şəhərdə 20000 ermənin yaşadığını, onların əksəriyyətinin «Arsaxdan» (Dağlıq Qarabağdan – İ.M.) gəldiyini qeyd edir (85).

Şəhər əhalisinin tərkibində ermənilərin sayının artım dinamikası da erməni təbliğatının iç üzünü bir daha ifşa edir. Şəhərin erməni əhalisi 1959–1970-ci illərdə 7031 nəfərdən 13,268 nəfərə (təqribən 2 dəfə artmışdır) çatmış, sonrakı illərdə onların sayı sabit qalmışdı.

XX əsrin 80-ci illərində Bakıdan sonra Azərbaycanın ikinci sənaye şəhəri olan Sumqayıtın respublika sənaye potensialında xüsusi çəkisi 11 faizə çatmışdı. Lakin 1985-ci ildə SSRİ-ni bürüyən sosial-iqtisadi böhran Sumqayıta da öz mənfi təsirini göstərdi. Təsərrüfat əlaqələrinin qırılması, müqavilə öhdəliklərinin yerinə yetirilməməsi şəhər sənayesinin getdikcə tənəzzülə düşməsinə gətirib çıxarırdı. 1985–1986-cı illər ərzində mənfəət üzrə tapşırıqlar yerinə yetirilməmiş və nəticədə 40000000 manat az mənfəət götürülmüşdü. Hər üç sənaye müəssisəsindən biri geridə qalanlar sırasında olmuşdu. Boru-prokat zavodunda daha ağır vəziyyət yaranmış, burada zərər 48000000 manat təşkil etmişdi. Sintez kauçuk birliyində isə zərərin miqdarı planda nəzərdə tutulduğundan 2,3 dəfə çox olmuşdu (65).

Şəhərin sosial sahədəki inkişafında da xoşagəlməz amillər özünü göstərirdi. Vaxtilə şəhərin inkişaf perspektivlərində kobud səhvlərə yol verilmişdi. Son beşilliyin əvvəllərində Sumqayıtın əhalisinin proqnozlaşdırılan sayı ilə faktiki sayı arasında fərq 100000 nəfər olmuşdu ki, bu da bütün sakinlərin 40 faizini təşkil edirdi. Son üç beşillik ərzində şəhər iqtisadiyyatı ancaq biryönlü inkişaf edirdi. Əhali, demək olar ki, iki dəfə, sənaye istehsalının həcmi də bu qədər artmışdı, lakin mənzil və sosial-mədəni obyektlər tikintisinin inkişaf sürəti, əslində, əvvəlki səviyyədə qalmışdı. Son beşillikdən əvvəlki on il ərzində şəhərdə adambaşına mənzil təminatında artım orta respublika göstəricisindən üç dəfə geri qalmışdı. 80-ci illərin sonunda şəhərdə 18000-dən çox ailənin mənzil şəraitini yaxşılaşdırmağa ehtiyacı var idi. 10000-dən çox ailə heç bir kommunal şəraiti olmayan, sənaye müəssisələrinin ərazisində özbaşına tikilmiş daxmalarda (gecəqondularda, naxalstroylarda) yaşayırdı. Məlum hadisələr ərəfəsində mənzil almaq növbəsində 16000-dən çox sumqayıtlı durmuşdu (hər üç ailədən biri). Onlardan yarısı ilk mənzil almaq üçün növbə gözləyirdi və yaşayış

üçün heç bir elementar şəraitə malik deyildilər. Hər sakinə 11,4 kv.m. yaşayış sahəsi düşürdü (9, v.65).

«Naxalstroy» adlanan ərazilər xüsusilə ciddi sosial gərginlik yaradırdı. 70-ci illərin sonlarında müəssisə rəhbərləri işçi qüvvəsinə olan ehtiyacı ödəmək üçün respublikanın kənd rayonlarında kütləvi şəkildə fəhlələr qəbul etmiş, lakin onlara aid məişət şəraiti yaratmamışdılar. Buna görə də həmin insanlar özbaşına olaraq müəssisələrin ətrafında yöndəmsiz daxmalar tikməklə mənzil ehtiyaclarını qismən ödəməyə çalışmışdılar.

Hadisələr ərəfəsində şəhərdə 878 gecəqonduda 13000 nəfər yaşayırdı (9, v.66). Əgər 1970-ci ildə hər 10000 nəfərə 110 xəstəxana çarpayısı düşürdüsə, 1988-ci ildə bu rəqəm 85-ə enmişdi. Bu, orta respublika səviyyəsindən 13 və ümumittifaq normativindən 45 vahid az idi. Şəhərdə məktəblər çatışmırdı, uşaqların məktəbəqədər tərbiyə müəssisələri ilə əhatə olunması normativdə nəzərdə tutulmuş 85 faiz əvəzinə 33 faiz təşkil edirdi. Nəticədə, 20000 nəfərdən artıq uşaqlı qadın, yəni əhalinin 8 faizi ictimai istehsala cəlb edilməmişdi (65).

Şəhərlilərin xeyli qisminin, 70–80 faizinin yaşadığı yeni mikrorayonlar kompleks halda tikilməmişdi. Burada kinoteatrlar, kitabxanalar yox idi. Xidmət sahəsi obyektləri kifayət qədər deyildi, bu isə adamların narazılığına, yuxarı orqanlara çoxlu şikayətlər göndərilməsinə səbəb olurdu.

Şəhərdə xidmət sahəsində də vəziyyət çox dözülməz idi. Son illərdə pərakəndə əmtəə dövriyyəsinə dair planlar yerinə yetirilməmişdi. Adambaşına əmtəə dövriyyəsi orta respublika səviyyəsindən aşağı idi. 1987-ci ildə əhaliyə təqribən 1,5 milyon manat az xidmət göstərilmişdi. Bütün bunlar isə əhalinin pul gəlirləri ilə xərcləri arasında tarazlığa mənfi təsir göstərirdi (65).

Şəhər təsərrüfatında da işlərin vəziyyəti qənaətbəxş deyildi. Şəhərin su, elektrik, istilik, qaz ilə təmin edilməsi, abadlaşdırılma və yaşıllaşdırma məsələləri vaxtında həll edilmirdi (9, v. 67–68).

Ekoloji vəziyyət daha da kəskinləşmişdi, bu da əhalinin sağlamlığının qorunması məsələlərini xeyli mürəkkəbləşdirirdi. Şəhər üzrə xəstəliklərin təhlili göstərir ki, onlar arasında ən çox rast gəlinən respirator xəstəlikləri idi (56,7%). Eşitmə orqanlarının xəstəlikləri orta ittifaq göstəricilərindən 2,5 dəfə, görmə orqanlarının xəstəlikləri isə 2 dəfə artıq idi (9, v.68). Lakin real vəziyyət əhalidən gizli saxlanılırdı. Yalnız 1989-cu ilin əvvəlində SSRİ Nazirlər Sovetinin «1989–1995-ci illərdə Sumqayıt şəhərinin

sosial inkişafının sürətləndirilməsi haqqında» qərarda şəhərdə ağır ekoloji şəraitin mövcudluğu etiraf edilmiş, onun aradan qaldırılmasının zəruriliyi vurğulanmışdı. Vaxtilə gəlir xatirinə kimya sənaye müəssisələrinin bir yerdə cəmləşməsi, müasir texnika və texnologiyalardan istifadə edilməməsi, adi sanitar qaydaların, istehsal qaydalarının kobud şəkildə pozulması nəticəsində Sumqayıt ekoloji çirklənməyə məruz qalmış şəhərlər arasında keçmiş SSRİ-də ilk yerlərdən birini tuturdu. Uşaq ölümü o qədər yüksək (hər 1000 uşağa 33 ölüm) (9, v.68) idi ki, şəhərdə, hətta xüsusi olaraq uşaq qəbiristanlığı yaranmışdı (207, 57). Rəsmi hesabatlara görə hər il Sumqayıtın sənaye müəssisələrindən 965000 ton zəhərləyici maddələr, o cümlədən 853000 ton bərk zəhərləyicilər, 13000 ton epoksid kükürdü, 11000 ton kömür tozu, 11000 ton azot turşusu, 8000 ton uqan üzvi birləşmələri tullanırdı. Şəhəri çirkləndirən 2477 müəssisədə havaya buraxılan zəhərli qazların ancaq yarıdan bir qədər çox hissəsini təmizləmək mümkün idi (3, 198). Sənaye müəssisələrinin çirkab suları təmizlənmədən Xəzərə axıdıldığından, dənizin Sumqayıt sahilləri güclü çirklənməyə məruz qalmışdı. Bütün bu amillər Sumqayıt şəhərinin sosial-iqtisadi, ictimai-siyasi vəziyyətinə mənfi təsir göstərir, şəhərdə kriminoloji şəraiti mürəkkəbləşdirirdi. Düşmən qüvvələr də öz təxribatçı əməllərini həyata keçirmək üçün Sumqayıtın məhz bu mürəkkəb vəziyyətindən istifadə etməyə qərar vermişdilər.

Bütün bunlar belə deməyə əsas verir ki, ermənilər və onların imperiya mərkəzindəki, eyni zamanda xaricdəki tərəfdaşları öz əməllərini həyata keçirmək üçün Sumqayıt şəhərini təsadüfən seçməmişdilər.

Hər şeydən əvvəl, Sumqayıt müxtəlif millətlərin yaşadığı sənaye şəhəri hesab edilirdi. Bu şəhərdə iğtişaşlar törətməklə Azərbaycan xalqına ləkə yaxmaq, onu dünya ictimaiyyətinin gözündə başqa xalqlara qarşı dözümsüz olan vəhşi xalq kimi təqdim etməklə ermənilərin əzabkeş obrazını gücləndirmək, ermənilərlə azərbaycanlıların birgə yaşamasının mümkünsüzlüyünə inandırmaq məqsədi güdülürdü.

Təsadüfi deyildi ki, hadisələrdən dərhal sonra Sumqayıt hadisələri haqqında çox peşəkarlıqla və operativliklə çəkilmiş kino-foto kadrları Ermənistan televiziyasında göstərməyə başlamışdılar. Kadrları şərh edən diktor açıq şəkildə deyirdi: «İndi siz, həqiqətən, inana bilərsiniz ki, erməni xalqı bir dövlətin tərkibində azərbaycanlılarla birgə yaşaya bilməz. Qarabağ probleminin yeganə həlli DQMV-nin Ermənistana verilməsidir» (148, 17).

Hadisələr ərəfəsində Sumqayıt şəhərində 258200 nəfər yaşayırdı ki, onların 24208-i erməni millətinin nümayəndələri idi. Sumqayıt erməniləri arasında öz gələcəyi və uşaqlarının taleyi üçün narahat olan, buna görə də erməni millətçilərinin antiazərbaycan ideyalarını açıq şəkildə dəstəkləməkdən imtina edənlər də var idi. Buna görə də onların bəziləri «Qarabağ» və «Krunk» kimi təşkilatlara üzvlük haqqı verməkdən imtina edirdilər. Sumqayıt hadisələrini törədənlər də məhz bu insanları qorxutmaq istəyirdilər.

Şəhər əhalisinin uzun illər yaşadığı və həllinə nail ola bilmədiyi sosial-iqtisadi, mənəvi problemlər, iş və məişət qayğıları, ekoloji vəziyyət və s. amillər insanların səbir kasasını daşırmış, hadisələrin qanun çərçivəsindən çıxmasına səbəb olmuşdu.

Nəhayət, hadisələr ərəfəsində Dağlıq Qarabağ ətrafında baş verən hadisələrlə bağlı Azərbaycan rəhbərliyinin doğru-dürüst mövqeyə malik olmaması, hadisələr haqqında ictimaiyyətin dolğun məlumatlandırılmaması və bundan doğan şayiələr də faciənin törədilməsində qığılcım rolunu oynadı.

### 3.2. Cinayətkar xarakterli siyasi təxribatın hazırlanması və həyata keçirilməsi

1988-ci il fevralın 28–29-da Azərbaycanın paytaxtı Bakı şəhərindən 25 kilometrlikdə yerləşən Sumqayıtda talanlar baş verdi. İki gün davam etmiş talanlarda 26 nəfər milliyyətcə erməni olan Azərbaycan vətəndaşı, 6 nəfər azərbaycanlı həlak oldu. Prokurorluğun məlumatına görə iğtişaşlar zamanı 197 nəfər, o cümlədən 100 hərbçi və milis işçisi ziyan çəkmişdi. Bədən xəsarəti alanlar arasında 54 erməni, 74 azərbaycanlı vardı. Bunlardan 12-i qadın idi (9, v.34). 200 mənzil talan edildi, 50-dən artıq mədəni-məişət obyekti dağıdıldı, 40-dan çox avtomobil zədələndi və yandırıldı, dövlətə o zamankı qiymətlərlə 7 milyon rubl məbləğində maddi ziyan vuruldu.

Daxili işlər orqanlarının gücü ilə iğtişaşları dayandırmaq mümkün olmadığından fevralın 28-də Müdafiə Nazirliyi və Daxili İşlər Nazirliyinin qoşunları çağırılmış, martın 1-ə onların sayı 9000-ə çatdırılmış, həmin gün şəhərdə komendant saatı tətbiq edilmişdi. Yalnız bundan sonra şuluqluqları dayandırmaq və nəzarəti təmin etmək mümkün olmuşdu (9, v.34).

Saxlanılmış və inzibati məsuliyyətə cəlb edilmiş 444 nəfərdən 326-sı Sumqayıt sakini idi. Həbs edilmiş 83 nəfərin 90 faizi də sumqayıtlı idi ki,

onlardan 22-si heç yerdə işləmirdi, 9-u əvvəllər məhkum olunmuşdu (9, v.52). İğtişaşları araşdırmaq üçün SSRİ Baş Prokurorluğu tərəfindən18/55461-88 nömrəli cinayət işi açıldı. 444 nəfər məhkəmə qarşısında cavab verməli oldu, onlardan 400 nəfəri 10–15 sutka təcridxanalarda saxlanmış, bir neçəsi uzunmüddətli həbs cəzasına, bir nəfəri – Əhməd Əhmədov isə güllələnməklə ölüm cəzasına məhkum edilmişdi.

Sumqayıt hadisələrini yalnız quru rəqəmlərin dili ilə izah etmək yanlış olardı. Bir-birinin ardınca baş vermiş hadisələrin məntiqi, bu hadisələrin erməni millətçiləri tərəfindən törədildiyini, prosesin isə SSRİ-nin ali hakimiyyət eşelonu tərəfindən idarə edildiyini təsdiqləyir.

Hadisə haqda məlumatlar bütün dünyanın kütləvi informasiya vasitələrinə yayıldı və dünyaya azərbaycanlıların ermənilərə qarşı qəddarcasına talançılığı kimi təqdim edildi. Ancaq hələ heç kəs, hətta azərbaycanlılar özləri belə hadisələr haqda kifayət qədər məlumata malik deyildilər. Sumqayıt faciəsi özünün siyasi nəticələrini verdi: Ermənistan və dünyanın müxtəlif ölkələrindəki erməni diasporları Qarabağın Azərbaycandan qoparılıb Ermənistana birləşdirilməsi üçün bəhanə əldə etdilər. Azərbaycanın və azərbaycanlıların imici korlandı.

Əgər qədim romalıların klassik ifadəsi olan, «bu kimə sərfəli idi» sualına cavab axtarılsa, o suala birmənalı olaraq belə cavab vermək olar: «Qarabağı Azərbaycandan qoparmaq istəyənlərə!»

Sumqayıt hadisələri haqqında minlərlə məqalə yazılsa da, 1988-ci ilin fevralında bu hadisələrin nədən baş verdiyi, ilhamçılarının və təşkilatçılarının kim olduğu hələ də müəmmalı qalır. Nədən hadisələr baş verməmişdən bir neçə gün əvvəl bütün erməni «sexovşik»ləri şəhəri tərk etmiş və buraya erməni kinemotoqrafçıları gəlmişdilər? Talançılarda ermənilərin yaşadıqları evlərin və mənzillərin ünvanları haradan idi? (148, 15) Bu suallara cavabları həmin hadisələrdə və ondan sonra baş vermiş proseslərdə axtarmaq lazımdır.

Qarabağ ətrafında cərəyan edən proseslər, mərkəzi və respublika rəhbərliyinin təslimçi mövqeyi, Ermənistan SSR-dən azərbaycanlıların kütləvi qovulması Azərbaycanın hər yerində ciddi narahatlıq yaratmışdı. Hadisələrin əsl mahiyyəti haqqında bilgisi olmayan əhali təşviş içində idi. Sumqayıt şəhərində də vəziyyət çox gərginləşmişdi. Ermənistanın 20 rayonundan təkcə Sumqayıta 18330 nəfər (3030 ailə) gəlmişdi (103, 132). Baxmayaraq ki, ermənilər Azərbaycanda sakit işləməkdə, yaşamaqda

davam edirdilər. Qaçqınların əksəriyyətinin vəziyyəti çətin idi, onların sifətlərində zorakılıq halları açıq-aşkar görünürdü.

1988-ci il fevralın 26-da Sumqayıtda Lenin meydanında, şəhər partiya komitəsinin qarşısında 40–50 nəfərlik qrup nümayişə çıxaraq Dağlıq Qarabağ hadisələri ilə bağlı kortəbii etirazlarını bildirməyə başladılar. Etiraz mitinqlərinin əsas iştirakçıları ilk vaxtlar Ermənistandan qovulmuş azərbaycanlılar idi. Yeri gəlmişkən, Sumqayıtda müxtəlif vaxtlarda Ermənistandan deportasiya olunmuş azərbaycanlıların böyük hissəsi yerləşmişdi və heç şübhəsiz, onların hafizəsində Ermənistanda onlara qarşı tətbiq edilmiş zülm və təhqirlərin acı xatirəsi yaşayırdı. Fevralın 27-də, şənbə günü yenidən kortəbii mitinq keçirildi, mitinqçilərin sayı artaraq min nəfərə çatdı. Şəhərdə ilk zorakılıq halları da həmin gün bazarda və kinoteatrın qarşısında baş verdi. Baş verən hadisələrlə bağlı əhalinin məlumatlandırılmaması şayiələrin yayılmasına, ehtirasların coşmasına şərait yaradırdı. Mitinqçilər qarşısında şəhər partiya komitəsinin katibi M.Bayramova, İcraiyyə Komitəsinin sədri T.Məmmədov, Azərbaycan KP MK katibi H.Həsənov və şöbə müdiri M.Əsədov çıxış etdilər ( 9, v. 57). Yalnız həmin günün axşamı Əsgəran faciəsindən beş gün sonra SSRİ-nin baş hərbi prokurorunun müavini Aleksandr Katusev Azərbaycan televiziyası ilə çıxış edərək Qarabağda baş verən hadisələr haqqında çox da dolğun olmayan məlumat verdi. Rəsmi olaraq ilk dəfə onun dilindən Əsgəranda iki azərbaycanlının öldürülməsi haqqında informasiya getdi. Qarabağda azərbaycanlıların öldürülməsi xəbəri vəziyyətin onsuz da gərgin olduğu Sumqayıtda geniş əks-səda doğurdu.

Hadisə şahidlərinin verdiyi məlumatlara görə talanlar ərəfəsində şəhərdə telefon rabitəsi pozulmuş, bəzi mikrorayonlarda elektrik enerjisinin verilməsi dayandırılmışdı (175). Maraqlıdır ki, həmin A.Katusev bir neçə gündən sonra «telefon» məsələsini uydurma adlandırmışdı, bu da hadisələrin, guya, kortəbii halda baş verməsi haqqında ssenarilərə uyğun idi.

Növbəti gün, fevralın 28-də saat $12^{30}$-da Lenin meydanında daha kütləvi, 5000 nəfərlik mitinq baş verdi. Məzuniyyətdən yarımçıq qayıtmış şəhər partiya komitəsinin I katibi C.Müslümzadənin, şəhərin digər rəhbərlərinin əhalini sakitləşdirmək cəhdləri bir nəticə vermədi. Xalq şairi B.Vahabzadənin mitinqdə əhaliyə müraciəti də mitinqçiləri sakitləşdirə bilmədi.

Tomas de Vaalın Sumqayıt hadisələrinin şahidlərinə istinadən yazdığına görə, nümayəndələr C.Müslümzadənin əlinə bayraq verərək birlikdə şəhərin küçələri ilə yürüməyə başladılar. Dəstənin qabağında gedən

C.Müslümzadə kütləni əvvəlcə şəhərin qərbinə, sonra isə cənuba – Dostluq küçəsinə apardı; daha sonra isə kütlə şərqə dəniz tərəfə döndü. Sonralar Müslümzadə deyirdi ki, onun məqsədi daha böyük fəlakətin qarşısını almaq üçün kütləni şəhərin mərkəzindən uzaqlaşdırmaq idi. Lakin hər şey əksinə alındı. Şuluqluqlar məhz mərkəzdə başladı. Kolonun quyruq hissəsi ayrı-ayrı qruplara bölünərək şəhərin mərkəzi məhəllələrinə dağıldı (207, 58–55).

Hadisələrin əsas episentri isə Dostluq və Sülh küçələrinin kəsişməsində yerləşən şəhər avtovağzalı kvartalı oldu (207, 59). Həmin gün saat $23^{00}$-da Bakı hərbi dəniz məktəbinin kursantları, yarım saat sonra ordu və daxili qoşun hissələri şəhərə gətirildi (9, v.59).

Şəhərdə vəziyyəti normallaşdırmaq üçün gəlmiş Azərbaycan KP MK katibi H.Həsənovun və respublika nazirlər sovetinin sədri H.Seyidovun mitinqçilər qarşısında çıxışları da bir nəticə vermədi. Mitinqlər növbəti gün – ayın 29-da saat $11^{30}$-da da davam etmiş, 7000 nəfərlik mitinqin qarşısında şəhərin komendantı təyin edilmiş general V.S.Krayev və birinci katib C.Müslümzadə çıxış etmişdilər.

P.Lukimson hadisələrin başlanması ilə bağlı yazır ki, mitinqdə ermənilərin DQMV ilə bağlı avantürist hərəkətləri müzakirə olunur. Ermənistanda yaşayan azərbaycanlılara qarşı vəhşiliklərə, ermənilərin haqsız iddialarına göz yuman Moskvanın mövqeyi pislənirdi. Bu zaman mitinqçilər arasına saçlarını üzünə tökmüş, cırıq paltarlı bir qadın soxularaq üzgözünü cıra-cıra ermənilər tərəfindən zorlandığını bildirdi. Gərgin vəziyyətdə olan qaçqınlar və gənclər üçün bu kifayət idi. Haradansa peyda olmuş şəxslər mitinqçilər arasında spirtli içki və narkotik maddələr paylamağa başladılar. Bundan sonra şəhərin küçələri ilə hərəkət edən kütlə, qarşısına çıxan mağazaları və araq köşklərini dağıtmağa başladı. Sonra kütlə iki hissəyə ayrıldı, onlardan birini üç məhkumluğu olan Qriqoryan öz ardınca aparmağa başladı. Məhz bu qrup öz qəddarlığı ilə seçilirdi. 28 qurbanın hamısı, vəhşi zorlamalar və talanlar da onların vicdanında idi. Digər qrup üzvləri yalnız soyğunçuluqla məşğul olur, ermənilərin evlərinə daxil olaraq, mebelləri dağıdır, qiymətli şeyləri götürürdülər (148, 16).

Daha sonra o yazır ki, əgər öz mənzillərində qonşuları olan erməniləri gizlədən yüzlərlə azərbaycanlı olmasaydı, yəqin ki, qurbanların sayı daha da çox ola bilərdi (148, 16). Mitinq və nümayişlər şəhərdə hakimiyyət orqanlarının işini iflic vəziyyətə salmış, vəziyyət nəzarətdən çıxmışdı.

1988-ci il 27–28 fevral Sumqayıt hadisələrinin kökündə «Krunk» və «Qarabağ» təşkilatlarının erməni millətçi hərəkatı üçün vəsait topladığı, ümumi büdcəyə pul ödəməyənləri isə cəzalandırmaq qərarına gəldikləri, elə buna görə də Sumqayıtda evinə hücum edilən ermənilərin məhz «Krunk» təşkilatına pul ödəməyən ermənilər olmaları haqda fikirlər səslənirdi. Təhqiqat briqadasının əldə etdiyi maddi sübutlar da bunu təsdiq edirdi (11, 95–96). Onlar həm də sübut edirdi ki, törədilmiş talanlar təsadüfi deyildir. O məqam da diqqəti cəlb edirdi ki, talanlar başlamazdan əvvəl imkanlı ermənilərin əksəriyyəti Sumqayıtı tərk etmiş, şəhərdə qalan ermənilərdən də hamısı deyil, bəziləri zərər görmüşdü. Zərərçəkənlər isə ümumi kassaya pul ödəməkdən imtina edənlər idi. Erməni millətçiliyi tarixində ermənilərin bu variantdan istifadə etdikləri haqda tutarlı faktlar var. Məlum olduğu kimi, 1918-ci ildə daşnaklar Azərbaycanın bir sıra bölgələrində müsəlman əhalini soyqırımına məruz qoymuş, saysız-hesabsız vəhşiliklər törətmişlər. Erməni vəhşiliyindən ziyan çəkən bölgələrimizdən biri də Quba qəzası olmuşdu. O zaman da Şaumyanın göstərişi ilə Amazaspın başçılığı altında Qubaya göndərilmiş erməni quldur dəstələri hücum etməmişdən əvvəl şəhərdə yaşayan varlı ermənilər öz əmlaklarını sataraq şəhəri təcili tərk etmişdilər. Onlardan bunun səbəbini soruşduqda cavab vermişdilər ki, Bakıda yaşamaq istəyirlər. Sonralar onların kütləvi şəkildə şəhəri tərk etmələrinin səbəbi aydın olmuşdu. Bakıdan göndərilmiş erməni bandalarının hücum edəcəyini onlara əvvəlcədən xəbər vermişdilər. Ermənilərin bu xəyanətkar hərəkətləri haqqında məlumatları Quba hadisələrinin canlı şahidləri olmuş insanlar da sonralar təsdiq etmişdilər (187, 177–181). 1918-ci ildə Qubada olduğu kimi, Sumqayıtda da məlum hadisələr əvvəlcədən planlaşdırılmış, yerli ermənilər xəbərdar edilmişdi. Tiflis jandarmeriya idarəsinin rəisi general-mayor Debilin imzası ilə 1903-cü ildə hazırlanmış hesabatda Vaqan Acavelyants adlı erməni arximandritinin fəaliyyəti haqda ətraflı qeyd edilib. Erməni Qriqorian kilsəsinin keşişi, eyni zamanda «Daşnaksütyun» partiyasının üzvü olan bu şəxs erməni hərəkatının təbliğatını təşkil edirmiş. «Bu məqsədlə şəhərdə və qəzalarda pul yığır, eyni zamanda bu işə kilsənin pullarını da xərcləyir». Hesabatda göstərilir ki, pulların yığılmasını gizlətmək üçün yerli kasıb aktyor Akop Melikyantsın teatrına bilet satışı təşkil olunur. Biletin üzərində Türkiyə erməniləri ilə qardaşlığı əks etdirən rəmz – iki əlin görüşməsi təsviri yerləşdirilir. Ruhani idarənin iclasları tez-tez təşkil edilirdi və orada dini məsələlər deyil, erməni millətçi hərəkatının forma-

laşdırılması məsələləri müzakirə edilirdi. İclaslarda erməni inqilabçılarının «Дрошшак» və «Гнчак» adlı jurnallarını oxuyurdular.

Hesabatda erməni millətçilərinin Sumqayıtdakı davranışları ilə paralellik yaradan çox mühüm bir məqam var. General-mayor Debil yazır: «Arximandritin pulyığanları pul verməkdən imtina edən şəxslərə qarşı aşağıdakı terror üsullarından istifadə edirlər: vəsait ödəmək zərurəti haqda, əks-təqdirdə pis olacağına dair təhdidedici xəbərdarlıqdan sonra həmin adam qarətə məruz qalır və soyğunçular himayədarları olduğu üçün tapılmırlar. Eyni zamanda, hətta qarətin səbəbi və soyğunçuların şəxsiyyəti bəlli olsa belə, zərərçəkmişlər qorxudan hər şeyi gizlədirlər» (37, 518, 519).

Bu məqam iki mühüm nəticə çıxarmağa imkan verir. Birincisi, ermənilər kilsə mülkiyyətinin dövlət mülkiyyətinə keçirilməsi haqqında çarın fərmanına qarşı çıxmaq üçün millətçi erməni hərəkatını təşkil edirlər. Yəni məqsəd erməni xalqını deyil, kilsənin mülkiyyətini xilas etmək idi. İkincisi, bu məqsədlə pul yığılır və pul verməkdən imtina edən ermənilər cəzalandırılırdı. Bütün bunlar 1988-ci ildə Qarabağda və Sumqayıtda baş verən hadisələrə tam oxşar ssenarilərdir. Bundan əlavə, general-mayor Debilin 1903-cü ildə yazılmış hesabatında Sumqayıt hadisəsi ilə oxşarlıq təşkil edən daha bir məqam var. Sumqayıtda 1988-ci ildə olduğu kimi, 1903-cü ildə Tiflisdə də erməni millətçi hərəkatı öz məqsədlərini həyata keçirmək üçün cinayətkar elementlərdən istifadə etmişdilər. General Debilin hesabatından: «Erməni əhalisinin ən kasıb və ən qara hissəsində populyarlığa nail olaraq onları hərəkata hazırlayır, onların müşayiəti ilə erməni əhalisinin pozğun ünsürləri ilə görüşür, onlarla içir, kart oynayır, ruhlandırıcı çıxışlar edir, evə səhər saat 5–6 radələrində qayıdır» (37, 520).

Sumqayıt hadisələrində də erməni millətçiləri pozğun elementlər və cinayətkarlardan istifadə etməyə üstünlük vermişdilər. Və oxşar ssenari Bakı və Sumqayıtda da müşahidə edilmişdi. Məsələn, Azərbaycan SSR-in Dövlət Təhlükəsizlik Komitəsinin hadisələrlə bağlı əməliyyat yazışmalarında 11 mart 1988-ci ilə aid olan bir əməliyyat məlumatı var. Məlumatda yazılır: «8–10 mart tarixlərində Bakıdakı erməni kilsəsinin dyakonu S.S.Davityan Ermənistanda olmuş, Katalikos I Vazgenin iqamətgahında ieromonarxlar İsaxanyan, Mkrtçyan və dyakon Matevosyanla görüşmüşdü. Söhbət əsnasında sonuncular Bakıda və Sumqayıtdakı vəziyyətlə, DQMV ilə bağlı məsələdə Bakı ermənilərinin tutduqları neytral mövqe ilə maraqlanmış və demişdilər ki, onlar qorxaqdırlar, böyük işlər görməyə qadir deyillər, çünki «böyük işlər böyük qurbanlar tələb edir». Sonra Da-

vityanın «Ermənistanda əhalinin çıxışları Bakı ermənilərinin vəziyyətinə təsir göstərə bilər» iradına onlar cavab vermişdilər ki, bunda heç bir qorxulu şey yoxdur, onları (Bakı ermənilərini – İ.M) DQMV uğrunda, Qarabağla bağlı planlar uğrunda qurban vermək olar. 11 mart 1988-ci il. (8)

Daha bir misal: 1980-ci ildə Afinada türk səfirinin ölümünə görə məsuliyyəti öz üzərinə götürmüş ASALA terror təşkilatının liderlərindən biri olan Akop Akopyan 1980-ci il avqustun 1-də «Nyu-York Tayms» qəzetinə verdiyi müsahibədə demişdi: «Bizim düşmənimiz türk rejimi, NATO və bizimlə əməkdaşlıq etməyən ermənilərdir». Bu fakt da erməni millətçi və terror təşkilatlarının öz millətlərindən olan şəxsləri təxribatlarda qurban verməklə təcavüzkar hədəflərinə yetişməyi məqbul hesab etdiklərinin növbəti sübutudur.

Bizim eranın 64-cü ilində iyulun 18-də Romada yanğın törədildi. Bu yanğından sonra imperator Neron Romanın və hakimiyyətin ən qatı düşməni sayılan xristianları təqib etmək üçün əlverişli imkan qazandı. Xristianların həbsi və qırğını prosesi başlandı.

1933-cü il fevralın 27-də alman faşistləri Reyxstaqda yanğın törədərək bunda siyasi rəqiblərini günahlandırdılar və siyasi təqiblərə start verildi. Nəticədə, Reyxstaqdakı yanğından sonra Almaniyada faşistlərin hakimiyyəti xeyli möhkəmləndi. Faşist partiyası rəqiblərinin məhkəməsini mətbuatda geniş işıqlandıraraq zorakı yollarla seçkilərdə üstünlüklərini təmin etdilər.

Yenə fevralın 27-də, ancaq bu dəfə 1988-ci ildə Azərbaycanın Sumqayıt şəhərində Ermənistanın və Dağlıq Qarabağın erməni radikal millətçiləri, Rusiyanın, Avropa və Amerikanın erməni diasporları, SSRİ xüsusi xidmətlərinin və siyasi rəhbərliyinin gizli dəstəyi ilə milli zəmində talan təşkil edərək bunda azərbaycanlıları günahlandırdılar. Bununla da, ermənilərin kompakt yaşadığı Dağlıq Qarabağ vilayətinin Azərbaycandan alınıb Ermənistana birləşdirilməsi üçün əlverişli siyasi zəmin yaratdılar.

Romadakı yanğından sonra xristianlar uduzmuş, Neron isə mövqeyini necə möhkəmləndirmişdisə, Reyxstaqdakı yanğından sonra nasional sosialistlər rəqiblərini mühakimə edib hakimiyyəti necə ələ almışdılarsa, Sumqayıt hadisələrindən də sonra ermənilər artıq sakitləşməkdə olan Dağlıq Qarabağda separatizm ideyasını, eləcə də bütün dünyada, o cümlədən Moskvada alovlandırmaq üçün imkan əldə etdilər. Nasional sosialistlər Leypsiqdə kommunistlər üzərində açıq məhkəmə keçirməklə özlərinin

hakimiyyəti qəsb etmələrinə haqq qazandıran ictimai rəy formalaşdırdılar. Ermənilər isə Moskvadakı dayaqları vasitəsilə Əhməd Əhmədov və daha 3 nəfər azərbaycanlı üzərində Moskvada tələsik, açıq məhkəmə təşkil etməklə antiazərbaycan əhvali-ruhiyyəsini gücləndirdilər. Məhkəmənin gedişi zamanı SSRİ rəhbərliyi paytaxtda həftələrlə mitinq keçirən ermənilərə hər cür imkanlar yaradırdı. Tarix təkrarlanırdı. 64-cü ildə Romada baş vermiş, 1933-cü ildə Berlində təkrarlanmış tarix bu dəfə əyalət şəhəri Sumqayıtda təkrarlansa da, onun təsiri Moskva, Vaşinqton, Paris və Brüsseldəki proseslərə hesablanmışdı.

Sumqayıtda baş verənlərlə Fərqanə hadisəsi ilə oxşarlıqlar da aydın görünür. Başqa bir məqam. Sumqayıt talanları ərəfəsində və həmin günlərdə Sumqayıtda görünmüş gəlmə və şübhəli şəxslərin sonradan Özbəkistana getməsi haqda başqa mənbələr də məlumat verir. Ən maraqlısı odur ki, Sumqayıtdan sonra 4 dekabr 1988-ci ildə Daşkənddə antirus və antitatar şüarlarla kütləvi mitinq keçirildi. 14 dekabr 1988-ci ildə Əndicanda antirus vərəqələr yayıldı. 16–19 mayda Fərqanədə, 1989-cu ilin 18–23 fevralında Daşkənddə özbək gəncləri ilə qeyri-özbəklər arasında toqquşma oldu. Maraqlı o idi ki, Özbəkistanda da Sumqayıtdakı ssenari oynanılırdı. Sumqayıtda talan ərəfəsində naməlum adamlar ermənilərin azərbaycanlılara qarşı vəhşilikləri haqda qorxunc məlumatlar yayırdılar. Fərqanədə isə türk talanları ərəfəsində, guya, məhsəti türklərinin özbəkləri zorlaması və uşaqları tikə-parça edərək doğrayıb öldürməsi haqda yalan məlumatlar yayılır və bunun ardınca talanlar başlanır. Hər şey təəccüblü dərəcədə oxşardır.

Oxşar ssenarini təkcə Özbəkistanda deyil, Gürcüstanda, Tbilisidə də müşahidə edənlər vardı. Məsələn, Tbilisi hadisələri haqda yazan Viktor Nikolayev «Живый в помощи» əsərində qeyd edirdi. «Şəhərdə Sumqayıt və Qarabağ dəst-xətti özünü göstərməyə başladı... Viktor görürdü: «Sumqayıt–Qarabağ–Kirovabad ssenarisi işləməyə başlayırdı» (175).

Kaliniçenko qeyd edir ki, bütün baş verən hadisələr yerli hakimiyyət orqanları tərəfindən tam dəqiqliyi ilə idarə olunurdu. Təbii, biz çox gözəl başa düşürdük ki, əgər baş verənlər bir tərəf üçün əvvəlcədən təşkil olunmuş hadisə idisə, qarşı tərəf üçün bu, sadəcə, gözlənilməz idi. Elə hal-hazırda da müəyyən bir kütləni qızışdırıb kiməsə qarşı yönəltsək, nəticədə eynilə Sumqayıt, Oş və Fərqanədə baş verənlərin təkrarını alacağıq. Sumqayıt hadisələrinin öz-özünə baş verdiyini iddia etmək gülüncdür. Bu faciə məhz Dağlıq Qarabağ probleminin ortaya çıxdığı vaxt baş verdi (201, 168–169).



**EDUARD ROBERTOVİÇ QRİQORYAN**

**16 dekabr 1959-cu ildə Sumqayıt şəhərində doğulub. Milliyyətcə ermənidir. Həyat yoldaşı Rita Qəhrəmanyan da milliyyətcə ermənidir.**

**E.Qriqoryan 1988-ci ildə Sumqayıt şəhərində baş vermiş talanların icraçılarının rəhbəri və bilavasitə iştirakçısı olub. Şəxsən altı nəfərin qətlə yetirilməsində və zorlanmasında ittiham edilib. Bilavasitə Moskvaya tabe olan istintaq qrupu tərəfindən ittiham olunub və məhkəmə tərəfindən 12 il azadlıqdan məhrum edilib. Təşkilatçılığı ilə bağlı məqamların yenidən istintaqa qaytarılması haqqında qərar çıxarılıb. Eduard Qriqoryan 27 may 1990-cı ildə Rusiyanın Stavropol vilayətindəki 1 saylı istintaq təcridxanasına aparılıb. 18 avqust 1991-ci ildə Bakıdakı 1 saylı istintaq təcridxanasına qaytarılıb. 26 avqust 1991-ci ildə Yerevan şəhərindəki 1 saylı istintaq təcridxanasına göndərilib. Onun izi Yerevanda itir.**

---

Hadisələrin xronoloji ardıcıllıqla düzülüşü ilk baxışdan görünməz bir əlin hər iki tərəfi qızışdırdığını və Azərbaycan tərəfini təxribata çəkdiyini göstərir. Məsələn, fevralın ortalarında Stepanakertdə və Dağlıq Qarabağın başqa şəhərlərində müəssisələr tətil və mitinqlər təşkil edərək DQ-nin Ermənistan SSR-ə birləşdirilməsini tələb edirlər. Fevralın 19-da Bakıdan reaksiya gəlir, tələbələr çıxış edərək qeyri-qanuni ərazi iddialarına son qoyulmasını tələb edirlər. Fevralın 20-də Dağlıq Qarabağ Muxtar Vilayətinin İcraiyyə Komitəsinin sessiyasında vilayətin Ermənistana birləşdirilməsi haqda qərar elan edildi. Britaniyalı tədqiqatçı Tomas de Vaal yazır ki, bu hadisə Bakıda temperaturu qaldırdı. Sumqayıt hadisələrinin Dağlıq Qarabağdan gələn qıcıqlara reaksiya olduğu heç kimə sirr deyildi.

Talanlara isə antierməni xarakter verildi və azərbaycanlıların ermənilərə hücumu kimi təqdim olundu. Ancaq talanların araşdırılması təhqiq olunmamış çoxsaylı müəmmaları ortaya çıxardı. Ən birinci müəmma talanların başlanmasının səbəbkarı və sübut olunmuş faktlara əsasən talan zamanı bilavasitə 6 nəfəri şəxsən öldürmüş və zorlamış Eduard Qriqoryan adlı erməninin olması idi. Onun Dağlıq Qarabağdan gəlməsi ermənilərlə əlaqələri, əlində ermənilərin yaşadığı evlərin siyahısının olması, talan üçün residivistlərdən ibarət qrupu təşkil etməsi, zorakılıq və qətlləri mümkün qədər nümayişkaranə həyata keçirməyə cəhd göstərməsi haqda cinayət materiallarında kifayət qədər faktların olmasına baxmayaraq, is-

ЗАЯВЛЕНИЕ О ВЫДАЧЕ ПАСПОРТА

Форма № 1

1. Григорян Эдуард Робертович
фамилия, имя, отчество

2. 16 декабря 1959 года
число, месяц, год рождения

3. г. Сумгаит Азербайджанской ССР
место рождения—село, поселок, город, район, область, край, республика (по существующему административно-территориальному делению)

4. армянин
национальность

5. холост
семейное положение—если состоит в браке, указать фамилию, имя, отчество жены мужа, каким органом ЗАГСа и когда зарегистрирован брак;

Григорян Роберт Григорьевич, Григорян Валентина Акимовна
фамилия, имя, отчество отца и матери

6. город Сумгаит ул. С. Вургуна 1 микрорайон дом 122 кв 71
место жительства—наименование города, поселка, села, название улицы, дом №, корпус №, кв. №

7. не состоял
состоял ли ранее в иностранном гражданстве (подданстве) и когда принят в советское гражданство;
когда из какой страны прибыл в СССР в порядке реэмиграции, переселения и т. п.

Прошу выдать (обменять) паспорт в связи с увольнением с действ. сов. армии в запас
указать причину

26 марта 1979 г.
подпись

Подпись гр. Григорян заверяю
фамилия подпись

Паспорт выдать на основании свидетельства № 88
наименование документа

паспорта 1-ЖЕ № 661173 Сумгаитским отделением милиции Азерб ССР 28.01.76 г.
серия, номер, кем и когда выдан

Начальник паспортной службы
подпись

Паспорт оформил паспортист
подпись

Паспорт серии IX-ЖГ № 400153

от 10 апреля 1979 г. получил(а)
подпись

**Eduard Qriqoryanın pasport almaq üçün verdiyi ərizənin surəti. Ərizəsində o özü «milliyyət» xanasına «erməni» yazmışdır.**

tintaq onları araşdırmayıb. İstintaq həm də talanın arxa planda qalmış, amma istintaq əlamətləri bəlli olan təşkilatçılarını axtarmağa da cəhd göstərməyib, hətta onları ört-basdır etməyə çalışıb. İstintaq materiallarında təşkilatçılarla bağlı bütün izlər Yerevana, Stepanakertə, Daşkəndə və Moskvaya qədər uzanaraq oralarda itir. Biz bu izləri və istintaqın araşdırmadığı başqa suallara cavab axtarmağa çalışacağıq.

Talançı qrup Eduard Robertoviç Qriqoryan, Nadir Nəcəfov, Vaqif Hüseynov, Nizami Səfərov, Qalib Məmmədov, Əfsər İsayev, Elçin Gəncəliyev və s. olmaqla 20-dək adamdan ibarət idi. Demək olar ki, onların hamısı əvvəllər mühakimə olunmuşdular. Qrupun rəhbəri və lideri isə üç dəfə həbsdə olmuş residivist, şahid ifadələrindən göründüyü kimi qətiyyətli, hiyləgər, soyuqqanlı, başqalarını öz iradəsinə tabe etməyi bacaran, milliyyətcə erməni olan Sumqayıt sakini Eduard Robertoviç Qriqoryan idi. Bu qrup Sumqayıt hadisələrini təşkil etmiş, əvvəlcədən talana hazırlaşmış, özünün hərəkət planı, parolu, ekstremal vəziyyətlərdə dağılıb yenidən görüşmək üçün yeri və məqsədləri olan yeganə qrup idi. Sumqayıt talanlarını, ermənilərin mənzillərinə hücumu məhz bu qrupun başladığı o zamankı sovet müstəntiqlərinin apardığı istintaq materiallarındakı ifadələrlə sübut edilir.

İstintaq zamanı Eduard Qriqoryanın və onun ailəsinin yaşadığı Sumqayıt şəhəri, 1-ci mikrorayon, 122 nömrəli binanın sakinləri şahid qismində dindirilmişlər. Həmin binanın sakini Samoxvalova İrina Alekseyevna ifadə verərək göstərmişdir ki, Qriqoryan ailəsini o, 1971-ci ildə Sumqayıt şəhəri 1-ci mkr., ev 122 ünvanında onlarla qonşuluqda mənzil almamışdan əvvəl tanımışdır. Belə ki, o, E.Qriqoryanın anası Valentina Qriqoryanla birlikdə boru-prokat zavodunda işləmişdi. Valentina Qriqoryanın, adını hazırda xatırlamadığı hər iki ayaqdan əlil əri ilə münasibətləri həmişə normal olmuş, aralarında hər hansı münaqişənin şahidi olmamışdır. Əri əlilliyi ilə əlaqədar əmək qabiliyyəti olmadığından ayaqqabı təmiri işləri ilə məşğul olmuş, o vəfat etdikdən sonra isə maddi vəziyyətləri daha da pisləşdiyindən Valentina, əsasən, işdə olduğundan uşaqları nəzarətsiz qalmışdır. Eduard Qriqoryanda uşaqlıq illərindən kriminala meyilli hərəkətlər müşahidə edilirdi (230).

İstintaq materiallarının araşdırılması Eduard Qriqoryan və rəhbərlik etdiyi qrup haqda mühüm məqamları ortaya çıxardı. Qrupun necə formalaşması, səfərbərlik və idarə olunması mexanizmləri bəlli oldu. Qriqoryan qrupun üzvlərinə nəzarət edir, qorxub geri çəkilənlərə təzyiq göstərir, bəzən tərəddüd edənləri dilə tutur və özü erməni olduğu halda, Azərbaycan millətçiliyindən çıxış edərək ermənilərə hücum etməyin zəruriliyini sübut etməyə çalışırdı. Ən mühümü isə o idi ki, istintaq materiallarından birmənalı şəkildə aydın olur ki, Eduard Qriqoryan Sumqayıtda erməni talanlarını hələ talanın baş verdiyi fevral ayından xeyli əvvəl planlaşdırmış və bu barədə özünə yaxın olan adamlara bildirmişdi.

Qriqoryanın qrupun lideri olması və talanları əvvəldən hazırladığı haqda qrup üzvləri hələ 1988-ci ildə öz ifadələrində bildirirdilər. Bunu onunla bir yerdə işləmiş və əvvəllər məhkum olmuş Əfsər İsayevin dedikləri sübut edir. Əfsər İsayevin ifadəsində çox maraqlı bir məqam göstərir ki, Eduard Qriqoryan talanı fevralın 27-də çayxanadakı söhbətdən çox-çox əvvəllər hazırlayıbmış. Məsələn, Əfsər İsayev deyir: «Tez-tez biz onunla işdən evə birlikdə qayıdanda Eduard Qriqoryan mənə deyirdi ki, çoxlu zəngin erməni mənzilləri tanıyır və çox yaxşı olardı ki, onları qarət etsinlər» *(bax: səh.275)* (11, 232). Qeyd edək ki, fevralın 27-də də həmin təkliflə məhz Qriqoryan çıxış etmişdi. Əfsər İsayevin ifadəsindən də görünür ki, o, qrupa elan etdiyi niyyətini hələ xeyli əvvəl planlaşdırmış, bu planlarını özünə yaxın olan, əvvəllər məhkum edilmiş, narkotiklərə meyilli adamlara bildirmişdi *(bax: səh.275)*.



ƏFSƏR İSLAM OĞLU İSAYEV

**1962-ci ildə Sumqayıt şəhərində anadan olub. 1985-ci ildə məhkum olunub. Qriqoryanla bir yerdə işləyir və onunla bir məhəllədə yaşayırdı. Qriqoryanın talançı qrupunun üzvü idi.**

Qriqoryanla Əfsər İsayevin üzləşmə protokolundan: «Müttəhim İsayev bəyan etdi ki, Qriqoryan hələ kütləvi iğtişaşlara qədər ona varlı erməni mənzillərini soymaq haqda fikirlərini bildirmişdi. Sumqayıt şəhərində kütləvi iğtişaşlar başlandıqda isə Qriqoryan İsayevə deyib: «Bu kütləvi özbaşınalıq mənim üçün göydən düşdü» (11, v. 297). (Belə görünür ki, o, ermənilərin yaşadıqları mənzillərə hücumu əvvəldən planlaşdırırdı. Kütləvi mitinqlər və özbaşınalıq isə onun bu planını həyata keçirmək üçün əlverişli mühiti yaratmışdı.) İsayevin bu sözlərinə cavab olaraq Qriqoryan əsəbləşdi və yüksək tonda dedi: «Mən səni nə üçün yedizdirirdim. Çaqqal heç vaxt adam olmayacaq. Sinəndə ilanı isitmək daha yaxşıdır, nəinki sənin kimi farsı». İsayev Qriqoryanın replikasına cavab olaraq deyir: «Sən özün mənə deyirdin ki, 28 fevral hadisələri sənin üçün Allahın hədiyyəsidir. Elə bil ki, uğur özü sənin yanına gəlib» (11, 26-cı cild, i.v. 298).

Cinayətkar qrupun iki üzvünün bu deyişməsində iki mühüm məqam ortaya çıxır. Birincisi, Qriqoryanın qrupun rəhbəri və lideri olması, qrup üzvlərini təmin etməsi bir daha təsdiqlənir, ikincisi, onun 28 fevral hadisələri haqda əvvəlcədən bilməsi və bu hadisələrdən sonra böyük imkanlara nail olacağı haqda düşünməsi və buna uyğun planlar qurmasıdır.

Beləliklə, fevralın 27-ə qədər Eduard Qriqoryan özünə yaxın olan adamlarla ayrılıqda söhbət etmişdi. Fevralın 27-də isə o artıq qrupu bir yerə toplayaraq onlara nə etmək haqda göstərişlər verməyə başlayır. Mə-



NİZAMİ SUMBAT OĞLU SƏFƏROV

**1962-ci ildə Sumqayıt şəhərində anadan olub. Həbsxana cəzasını Eduard Qriqoryanla birlikdə çəkib. Eduard Qriqoryanın talançı qrupuna daxil olub və fevralın 27-də onunla birlikdə talanın planlaşdırılmasında iştirak edib. Qriqoryandan qorxduğunu dəfələrlə istintaqa bildirib.**

---

sələn, Qriqoryanın qrupunun üzvü olmuş Nizami Səfərov (14 iyul 1988-ci il tarixli istintaq protokolu) öz ifadəsində deyir:

«Məni və qohumum Qalib Məmmədovu Nadir Nəcəfov və Vaqif Hüseynov çağırdılar və bizi çayxanaya apardılar. Çayxanada Qriqoryan Edik, Oqtay Babayev və Elçin Gəncəliyev oturmuşdular. Bizim söhbətimiz zamanı Qriqoryan Edik fevralın 28-də saat $15^{00}$-da avtovağzalın yanındakı çayxanada toplaşmağı təklif etdi. Biz razılaşdıq ki, hər birimizin yanında silah olmalıdır: bıçaq, balta və s. Kim nə ilə bacarır silahlansın. Edikin sözlərinə görə, şəhərdə yaranmış vəziyyət bizə cəzasızlıq mühitində erməniləri qarət etmək, zorlamaq və öldürmək üçün imkan verir. Bütün oturanlar onunla razılaşdılar. Xatırlayıram ki, biz həm də razılaşdıq ki, hər kəs özünün «etibarlı» tanışını gətirsin» *(bax: səh.285–286)* (11, v. 177–178).

Daha sonra qrupun fəal üzvlərindən olan Nizami Səfərov fevralın 27-dəki toplantı zamanı masa arxasında, əsasən, üç nəfərin danışdığı və tapşırıqlar verdiyi haqda məlumat verir: «Stol arxasında söhbəti, əsasən, Nadir Nəcəfov, Vaqif Hüseynov və Eduard Qriqoryan aparırdılar. Onların bir yerdə hərəkət etmək, soymaq, quldurluq eləmək və zorlamaq haqda çağırışlarına bizim qrupdan olanların hamısı razılıq bildirirdilər» *(bax: səh.286)* (11, 178).

«Fevralın 27-də (yəni talandan bir gün əvvəl), 1-ci mikrorayonda, «Orbita» kafesinin yanındakı çayxanada Qriqoryan Edik və fevralın 28-də

talanlarda iştirak etmiş qrupun bütün üzvlərinin yığıncağı oldu. Söhbət zamanı Ermənistanda azərbaycanlılara işgəncə verilməsi haqda danışıldı. Edik Qriqoryan təklif etdi ki, sabah, fevralın 27-də saat $15^{00}$-da avtovağzalın yanındakı çayxanada yığışaq. O bizə dedi ki, hər kəsin yanında silah: bıçaq, balta və s. olmalıdır. O həm də dedi ki, hər kəs özünün inanılmış, etibarlı adamlarını gətirməlidir». Masa arxasında, əsasən, Qriqoryan Edik, Nadir Nəcəfov və Vaqif Hüseynov (qrupun nüvəsi) danışırdılar. Yerdə qalanlar isə onlarla razılaşırdılar. Sonra Edik maraqlandı ki, hamıda silah varmı» *(bax: səh.285)* (11, 178).

Bu ifadədən görünür ki, Eduard Qriqoryan qrupu bir gün əvvəldən səfərbər edib, onlara silahlanmağı tapşırıb və səhərisi gün, yəni fevralın 28-də qarətçilik etmək üçün toplaşmaq göstərişi verib. Qriqoryanın qrupunun fəal üzvü olmuş Nizami Səfərovun ifadəsindəki «Edik dedi ki, hər kəs özünün inanılmış, etibarlı adamlarını gətirməlidir» fikri diqqəti cəlb edir və biz bu məqama bir daha qayıdacağıq. Ona görə ki, bu fikirdən belə bir nəticə çıxır: Qriqoryan talana mümkün qədər çox adamı cəlb etməyə və onun kütləviliyini təmin etməyə çalışırdı. Məhz elə buna görə də o özünə tabe edə bildiyi şəxslərə etibarlı adamlar cəlb etmək göstərişi verirdi.

Eduard Qriqoryanı fevralın 27-də ilk dəfə görən və qohumu Nizami Səfərov tərəfindən Qriqoryanla tanış edilən Qalib Məmmədov 29 sentyabr 1988-ci il ifadəsində göstərirdi: «Qriqoryan qrupda seçilirdi. Öz-özümə dedim ki, Qriqoryan bu uşaqların arasında özünü rəhbər hesab edir və hamını idarə edir. Bunu mən onun nəticəsində başa düşdüm ki, Qriqoryan arxayınlıqla qrupun qabağında gedir, ermənilər yaşayan mənzilləri göstərir və doğrudan da, düz deyirdi. Qriqoryan bizim qrupa hara getmək və nə etmək haqda komanda verirdi» *(bax: səh.307–308)* (11, 184).

Nizami Səfərovun 9 noyabr 1988-ci ildə verdiyi ifadədə Qriqoryanın təşkilatçılığı bütün detalları ilə üzə çıxır. N.Səfərov deyir: «Fevralın 27-də Qriqoryan təklif etdi ki, sabah yığışaq və erməniləri qarət etməyə gedək. Qriqoryan təklif etdi ki, 34-cü kvartalda və 3-cü mikrorayonda qarət etsinlər. Hüseynov Vaqif Qriqoryandan soruşdu ki, harada görüşəcəklər. Qriqoryan dedi: «Avtovağzalın yanında, saat $15^{00}$-da, çayxanada görüşərik. Özünüzlə bıçaq götürün. Məndə balaca balta var. Mən onu götürəcəyəm» *(bax: səh.284)* (11, 84).

N.Nəcəfovun ifadəsində belə bir məqam var: «Qriqoryan Edik dedi ki, indi ürəyin istəyən qədər qarışıqlıq (rusca «бесчинствовать» sözü işlədilib)



**NADİR ƏHMƏDXAN OĞLU NƏCƏFOV**

**1963-cü ildə Sumqayıt şəhərində anadan olub. 1983-cü ildə azadlıqdan məhrumetmə cəzasına məhkum edilib. Eduard Qriqoryanla qonşu olub və cəzasını bir yerdə çəkib. Dəstədə Eduard Qriqoryandan sonra ikinci adam idi.**

---

salmaq üçün yaxşı imkan düşüb. Və dedi ki, «Sputnik» mağazasına tərəf gedək. Əfsər və Nizami onun təklifini dəstəklədilər» (28 mart 1988) (11, 63).

Nizami Səfərovun sözlərinə görə, onlar ayrılanda Qriqoryan bir daha arxayın olmaq istəyib ki, o gələcək: «Qriqoryan Edik məndən soruşdu ki, sabahkı planla bağlı mən başa düşdüm? Mən dedim ki, başa düşdüm. Ayrılanda Qriqoryan mənə bir də dedi: «Cimmi, unutma ha!» (11, 85) Bu məqam onu deməyə əsas verir ki, Qriqoryan, hətta təzyiq etməklə səhəri gün, yəni fevralın 28-də qrupu bir yerə toplamağa çalışırdı. Bu onun qrupun üzvlərinin yığışmayacağından və planın pozula biləcəyindən narahat olduğunun, eyni zamanda onun mütləq gəlməsi üçün hədələyici tonun sübutudur.

İlk baxışdan kiçik bir detal Qriqoryanın qrupu formalaşdırmaqda nə qədər maraqlı olduğunu və liderliyini sübut edir. O, hətta Nizami Səfərova işə getməyib onlara qoşulması üçün pul da təklif etmişdi: Bunu Nizami Səfərov da təsdiq edir: «Dedi hara gedirsən? Dedim işə gedirəm. Dedi gəl bura ey, bir günün işinin pulunu biz verəcəyik. Cibindən pul çıxardı verdi Nadirə ki, mənə ötürsün» (11, 85–86).

Qriqoryan qrupu idarə etmək, qrup üzvlərini nəzarətdə saxlamaq və qarışıqlıqda heç kimi itirməmək üçün «polundra» parolunu tətbiq etmiş, bir-birini itirdikdə harada görüşmək lazım olduğunu müəyyənləşdirmişdi. Bu qrupu daha mütəşəkkil edir və eyni zamanda qrup üzvlərinin qorxaraq qəsdən yoxa çıxmasının, qaçmasının qarşısını alırdı.



**ELÇİN ƏLİ OĞLU GƏNCƏLİYEV**

**1965-ci ildə Naxçıvanda anadan olub. Eduard Qriqoryanın qrupunda talanlarda iştirak etmişdi. 2-ci dərəcəli əlil idi. Vərəm və diabetdən əziyyət çəkirdi və həbsxanada vəfat etdi. Versiyalardan birinə görə həbsxanada onu liderin əleyhinə verdiyi ifadələrə görə Eduard Qriqoryanın adamları ölüncə döyüblərmiş.**

Elçin Gəncəliyevin ifadəsindən görünür ki, küçədə adam çox olsa da, qrupun üzvləri 6 saat ərzində bir-biri ilə ayrılmayıblar və bir-birlərini itirməyiblər. Bu onların möhkəm tellərlə bir-birlərinə bağlı olduqlarını və vahid lider tərəfindən idarə olunduqlarını göstərir.

Mobil telefonun olmadığı bir dövrdə qrupun dağılıb yenidən dəqiqliklə bir yerə toplaşması və 6 saat ərzində mütəşəkkil hərəkət etməsi vahid idarənin və planın olduğunu sübut edir. Bu, istintaqçılardan birinin diqqətini cəlb edir və o, Gəncəliyevdən soruşur:

SUAL: – Necə oldu ki, 14–15 nəfərlik dəstə bu evdən o evə, bu küçədən o küçəyə hərəkət edirdi, amma siz bir-birinizi itirmirdiniz?

CAVAB: – Biz əvvəldən razılaşmışdıq ki, hər hansı evdə qarət və talandan sonra aşağıda giriş qapısında görüşək və davam edək.

Qrupun başqa üzvü Qalib Məmmədov 20 fevral 1989-cu ildə verdiyi ifadədə bu məqamı təsdiq edərək deyir: «Qriqoryan Emmanın evində talan etdikdən və onu zorladıqdan sonra Edik Qriqoryan «polundra» deyə qışqırdı. (Bu fakt başqa ifadələrdə də təsdiqlənir.) Bu söz ona işarə idi ki, bizə hansısa təhlükə var və biz müxtəlif tərəflərə qaçmalı, daha sonra isə «Rossiya» kinoteatrının yanında toplaşmalıydıq. Qriqoryanın məsləhəti ilə biz «polundra» siqnalını eşitdikdə məhz belə hərəkət etməli idik» (11, 160). Nizami Səfərovun 14 iyul 1988-ci ildə verdiyi ifadədə də bu məqam öz təsdiqini tapır: «Emma Qriqoryanın evini dağıdandan



**QALİB QƏDİRŞAH OĞLU MƏMMƏDOV**

**1967-ci ildə Şamaxı rayonunda anadan olub. Nizami Səfərovun qohumu və yaxın dostu, Qriqoryanın qrupunun üzvü idi.**

sonra kimsə qışqırdı ki, «polundra!» Biz müxtəlif yerlərə qaçdıq, təxminən bir saatdan sonra 1-ci mikrorayonda görüşdük» *(bax: səh.287)*.

Nizami Səfərovun 12 yanvar 1989-cu ildəki ifadəsində (11, v.175) deyilir: «Bizim, yəni Nəcəfovun, Qriqoryanın, Məmmədovun və başqalarının əvvəldən belə bir razılaşmamız vardı ki, hamı bir yerdə hərəkət etsin və hər hansı mənzildə talandan sonra «podyezd»in qarşısında başqalarını gözləsin ki, sonra birlikdə davam edək» *(bax: səh.292)* (11, 175). Əfsər İsayevlə Eduard Qriqoryanın üzləşməsi zamanı Əfsər İsayev deyir: «Sonra kimsə kütlənin içindən qışqırdı: «Polundra!» Bundan sonra biz 3-cü mikrorayonda növbəti evə daxil olduq» (üzləşmə protokolu. 22 iyun 1988-ci il) (11, 293).

Bu ən yaxşı təşkilatçılıq və icraçılıq nümunəsi idi. Amma bununla da hər şey bitmir. Qriqoryanın qrupunda iyerarxiya, hakimiyyət piramidası var idi. Mütəşəkkil cinayətə xas olan bu xüsusiyyət Qriqoryanın qrupunun təşkil olunma prinsipi və qrupdaxili münasibətlərdə özünü göstərirdi. Bu o deməkdir ki, bu bir təşkilati struktur kimi yaradılmışdı və belə də fəaliyyət göstərmişdi. Qrupun fəal üzvlərindən olan Nizami Səfərov Qriqoryanın birinci, Nadir Nəcəfovun ikinci olduğunu deyir və hətta onu «müavin» kimi xarakterizə edirdi. Nadir Nəcəfovun qohumu Vaqif Hüseynovu isə Qriqoryanın köməkçisi adlandırır. Nizami Səfərov istintaqçılara deyirdi: «Nadir Nəcəfov Qriqoryan Ediklə ya-



**VAQİF VAHABƏLİ OĞLU HÜSEYNOV**

**1963-cü ildə Sumqayıt şəhərində anadan olub. Atası iki dəfə məhkum olunub. 1979-cu ildə xuliqanlığa görə 2 il müddətinə məhkum edilib. Qriqoryanın qonşusu, qrupda ən yaxın adamı olan Nadir Nəcəfovun yeznəsidir. Qrup üzvləri onu Qriqoryanın köməkçisi, Eduard Qriqoryan və Nadir Nəcəfovdan sonra qrup iyerarxiyasında üçüncü adam adlandırırdılar.**

xınlıq edirdi və özünü həyatdə ondan sonra ikinci sayırdı». Nizami Səfərovun sözlərinə görə: «Nadir Nəcəfov Nizami Səfərovun valideynləri ilə bir mərtəbədə yaşayırdı. Qriqoryan isə onlardan iki mərtəbə aşağıda 5-ci mərtəbədə yaşayırdı. Nizami Nəcəfov Qriqoryan Ediklə yaxınlıq edirdi və özünü həyatdə ondan sonra ikinci sayırdı. Vaqif Hüseynov isə Nadir Nəcəfovun yeznəsidir və onlar üçü bir komandadır» (11, 78).

Əfsər İsayev 1988-ci il iyunun 2-də verdiyi ifadəsində deyir: «Qriqoryanın yanında bir nəfər oğlan dayanmışdı. Edik dedi ki, bu oğlan onun tanışıdır. Oğlanın əlində portfelə oxşayan çanta vardı» (müttəhimin dindirilməsi protokolu, 2 iyun 1988-ci il) (11, 195) *(bax: səh.270)*. Portfelli talançı bir qədər qəribə təsir bağışlasa və maraq doğursa da, istintaqın diqqətini cəlb etməyib, onun kimliyi də araşdırılmayıb. Halbuki sonralar istintaqın gedişində onun Kamo adlı erməni olduğu bəlli olacaq. Yeri gəlmişkən, Qriqoryanın qrupu qrupdaxili bir neçə kateqoriya şəxslərdən təşkil olunmuşdu. Qrupun necə toplaşması və onların bir-birinə münasibətləri belə deməyə əsas verir ki, qrupdakı adamların hamısı bir-birini tanımırdı. Amma hamısı ayrılıqda Edik Qriqoryanı tanıyırdı.

Eduard Qriqoryanın icraçı olması onun qrup üzvlərini narkotik həblərlə təmin etməsində də özünü göstərir. O görürdü ki, qrup üzvləri arasında tərəddüd edənlər var. Eyni zamanda o, qrup üzvlərinə oğurluq və qarət edəcəklərini desə də, onları daha aqressiv cinayətə hazırlayırdı. Elə buna görə də hərəkətə keçməzdən əvvəl cəsarətləndirmək, aqressivləşdirmək

üçün onlara xüsusi narkotik təsiri olan həblər paylayırdı. Onun qrupundan olan Məmmədov, Gəncəliyev, İsayev və Səfərovun ifadələrində Qriqoryanın onlara uyuşdurucu həblər paylaması təsdiqlənib və rusiyalı müstəntiqlər bunu protokollarda qeyd ediblər. Məsələn, qrup üzvü Qalib Məmmədov 1 oktyabr 1988-ci ildə verdiyi ifadədə deyir: «Mən bütün bunları ona görə edirdim ki, Edik Qriqoryan mənə həb vermişdi. Mən həbi qəbul etdim və nə etdiyimi düşünmürdüm» *(bax: səh.306)* (11, 126). «Xalqlar dostluğu» monumentinin yanında «Kitablar» mağazasının qarşısında Edik Qriqoryan bizə dedi ki, onda ovqatı qaldıran əla həblər var və o, cibindən ağ rəngli, birqəpiklik böyüklükdə bir neçə həb çıxardı. Onların ikisini mən qəbul etdim. Səfərov və Məmmədov da həb qəbul etdilər». Qrupun başqa üzvü Elçin Gəncəliyev də həbləri məhz «Xalqlar dostluğu» monumentinin yanında qəbul etdiklərini deyir: «Həblər bizə narkotik təsir göstərdi və oyanma, ehtiras hiss etdik» (11, 160). Onun 25 iyul 1988-ci il tarixli istintaq protokolundakı ifadəsində deyilir: «Qriqoryan bizim rəhbərimiz olacağını elan edəndən sonra cibindən həblər çıxarıb hamıya payladı. Mənə də 4 dənə həb verdi. Mən özümdə fiziki güc hiss etdim. Əvvəllər heç vaxt belə vəziyyət yaradan həb görməmişdim və qəbul etməmişdim. Mən hər şeyə getməyə və Qriqoryanın bütün əmrlərini yerinə yetirməyə hazır idim» (11, 160) *(bax: səh.324–325)*.

Nizami Səfərov da bunu təsdiqləyir: «Mənim yadıma gəlir ki, Məmmədov Qalib Qriqoryan Edikdən dörd tabletka almışdı. Biz həmin gün qızışmışdıq, elə bil vəhşiləşmişdik *(bax: səh.291)* (11, 174).

Ancaq hər şey təkcə narkotik həblərlə bitmirdi.

Nizami Səfərov, həmçinin qeyd etmişdi ki, 28 fevral 1988-ci il tarixdə Eduard Qriqoryan, onun qardaşı Albert Qriqoryan və qara plaşda olan tanımadığı adamlar öz aralarında erməni dilində danışaraq «Qaz-53» markalı maşında camaata araq paylayıblar.

Nizami Səfərov: «Albert araqla konyak atırdı yuxarıdan. Albert Edikin qardaşıdır. Sonra onların yanında qara plaşlı biri də vardı. Bilmədim kim idi. Panamalı bir oğlan idi. Arıq, qarabuğdayı, bığsız adam idi. Qara plaşlı erməni dilində danışırdı». Eyni zamanda həmin maşında olan dəmir parçalarını yerə tökərək toplaşmış adamlara onları götürməyi təklif edib. Məhz avtovağzalın yanında, yük maşınından araq, narkotik və dəmir parçaları paylandığını general-leytenant Krayevin adyutantı da təsdiq edib.

O zaman Sumqayıtın komendantı olmuş Krayevin adyutantı Sumqayıt sakini Konstantin Pxakadze ilə söhbətində içki və narkotik paylayan yük avtomobili haqda məlumat verib. Sonralar artıq Yerevanda olan Pxakadze verdiyi ifadədə deyir: «Həmin günlərdə biz şəhərin komendantı general-leytenant Krayevin adyutantı ilə söhbət edirdik. O, bir dəfə dedi: «Uşaqlar, prinsipcə mən özüm şahidi olmuşam ki, avtovağzalın yanında yük maşını gəldi və anaşa, birdəfəlik iynələr və yeşiklərlə araq payladı. Mən özüm bunun şahidiyəm» (231).

General-leytenant Krayevin adyutantının bu şahidliyi Nizami Səfərovun ifadəsi ilə üst-üstə düşür. İkinci mühüm məqam isə odur ki, Nizami Səfərov da, adyutant da yük maşınını məhz avtovağzalın yanında görmüşdülər. Avtovağzalın yanı isə məhz E.Qriqoryanın fevralın 27-də qrup üçün müəyyənləşdirdiyi görüş yeri idi. Sual doğur: nə üçün narkotiklərin, araq yeşiklərinin və dəmir parçalarının paylandığı yük maşını məhz Eduard Qriqoryanın qardaşı Albert Qriqoryanın və başqa qara plaşlı ermənilərin iştirakı ilə, özü də məhz avtovağzalın yanına gəlmişdi? Bu məqam hər şeyin koordinasiya edildiyini və talanın episentrinin məhz Qriqoryanın qrupunun olmasının birmənalı sübutudur.

Eduard Qriqoryanın həmin narkotik həblərin və s. məhz erməni millətindən olan şəxslərdən alması haqda məlumatlar isə DTK-nın müxtəlif instansiyaları arasındakı yazışmalarda, Lebedevin Qorelovskiyə hesabatında, həmçinin Azərbaycan DTK-nın Ermənistan DTK-ya göndərdiyi məktublarda qeyd edilib.

Beləliklə, yuxarıda sadalanmış ifadələrdən çıxarışlar Eduard Qriqoryanla bağlı bu nəticələri çıxarmağa imkan verir:

– Eduard Qriqoryanın Sumqayıtda talanlar təşkil etmək planı hələ fevral ayından xeyli əvvəl var imiş və o bu məqsədlə əvvəllər məhkum olunmuş, narkotiklərə və spirtli içkilərə aludə olan tanışlarını bu plana cəlb etməyə başlamışdı;
– Eduard Qriqoryan fevralın 27-də qrupu bir yerə yığaraq fevralın 28-dəki talanın təşkilatçılığı ilə məşğul olub;
– O, qrupa daha çox adam cəlb etmək göstərişi verərək praktik olaraq kütləvi talan təşkil etmək niyyətini büruzə vermişdi;
– O, qrup üzvlərini cəlb etmək üçün kütləvi talan niyyətini qarət, zinət əşyaları əldə etmək adı ilə ört-basdır edirdi;
– Eduard Qriqoryan qrup üzvlərinin sabah gəlməyəcəyindən narahatlığını büruzə verərək təkrar-təkrar sabahkı gün haqda unutmamağı tapşırırdı;

– Nəhayət, Qriqoryan qrup üzvlərini cinayətə təhrik etmək və onları aqressivləşdirmək üçün narkotik təsirli həblər paylayır.

Rusiyalı müstəntiqlərin rəhbərliyi altında və bilavasitə onların iştirakı ilə 1988-ci ildə, sovet dövründə alınmış ifadələrin sübut etdiyi bu nəticələr Eduard Qriqoryanın icraçı və təhrikçi olmasını və məhz kütləvi talan tamaşası qurmağa çalışmasını sübut edirdi.

Ancaq heç də hər şey bu sadalananlarla bitmir. İstintaq materialları, ifadələr o zamankı sovet istintaq orqanlarının diqqətdən kənarda qoyduqları yüzlərlə sübutla doludur. Qriqoryan dəstəni hücuma səsləyir və komanda verirdi. Onun hücum haqda ilk komandası yoldan keçən avtomobilləri saxlamaq və erməniləri müəyyənləşdirmək haqda idi. Qalib Məmmədov (istintaq protokolu – 8 iyul 1988-ci il) 1988-ci ildə istintaqa verdiyi ifadəsində deyir: «Qarabağ bizimdir!» – bağırtıları qurtaranda Eduard Qriqoryan «Ardımca gəlin!» dedi və irəli çıxdı. Qalanları da onun ardınca getdilər. Qriqoryan dəstəni «Dostluq» küçəsinə çıxardı *(bax: səh. 303)*. Talana da ilk olaraq bu qrup başladı. Ona görə ki, onlara qədər şəhərdə hər hansı bir talanın və qətlin olması haqda məlumatlar yox idi. Sadəcə, mitinqlər vardı. Və bu mitinqlərin talana keçməsi üçün kiçik bir qığılcım kifayət idi. Bu qığılcım Qriqoryanın «hücum!» əmri oldu (11, 65–66).

O, əvvəlcə hamı görsün deyə işıqfora dırmaşaraq hamını erməni evlərini talan etməyə səslədi.

Talanların məhz Eduard Qriqoryan tərəfindən, özü də xeyli əvvəl təşkil edildiyini sübut edən mühüm fakt onda mənzillərinə hücum ediləcək ermənilərin ünvanlarının olmasıdır. Sovet müstəntiqlərinin apardıqları istintaq zamanı Qriqoryanın qrupunun müxtəlif üzvləri talan etdikləri mənzilləri məhz Eduard Qriqoryanın tanıdığını bildirirdilər. Bir neçə ifadədə isə Qriqoryanda mənzillərin siyahısının olması təkrar-təkrar təsdiqlənir.

Həyat yoldaşı erməni olan və hadisələrdən sonra Azərbaycanı tərk etmiş, «Qarabağ» radikal millətçi erməni təşkilatının üzvü Konstantin Pxakadze 10 may 1988-ci ildə Yerevanda verdiyi ifadədə deyirdi:

«SSRİ Baş Prokurorunun müavini Katusevin özünün təsdiq etdiyi daha bir fakt var. Həmin adamların ermənilərin siyahıları ilə gəzməsi faktı. Bu, Katusevin özünün sözüdür ki, bu siyahıları verən qadın artıq həbs olunub» (203; 231).

Katusev Pxakadzeyə siyahıları vermiş qadının həbs edilməsi haqda desə də, istintaq materiallarında həmin qadın haqda heç nə yoxdur və həmin qadının izi itirilib. E.Qriqoryanda ermənilərin yaşadığı evlərin siyahısının

olmasını qrupun ən azı 4 üzvü öz ifadəsində təsdiq edib. SSRİ Baş Prokurorluğunun təmsilçisi Kaliniçenko Eduard Qriqoryanda siyahı olduğunu təsdiqləyir. O göstərir ki, hadisələr yenicə başladığı vaxt artıq belə bir məlumat var idi ki, onlarda erməni ailələrinin yaşadığı ünvanlar var. Bütün hallarda onlar bu evlərə məqsədyönlü şəkildə gedirdilər.

Qriqoryanın qrupunun üzvü olmuş E.Gəncəliyevin ifadəsindən: «Qriqoryan dama-dama dəftər vərəqi çıxardı və ona baxdı». 20 fevral 1989-cu ildə Vəkil Trubovskayanın sualına cavab olaraq talançı qrupun üzvü olmuş Nizami Səfərov deyir: «Hadisə zamanı E.Qriqoryanın əlində siyahı var idi. Mən bunu istintaq vaxtı dəfələrlə demişəm. Həmin siyahıda ermənilər yaşayan ünvanlar yazılmışdı» (11, cild 26, v. 66). Vəkil Trubovskayanın daha bir sualına cavabında o, bir daha siyahının məhz Qriqoryanda olduğunu deyir: «Mən Qriqoryandan savayı başqa adamda siyahı olduğunu görməmişəm və deməmişəm» (11, cild 26, v.66).

Nizami Səfərov: «Qriqoryan Eduard ondan bir gün qabaq, 27 fevral 1988-ci ildə kinoteatr «Rossiya»nın yanında bizi çayxanaya yığmışdı. Dedi ki, məndə ünvanlar var, mən sizə hörmət edəcəyəm. Ünvanları 1-ci mikrorayonun çayxanasında göstərdi. Haradasa, kağızın o üzü, bu üzü 28 ünvan var idi». Qrupun üzvlərindən olan Qalib Məmmədovun 10 noyabr 1988-ci il tarixində verdiyi ifadədə deyilir: «Qriqoryan Edik, Sputnik mağazasının yanında «Moskviç»i yandırandan sonra cibindən dama-dama kağız parçası çıxardı və ona baxmağa başladı. Bu, şagird dəftərindən cırılmış kağız parçası idi. Kağızda sütunda sıra ilə nə isə yazılmışdı (11, 48). Kağıza baxdıqdan sonra Qriqoryan qabağa düşüb 34-cü kvartaldakı 12/55 və 20/13 saylı evlərin arasından keçərək 10/53 saylı evə yaxınlaşdı. Biz hamımız onun ardınca getdik. Qriqoryan 10/53 nömrəli evin 2-ci mənzilinə yaxınlaşıb qapını balta ilə sındırmağa başladı. Evdən çıxandan sonra bütün qrup aşağıda yığışdı. Edik Qriqoryan yenidən cibindən kağız parçasını çıxarıb baxdı və dəstəni 10/53 və 12/55 saylı evlərin yanından keçirərək Dostluq küçəsinə, oradan Sülh küçəsinə apardı. Daha sonra dəstə 3-cü mikrorayona daxil olur. Burada da Qriqoryanın qrupu heç də qarşısına çıxan ilk evə daxil olmur. Bir neçə binanın yanından keçərək 17/33 saylı binaya girərək Məclumyanın mənzilinə qalxırlar (11, 57). Oranı dağıtdıqdan sonra «polundra» siqnalı ilə qaçırlar və «Rossiya» kinoteatrı yanında yenidən toplaşırlar. Bu dəfə Qriqoryan onları 1-ci mikrorayona 14/33 nömrəli evə aparır. Birbaşa 5-ci mərtəbəyə qalxıb 58 nömrəli mənzilin qarşısında dayanırlar. Orada da Qriqoryan Edik qapını balta ilə sın-













**Sumqayıt şəhəri 3-cü mikrorayonun sxemi və qrup üzvlərinin hərəkət istiqaməti**

dırır və içəri daxil olurlar. Qriqoryan qarşısına çıxan kişini balta ilə vurur. Ev sahibi olan Petrosyan özünü müdafiə etsə də, Qriqoryanın baltasının sapı onun başına dəyir və o, huşunu itirir.

V.Kaliniçenko xatırlayırdı: «Yadıma gəlir ki, həmin vaxt şübhə altına Qriqoryan adlı şəxs düşdü ki, bu da məni çox təəccübləndirdi. Xatirimdədir, Qriqoryan məhz cinayətkar kütləni yönləndirən kəs idi. Həbs olunana qədər şahidlərin ifadələrinə görə o, gah ləzgi, gah dağıstanlı, gah da avar kimi, bir sözlə, Şimali Qafqaz nümayəndəsi kimi göstərilirdi» (14–16).

Qrupun başqa üzvü Əfsər İsayev də ifadəsində siyahı faktını təsdiq edərək deyir: «Nadir Nəcəfov Qriqoryandan bundan sonra hara gedəcəklərini soruşdu. Edik Qriqoryan cibindən dama-dama dəftərdən qoparılmış kiçik kağız parçası çıxardı. Kağızda göy rəngdə diyircəkli qələmlə nə isə yazılmışdı. Kağızda bəzi qeydlər pozulmuşdu. Belə başa düşdüm ki, bu ermənilərin yaşadığı evlərin ünvanlarının siyahısı idi. Pozulmuş qeydlər isə onu göstərirdi ki, Qriqoryan və komandası artıq həmin ünvanlarda olublar. Edik bu siyahıya baxdı və ətrafdakılara dedi: «Batalyon, ardımca! Bir nəfər hamı üçün, hamı bir nəfər üçün!» və məktəbdən sol tərəfdəki evlərə doğru getdi. Bütün qrup, mən də onun ardınca getdik» (müttəhimin dindirilməsi protokolu, 2 iyun 1988-ci il) (11, 196–197). Sonralar Əfsər İsayev bu ifadəsini 22 iyun 1988-ci ildə E.Qriqoryanla üzləşməsi zamanı da təsdiqləyir: «Sonra Nadir Nəcəfov Qriqoryana müraciət etdi. Qriqoryan cibindən ağ, damalarla cızılmış, üzərində diyircəkli qələmlə nə isə yazılmış kağız çıxardı. Kağızda konkret nə yazıldığını mən görə bilmədim. Qriqoryan diqqətlə yazılara baxdı və hamıya komanda verdi: «Gəlin, getdik!» (üzləşmə protokolu, 22 iyun 1988-ci il) *(bax: səh.279)* (11, 292).

Qalib Məmmədovun dindirilmə protokolunda o da siyahı faktını təsdiqləyir: «Edik cibindən kağız parçası çıxardı və orada qeydlərə baxıb komanda verdi: «Gəlin ardımca, mən bilirəm ermənilər harada yaşayır». Qrupdan bir neçə addım irəli keçdi, bizim qrupda hamı yerində dayanmışdı. Onda Edik qışqırdı: «Gəlin ardımca, nədən qorxursunuz?» Özü yenə döndü və evin ikinci ümumi giriş qapısına getdi, qalanlar onun ardınca girdilər. Edik bizim qrupu birinci mərtəbədəki 18 nömrəli mənzilə doğru apardı» (müttəhimi dindirmə protokolu, 1 noyabr 1988-ci il) *(bax: səh.312)* (11, 41). Qalib Məmmədov siyahı ilə bağlı daha sonra deyir: «Qriqoryanın baxdığı kağız parçasını mən yaxından görmədim *(bax: səh.314–315)*. O məndən 2–3 metr aralıda idi. Sadəcə, mən bir neçə dəfə gördüm ki, o həmin kağıza baxır» (11, 44). Qriqoryanın ən yaxın adamı



ƏLİ HƏSƏNOV

**Azərbaycan Respublikası Baş nazirinin müavini. 1988-ci ildə Sumqayıt şəhər İcraiyyə Komitəsi sədrinin I müavini olub.**

olan Nadir Nəcəfov da istintaqa siyahı ilə bağlı məsələni təsdiq edərək deyir: «Onu da deyə bilərəm ki, Edik Qriqoryanda erməni millətindən olanların siyahısı var idi, amma mən onu görməmişəm. Bu haqda mənə Nizami Səfərov görüşdüyümüz yerdə dedi. 3-cü mikrorayonda mən Səfərov Nizami, İsayev, Qriqoryan, Məmmədquliyev və Hüseynovla birlikdə olmuşam» (11, v. 205–206). Yeri gəlmişkən, başqa ifadələrdə də Qriqoryanın məhz 3-cü mikrorayonda siyahıya bir neçə dəfə baxdığı qeyd edilir. Həm də məhz orada qrup üzvü olan Nizami Səfərovun Qriqoryana «siyahıya bax!» dediyi istintaq protokollarında öz əksini tapıb.

İstintaqçı ilə Qriqoryanın qrupunun üzvü olmuş Elçin Gəncəliyev arasında qısa sual-cavab çox məsələlərə, həm liderin kim olması, həm də siyahı məsələsinə aydınlıq gətirir.

İstintaqçının sualı: «Siz haradan bilirdiniz ki, bu mənzildə erməni yaşayır?»

Elçin Gəncəliyevin cavabı: «Bilmirəm, bizi Qriqoryan aparırdı» (11, 163).

V.Kaliniçenko bu barədə deyir: «Ermənilərin Qriqoryanla bağlı hadisəyə çox qərəzli yanaşdığını başa düşürəm. Bəzi hallarda onlar bu hadisəni təsadüf kimi qələmə vermək istəyir. Bəzən isə ümumiyyətlə, belə adamın mövcud olmadığını iddia edirlər. Xeyr! Belə adam mövcud idi və əlində də xüsusi bir siyahı var idi» (14–16).

Məsələ ondadır ki, hər şey təkcə siyahı ilə bitmirdi. Mənzillərinə hücum ediləcək şəxslərin evlərinə necə getməyin lazım olduğunu, marşrutu göstərən sxemlərin nüsxələri çıxarılaraq talançı qrupun üzvlərinə paylanmışdı.

1988-ci ildə Sumqayıt şəhər İcraiyyə Komitəsi sədrinin I müavini olmuş, hazırda Azərbaycan Respublikasının Baş nazirinin müavini işləyən Əli Həsənov deyir: «Evlərə hücum edənlərin bir neçəsi yaxalanmışdı. Onların cibindən kiçik vərəqlərdə çəkilmiş sxemlər tapılmışdı. Həmin sxemlərdə gedilməli olan marşrut, ermənilərin yaşadığı ünvanlar, ermənilərin yaşadığı binalara haradan daxil olmalı, neçənci mərtəbəyə qalxmalı və hansı qapının sındırılıb açılmalı olduğu təsvir edilirdi. Bu sxemlərdən 3–4-ü şəxsən mənim əlimdə idi» (14–16).

Elçin Gəncəliyev 3 oktyabr 1988-ci ildə verdiyi ifadəsində deyir: «Bizim qrupumuza Qriqoryan rəhbərlik edirdi, o, qabaqda gedirdi» (11, 130).

Bununla da, hər şey aydın olur. Ancaq istintaq bu sualları Qriqoryana ünvanlamaqdan və məsələni araşdırmaq niyyətindən çox uzaq idi. Sanki istintaqa daha çox azərbaycanlıların ifşası lazım idi. Məhz azərbaycanlının ittiham olunması sonradan Dağlıq Qarabağı Azərbaycandan ayıraraq Ermənistana birləşdirilməsi üçün əsas verməli idi.

Qriqoryanın qrupunun siyahı üzrə hərəkət etməsini talan edilmiş ünvanlar üzrə də müəyyənləşdirmək olur. Məsələn, binaların aşağı mərtəbələrində yaşayan erməni ailələri və onların mənzilləri heç bir zərər görmədiyi halda, yuxarı mərtəbələrdə yaşayan erməni ailələri və onların mənzilləri hücuma məruz qalmışdı. Əgər ermənilərin öldürülməsi kortəbii şəkildə aparılsaydı, birinci mərtəbədəki ermənilərə, ilk növbədə, hücum edilərdi. Amma qətllər xüsusi plan və sxem üzrə həyata keçirilmiş, mənzillər seçim üzrə müəyyənləşmişdi.

Sumqayıt talanlarında qrupa məhz Qriqoryanın hamını talana təhrik etməsinin daha bir sübutu onun geri çəkilmək istəyənləri dilə tutması ilə bağlı məqamlardır. Eduard Qriqoryan bəzi məqamlarda tərəddüd edən qrup üzvlərini gah dilə tutur, gah da hədə-qorxu gəlir, bəzən də zinət, daş-qaş ələ keçirməklə şirnikləndirirdi. İstintaq protokolları da bunu sübut edir. Məsələn, ifadə verən Nadir Nəcəfov deyir: «Mən onun təklifini ruh yüksəkliyi ilə qarşılamadığım üçün Edik məni məzəmmət etdi və mənə bu sözləri dedi: «Nadir, sən azərbaycanlısan və bu dəqiqələrdə sən burada durmalı deyilsən, erməni mənzillərini talan etməlisən. Sən isə nədənsə narazılıq edirsən» (11, 63–64).

Sonra artıq yolda Edik və Nizami mənə dedilər ki, onlar – Edik, Nizami və Əfsər nə etsələr, mən də onun hamısını etməliyəm. Əks-təqdirdə, məni də Sumqayıt ermənilərinin taleyi gözləyir. Əfsər az danışırdı, amma görünürdü ki, o da onlarla razıdır» (28 mart 1988) (11, 63–64).

Qalib Məmmədov (istintaq protokolu, 1 noyabr 1988-ci il) istintaqa verdiyi ifadəsində deyir: «Biz hamımız 6/2 nömrəli evin qarşısında durmuşduq. Edik cibindən kağız parçası çıxardı və orada qeydlərə baxıb komanda verdi: «Gəlin ardımca, mən bilirəm ermənilər harada yaşayır». Qrupdan bir neçə addım irəli keçdi, bizim qrupdan hamı yerində dayanmışdı. Onda Edik qışqırdı: «Gəlin ardımca, nədən qorxursunuz?» Özü yenə döndü və evin ikinci ümumi giriş qapısına getdi, qalanlar onun ardınca girdilər (11, 41).

Qrup üzvlərindən Elçin Gəncəliyev 13 dekabr 1988-ci ildə verdiyi ifadədə məhz Qriqoryanın talana rəhbərlik etdiyini deyir: «Moskviç» avtomaşınından sonra ermənilərin harada yaşadığını bilən Qriqoryan tərəfindən idarə olunan qrupumuz 3-cü mikrorayona 17/33 b saylı binanın 1-ci giriş qapısına getdi və 5-ci mərtəbədəki mənzilə daxil oldu. Daha sonra 6/2 saylı evə doğru getdik. Oradan 5/2 saylı evə daxil olduq. Sonra 1-ci mikrorayona getdik. Orada 13/31-ci evə, daha sonra 14/33-ə getdik» (11, 157–158).

Qalib Məmmədovun 1 noyabr 1988-ci ildəki ifadələrində ilk baxışdan diqqəti cəlb etməyən, amma Qriqoryanın hansı səviyyədə lider olduğunu göstərən bir məqam var. Belə ki, Qalib Məmmədov Svetlana Qriqoryanı zorlayanda qrupdan Qriqoryanın başqa yaxın adamları qadını (qənimət kimi) onun əlindən alıb Eduard Qriqoryana veriblər. Qriqoryan qadını qənimət kimi Qalib Məmmədovun əlindən alıb. Vaqif Hüseynov bu işdə Eduard Qriqoryana kömək edib (11, 42). Bu məqam onu göstərir ki, qrup üzvləri qadını da qənimət kimi ilk olaraq Eduard Qriqoryana təqdim edirmişlər *(bax: səh.313)*.

Qriqoryanın qrupunun məhkəmə işində prokuror kimi çıxış etmiş Aslan İsmayılov göstərir: «Yay günlərinin birində dustaqlara su verdilər. Qriqoryan lap sonda, su verilən tərəfə yaxın isə azərbaycanlılar oturmuşdular. Sonuncuya su verildi, o su ötürülə-ötürülə Qriqoryana verildi. Qriqoryan içəndən sonra başqa azərbaycanlılar içdi. Və mən tənəffüsdə dustaqlara: «Bəs deyirdiz Qriqoryandan qorxmuruq?! Qorxmurduz, ona görə Qriqoryanın qalığını içdiniz?» – sualını verdim» (14–16).

Eduard Qriqoryanın ən yaxın adamlarından olan və ən qəddar zorakılıqda bilavasitə iştirak etmiş Vaqif Hüseynov (istintaq protokolu, 12 yanvar 1989-cu il) ifadəsində deyirdi: «E.Qriqoryan «ardımca» deyə qışqırıb 5/2 nömrəli evin ümumi giriş qapılarından birinə daxil oldu» (11, 228).

Nizami Səfərov isə qrupun liderləri haqda belə deyirdi (14 iyul 1988): «Qeyd etmək istəyirəm ki, bizim qrupumuzda Eduard Qriqoryan, Nadir Nəcəfov, Vaqif Hüseynov və onun dostu Nizaməddin lider idilər» (11, 180).

Qriqoryan və yaxın ətrafı qrup üzvlərini qorxu altında cəlb etmişdilər və hətta talanın gedişində də onların hərəkətlərini nəzarətdə saxlayırdılar. Məsələn, artıq diqqət yetirdiyimiz bir məqamı bir də xatırlamağa ehtiyac var. Mənzillərin birində Qriqoryan qrup üzvü Əfsər İsayevi talan və quldurluqda kifayət qədər fəal olmamaqda günahlandırır və onu hədələyir. Qriqoryanla üzləşmə zamanı Əfsər İsayev bu barədə belə deyir: «6/2a evdəki mənzildə Qriqoryan kişini öldürəndən sonra mən aşağı düşüb kütlənin içərisində dayandım. 15–20 dəqiqədən sonra Qriqoryan qrupla aşağı düşəndə məni görüb dedi: «İlan, yaramaz, sən hara qaçdın!» *(bax: səh.280)* Bu məqam da göstərir ki, Qriqoryan dəstəni qorxu altında quldurluğa məcbur edirdi» (üzləşmə protokolu, 22 iyun 1988-ci il) (11, 292). Daha bir misal. Əfsər İsayevin ifadəsindən: «Evlərdən birinin yanında biz yuxarı qalxmağa cəsarət etmirdik. Qriqoryan Edik qışqırdı: «Batalyon ardımca!» Ancaq hamı yerində durmuşdu, və heç kim tərpənmirdi. Onda Qriqoryan yenə qışqırdı: «Nədən qorxursunuz, irəli!» Özü isə qabağa çıxıb binanın ümumi giriş qapısına («podyezdə») daxil oldu. Onun ardınca bütün qrup getdi. Mən ikinci mərtəbəyə qalxanda gördüm ki, sağdakı mənzildə qapı sındırılıb və bütün qrupumuz oradadır. Bir kişi yerə yıxılmışdı və başından qan axırdı. Edik Qriqoryan isə əlində balta onun yanında dayanmışdı. O, Nizamiyə qışqırıb soruşdu: «Nizami! Bu bizdə neçəncidir, artıq üçüncü, yoxsa dördüncü?» Nizami ona cavabında dedi: «Bu artıq üçüncüdür Edik-can» *(bax: səh.280)* (üzləşmə protokolu, 22 iyun 1988-ci il) (11, 292). Bu ermənilərə xas olan danışıq manerasıdır. Bir qədər keçdikdən sonra biz bütün dəstə ilə aşağı düşdük və yenə də bütün qrup bir yerə yığıldıq. Eduard Qriqoryan həm də bütün qrup üzvlərini növbə ilə cinayət törətməyə vadar edirdi ki, heç kəs kənarda qala bilməsin.



**ASLAN İSMAYILOV**

**1988-ci ildə Sumqayıt hadisələri ilə bağlı məhkəmə prosesində prokuror kimi dövlət ittihamını müdafiə edib.**

Qrupun üzvü olan Vaqif Hüseynov 12 yanvar 1989-cu ildə verdiyi ifadədə Emma Qriqoryanın işgəncə ilə öldürülməsi haqda deyir ki, E.Qriqoryan onu hədə ilə bu işə təhrik etdi: «Edikin gözləri qırmızı, sifəti isə meyit sifəti kimi ağ idi. Onun dəhşətli sifəti vardı. Mənə borunu Emmaya yeritməyi tələb edərək dedi: «Əgər bunu etməsən, sən də onun kimi olacaqsan»*(bax: səh.335)*.

Onun qrupdakı mövqeyi məhkəmə prosesində, məhkəmə zalında da açıq şəkildə görünürdü. Qriqoryanın qrupunun məhkəməsində dövlət ittihamçısı Aslan İsmayılov deyir: «Məsələn, Qriqoryan oturduğu yerdə bir stul həmişə boş olardı – bir adamlıq. Qriqoryan nə vaxt və kimi istəsə, deyərdi ki, gəl, burada otur – oturardı! Onun qulağına nə pıçıldayardı, nə deyərdi, bəlli deyil! Amma hamısının Qriqoryandan həddən artıq qorxduğu bəlli idi» (14–16).

Artıq qeyd edilmiş bir ifadənin yenidən bu kontekstdə xatırlanmasına ehtiyac var. Nadir Nəcəfov ifadəsində deyir: «Mən onun təklifini ruh yüksəkliyi ilə qarşılamadığım üçün Edik məni məzəmmət etdi və mənə bu sözləri dedi: «Nadir, sən azərbaycanlısan və bu dəqiqələrdə sən burada durmalı deyilsən, erməni mənzillərini talan etməlisən. Sən isə nədənsə narazılıq edirsən». Sonra artıq yolda Edik və Nizami mənə dedilər ki, onlar – Edik, Nizami və Əfsər nə etsələr, mən də onun hamısını etməliyəm. Əks-təqdirdə, məni də Sumqayıt ermənilərinin taleyi gözləyir. Əfsər

az danışırdı, amma görünürdü ki, o da onlarla razıdır (28 mart 1988) (11, 64). Əfsər İsayev 7 iyun 1988-ci ildə verdiyi ifadədə deyir: «Qriqoryan və Nəcəfov bizim bütün həyatimizi qorxu altında saxlayırdılar. Onlar adamları döyür və əllərindən hər şeyi alırdılar» (11, 232). Demək olar ki, qrupun bütün üzvləri ayrılıqda istintaqa ifadələrində Eduard Qriqoryandan qorxduqlarını deyirdilər. Qrupun üzvü Əfsər İsayev iyunun 2-i 1988-ci ildə verdiyi ifadədə deyir: «Mən Edik Qriqoryandan və Nadir Nəcəfovdan qorxurdum. Ona görə də istintaqa səhv məlumat verirdim. İndi peşmanam». Qrupun daha bir üzvü Nizami Səfərov da onlardan qorxduğunu bir neçə yerdə büruzə vermişdi.

Aslan İsmayılov öz kitabında, hətta məhkəmə zamanı belə ifadə verənlərin Qriqoryandan qorxduğunu qeyd edir (30, 92–93).

Əfsər İsayev ifadəsində deyirdi: «Fevralın 29-da bizi tutub milisə apardılar. Biz dəhlizdə dayanmışdıq və mən orada Edik Qriqoryanla Nadir Nəcəfovu gördüm. Onlar bir qədər aralıda dayansalar da, danışmaq imkanımız var idi. Edik Qriqoryan mənə dedi ki, mən istintaqda heç nə deməyim. Əks-təqdirdə onun bütün ittifaq üzrə koloniyalarda dostları var və mən onun əleyhinə danışsam, o məni yerin altından da olsa, tapıb öldürəcək. Eyni sözləri mənə Nadir Nəcəfov da dedi» (7 iyun 1988-ci il, istintaq protokolu) (11, 228)» ...Bayıl təcridxanasında məni Nadir Nəcəfovla eyni kameraya – 96 nömrəli kameraya salmışdılar. O yenə mənə hədə-qorxu gəlir və deyirdi ki, əgər mən düzünü danışsam ki, onlar qadını və başqalarını necə öldürüblər, onda Nadir həbsxanadan bayırdakı dostlarına yazacaq və onlar da mənim ailəmi öldürəcəklər. Mən yaxşı bilirdim ki, Qriqoryan Edik və Nadir Nəcəfov başkəsəndilər və doğrudan da, mənim ailəmi öldürə bilərlər. Ona görə də istintaqda yalan danışdım» (11, 230)*(bax: səh.272–273)*.

Diqqəti çəkən əsas məqamlardan biri də odur ki, məhz Qriqoryan və qrupdakı ən yaxın adamları – Nadir Nəcəfov və Vaqif Hüseynov təkrar-təkrar, dəfələrlə «ələ vermək olmaz» deyib bundan çox narahat olduqlarını büruzə verirdilər. Başqa qrup üzvləri bu ifadəni işlətmirdilər. Bu məqam da məhz onun lider olması və istintaqa düşəcəkləri təqdirdə özünü necə aparmaq haqda təlimat verdiyini üzə çıxarır.

Qrupun liderlərinin hədə-qorxu gəlməsi haqda ifadələrdə kifayət qədər faktlar var: «Eyni zamanda Nadir Nəcəfovla Eduard Qriqoryan xəbərdarlıq edirdilər ki, kimsə ələ düşsə, başqalarını ələ verməsin. Əks-

təqdirdə onu qisas gözləyəcək» (11, 178). İstintaq protokollarından daha bir fakt. Nizami Səfərov 20 fevral 1989-cu ildə verdiyi ifadədə deyir: «Qriqoryan dedi ki, qalxın. Biz çayxanadan çıxıb Dostluq və Sülh küçələrinin kəsişdiyi yerə getdik. Avtovağzalın yanından keçəndə Vaqif Hüseynov mənə xəbərdarlıq etdi ki, əgər milisə düşüb danışsam, sonra onlardan inciməyim. Qriqoryan da barmağını silkələyib dedi: «Bax ha!» Uşaqlar fikirləşirdilər ki, mən onları «sata» bilərəm. Mən cavab verdim ki, onlar sakit ola bilərlər» (11, 197) *(bax: səh.288)*.

Sumqayıt talanının həyata keçirilməsində bir məqam da diqqəti xüsusi olaraq cəlb edir. Məsələ ondadır ki, Eduard Qriqoryan qrup üzvlərini oğurluq adı ilə cəlb edib, amma talan və quldurluğa başlayıb və buna mümkün qədər kütləvi xarakter verməyə, nümayişkaranə etməyə çalışıb və buna nail olub. Onun formalaşdırmağa çalışdığı qrupun üzvlərinin sayını artırmağa çalışması, onlara silahlanmağı tapşırması, işgəncə verdiyi qadının necə öldürüldüyünü adamlara göstərmək üçün onu küçəyə çıxarmağı əmr etməsi göstərir ki, Qriqoryan, əslində, soyğunçuluq yox, milli zəmində talan nümayişi təşkil edirdi. O, qrup üzvlərini də aldadırdı və əsl niyyətini gizlədirdi. İstintaq protokolundan bir məqam bu məsələyə aydınlıq gətirir. Qriqoryan hamıya silah götürməyi tapşırmışdı. Qrup üzvləri təəccüblənəndə o demişdi ki, guya, bu, «qorxutmaq üçün» lazım olacaq. Məsələn, Nizami Səfərov istintaqa deyirdi: «Uşaqlardan kimsə dedi ki, onun bıçağı yoxdur. Qriqoryan cavab verdi ki, hər hansı mətbəx bıçağı da götürmək olar. Heç kimi öldürməyəcəyik, qorxudarıq, başından vurarıq, şeyləri götürərik və qaçarıq» (istintaq protokolu, 9 noyabr 1988-ci il) *(bax: səh. 284)* (11, 84). Bu məqam onu göstərir ki, Qriqoryan əsl məqsədini qrup üzvlərindən gizlədir və kütləvi talan deyil, qarət etmək adı ilə onları şirnikləndirirdi. Ancaq onun küçə kənarındakı işıqfora dırmaşaraq çağırış etməsi, yoldan keçən maşınları saxlamaq, sərnişinləri erməni adı ilə döymək və avtomobili yandırmaq haqda verdiyi əmr artıq qarət deyil, kütləvi talan idi. İstintaqa ifadə vermiş bir şahid də bunu təsdiq edir. Mən əvvəllər Qriqoryanı tanımırdım. Şəhərin girəcəyində işıqfor var. Fevralın 28-də axşam 6 radələrində Qriqoryan həmin işıqfora dırmaşaraq kütləyə göstərişlər verirdi.

İfadələrdən görünür ki, Eduard Qriqoryan mənzillərdən qənimət əldə etməyə çalışmırdı və demək olar ki, mənzillərdən heç nə götürmürdü. O daha çox adam öldürməyə, zorlamağa və bunu nümayişkaranə şəkildə

etməyə üstünlük verirdi. Qriqoryan üçün qənimət maraqlı deyilmiş. Hətta Gəncəliyev bir evdən qənimət götürdüyü zaman Qriqoryan ona məsləhət görüb ki, bunu atsın bir tərəfə. Başqa bir məqam: doğrudur, o, qrup üzvlərini qənimət ələ keçirməklə şirnikləndirir. Ancaq nədənsə qrupun genişləndirilməsində və böyüməsində maraqlı görünür. Halbuki qrup nə qədər böyüyürdüsə, qənimət də o qədər çox adama paylanırdı. Bu baxımdan məqsədi qənimət ələ keçirmək olan qrup 3–5 adamdan ibarət olsaydı da, bu işin öhdəsindən gələ bilərdilər. Başqa tərəfdən, qrup nə qədər kiçik olardısa, izi də o qədər asanlıqla itirmək və böyük səs-küy qaldırmamaq olardı. Bəs nə üçün Qriqoryan qənimət ələ keçirmək prosesinə daha çox adam cəlb etmək və daha çox hay-küy qaldırmaq istəyir və qrup üzvlərinə özlərinin etibarlı və inanılmış adamlarını gətirməyi möhkəm tapşırırdı? Bu onu göstərir ki, E.Qriqoryanın əsas məqsədi qənimət ələ keçirmək deyil, daha çox hay-küy qaldırmaq, daha çox qan tökülməsinə nail olmaq və bu hadisəni kütləviləşdirmək olub. Məsələn, o, mənzillərin birində növbəti qətli törətdikdən sonra qrup üzvü Nizami Səfərovdan bunun neçənci qətl olduğunu soruşur. Əfsər İsayev öz ifadəsində deyir: «Bir kişi yerə yıxılmışdı və başından qan axırdı. Edik Qriqoryan isə əlində balta onun yanında dayanmışdı. O, Nizamiyə qışqırıb soruşdu: «Nizami! Bu bizdə neçəncidir, artıq üçüncü, yoxsa dördüncü?» və Nizami ona cavabında dedi: «Bu artıq üçüncüdür, Edik-can». O, hətta bir məqamda Nadir Nəcəfova mənzildən oğurladığı şeyləri atmağı məsləhət bilib və deyib ki, əsas məsələ bu deyil. E.Qriqoryan soyğunçuluq etməyib. O, yalnız başqalarını təhrik edirdi. Ona 144-cü maddə, yəni soyğunçuluq maddəsi verilməyib. Ona görə ki, istintaq Qriqoryanın qarətdə iştirakı ilə bağlı faktlar aşkarlaya bilməyib. (Eyni zamanda istintaq hadisəni xırda oğurluq kimi qeyd etmək niyyətindən də uzaq idi – İ.M.) O, yalnız zorlamaq və dağıtmaqla məşğul olub. Qrupun azərbaycanlı üzvlərinin ifadələrindən isə görünür ki, onlar yalnız soyğunçuluqla məşğul olublar. Məsələn, Əfsər İsayev Nadir Nəcəfovun əlində sellofan paket olduğunu və bu paketin içərisinə qiymətli əşyaları yığdığı haqda şahidlik edir: «O, mənzildən çıxanda mən Nizamidən soruşdum: yenə kimisə öldürdülər? Nizami mənə cavab verdi ki, orda pul verdilər. O mənə nə qədər pul verdikləri haqda bir söz demədi. Deyirdilər ki, pul verilmiş mənzilin qapısını Qriqoryan balta ilə sındırmışdı. Mən Nadirdə sellofan paket gördüm və soruşdum ki, bu onun nəyinə gərəkdir. O mənə cavab verdi ki, kisəyə müxtəlif qiymətli əşyaları yığır və o, artıq qarət etdiyi əşyaların bir hissə-

sini xəstəxananın yanında gizlədib. Evə gedəndə qarət edilmiş əşyaları öz aramızda böləcəyik». (Ə.İsayevlə E.Qriqoryanın üzləşmə protokolu, 22 iyun 1989-cu il) (11, 292). Bu fakt belə deməyə əsas verir ki, qrupun başqa üzvləri yalnız qarət etmək məqsədi güddüyü halda, artıq qeyd olunduğu kimi Edik Qriqoryan isə Nadir Nəcəfova götürdüyü şeyləri atmağı məsləhət görürdü (11, 66). İstintaq protokolundan: «Edikin məsləhəti ilə mən mənzildən götürdüyümü atdım» (28 mart 1988) (11, 66).

Eduard Qriqoryanın qarət deyil, məhz qətl şousu yaratmaq və bunu mümkün qədər nümayişkaranə şəkildə etmək planı Emma Qriqoryanın işgəncə qətlində də özünü göstərir. Məhz o, Emma Qriqoryanı mənzilində deyil, küçədə adamların gözü qarşısında qətlə yetirməyi qrup üzvlərindən tələb edir. Nadir Nəcəfovun ifadəsində deyilir: «Qriqoryan dedi ki, qadını küçəyə çıxaraq ki, adamlar görsün» (6 oktyabr 1988) (11, 244). Bu məqam başqa ifadələrlə də təsdiqlənir. Bütün bunlar göstərir ki, Eduard Qriqoryan adi cinayətkara xas olmayan tərzdə cinayəti gizlətməyə və gözə görünməməyə deyil, əksinə, daha çox iyrəncliyin nümayiş etdirildiyi qətl və işgəncə tamaşaları düzəltməyə çalışırdı. Onun bütün hərəkətləri, göstərişləri, hədə-qorxuları mümkün qədər çox adam cəlb etməyə, mümkün qədər çox qan tökməyə və bütün bunları mümkün qədər çox və geniş nümayiş etdirməyə yönəlmişdi. Halbuki o, fevralın 27-də qrup üzvlərinin tərəddüd etdiyini görüb onları aldatmış və heç kimi öldürməyəcəklərini demişdi (N.Səfərov – 9 noyabr 1988) (11, 84).

Nadir Nəcəfov 24 fevral 1989-cu ildə verdiyi ifadədə deyir: «Edik Qriqoryanın qarətdən qətllərə keçməsi mənim xoşuma gəlmirdi. Mən adamları öldürmək istəmirdim. Ona görə də onlardan uzaqlaşmaq qərarına gəldim və belə də etdim» (11, 316). Əfsər İsayev də 7 iyun 1988-ci ildə verdiyi ifadədə bunu təsdiq edir: «Əgər bilsəydim ki, Qriqoryan və başqaları ermənilər zorlayacaq və öldürəcəklər mən oraya getməzdim. Ancaq Qriqoryan mənə deyirdi ki, onlar çoxlu pulu olan zəngin ermənilərin mənzillərini tanıyırlar və biz pulları götürəcəyik. Buna görə mən onlarla getdim» *(bax: səh. 274)* (11, 231). Yeri gəlmişkən, Nizami Səfərovun da ifadəsində çayxanadakı söhbətdə Qriqoryan öldürmək yox, qorxutmaq və oğurlamaq haqda danışırdı. Bu məqamda onun ifadəsindəki mühüm bir detalı bir də xatırlamağa ehtiyac var. Nizami Səfərov istintaqa deyirdi: «Qriqoryan dedi ki, sabah hamı özü ilə bıçaq götürsün. Mənim balaca baltam var, mən onu götürəcəyəm. Uşaqlardan kimsə dedi ki, onun

bıçağı yoxdur. Qriqoryan cavab verdi ki, hər hansı mətbəx bıçağı da götürmək olar. Heç kimi öldürməyəcəyik, qorxudarıq, başından vurarıq, şeyləri götürərik və qaçarıq» (11, 84). Ancaq talan başlandıqdan sonra Qriqoryan tamam başqa hərəkət forması seçir: öldürür, yandırır, zorlayır və bunu mümkün qədər nümayişkaranə şəkildə etməyə çalışır, başqalarını da buna məcbur edir.

İfadələrdə Eduard Qriqoryanın fevralın 28-də başqa qrup üzvlərinin tanımadığı şəxslərlə görüşdüyü haqda fakt var. Bu barədə qrupun üzvü olmuş Qalib Məmmədov istintaqa məlumat vermişdi: «Avtovağzalın yanında, bizdən 10 metr aralıda iki nəfər kişi də dayanmışdı. Mən onları əvvəllər görməmişdim. İndi fikirləşirəm ki, onlar erməni imişlər. Qriqoryan 3–4 dəfə onlara yaxınlaşdı. Onlarla söhbətdən sonra geri qayıdanda çevrilib dedi: «Kütbeyinlər ardımca gedəcəklər» (istintaq protokolu, 25 iyul 1988-ci il, s.17) (11, 104) *(bax: səh.306)*.

İstintaq materiallarında Eduard Qriqoryanın bilavasitə 5 nəfəri qətlə yetirdiyini və üç nəfəri zorladığını sübuta yetirən faktlar var. Müstəntiq Kaliniçenko göstərir ki, o vaxt biri Karina, digərinin adı dəqiq yadımda qalmayan Mejlumyan bacılarının zorlanma faktı var idi. Günahkarların tanınması istiqamətində iş aparılırdı və həmin vaxt Mejlumyan müttəhimlərdən birini tanıdı (14–16).

1988-ci ilin martın 9-da keçirilmiş tanınma prosesində Lyudmila Mejlumyan 3 nəfərin arasından Eduard Qriqoryanı tanıyır və məhz onun 28 fevral 1988-ci ildə onların mənzilində olduğunu təsdiqləyir. Martın 18-də üzləşmə zamanı Mejlumyan öz fikrini bir daha təsdiqləyir. Qriqoryanın yalvarışlarına və onu dilə tutmasına baxmayaraq, Mejlumyan dəfələrlə fikrini təsdiqləyir. Hətta onun erməni olduğunu bildiyi təqdirdə də fikrindən dönmür.

Mejlumyan təkrar edir: «Mən onu yaxşı xatırlayıram. Ola bilməz ki, insan 100 faiz bir-birinə oxşasın. Belə olmur». Karina və Lyudmila Mejlumyanlar danışırlar.

Sual: – Bu adamı tanıdınız?

Karina: – Bəli.

Sual: – Onun adını və soyadını deyin.

Karina: – Bəli, bu, Qriqoryan Eduard Robertoviçdir – Sumqayıt şəhər sakini. Həmin gün o bizim mənzildə olub. Ona görə yadımda qalıb ki, digərlərindən fərqlənirdi, sarışın idi. Həm də əlində tatuaj var idi. Orada ya Rita, ya da Rima yazılmışdı. Məni vəhşicəsinə vururdu.

**ПРИЛОЖЕНИЕ**

к протоколу опознания от 9 марта 1988г.

по уголовному делу № ______



Предъявление лица для опознания потерпевшей Межлумян Л.Г. обвиняемого Григоряна Эдуарда Робертовича.

Понятые: ______

Следователь: ______

Lyudmila Mejlumyanın bacısı Karina Mejlumyan da 3 nəfərin arasından Eduard Qriqoryanı tanıyır. Tanınmanı aparan prokuror Kaliniçenko Qriqoryana xitabən deyir: «Bu qədər təsadüf ola bilərmi?»

SSRİ Prokurorluğu istintaq qrupunun üzvü, müstəntiq Vladimir Nikitin göstərir ki, Qriqoryanla 2–3 aylıq iş apardıqdan sonra mən artıq onun Petrosyanın ölümündə, Mejlumyanların zorlanmasında iştirakçı olmasına qəti əmin idim. Bu barədə artıq məndə heç bir şübhə qalmamışdı (14–16). Mejlumyanların ifadəsinə görə onların mənzilinin qapısını balta ilə Qriqoryan sındırıb və hər ikisini birinci məhz o zorlayıb. Lyudmila Mejlumyanın sözlərinə görə, daha sonra E.Qriqoryan əlini qaldırıb qışqırdı: «Bütün erməniləri öldürmək lazımdır». Həm də bunu pasportunun milliyyəti bildirən hissəsində «erməni» yazılmış şəxs qışqırırdı.

Eduard Qriqoryanın ermənilərə nifrət etdiyini demək, hətta bunu güman etmək belə mümkün deyil. Qriqoryanın pasportunun milliyyəti bildirən hissəsində erməni yazılması, üstəgəl milliyyətcə erməni olan Rita Qəhrəmanyanla evlənməsi onun ermənilərə nifrət etməməsinin sübutudur. Başqa tərəfdən özü və həyat yoldaşı erməni olduğu üçün uşaqları da təbii ki, ermənidir və o, uşaqlarına nifrət etmiş olardı. Nəhayət, Rita Qəhrəmanyanın ifadəsində ilk baxışdan əhəmiyyətsiz görünən, amma Eduard Qriqoryanın ermənilərə münasibətini göstərən məqamlardan biri öz əksini tapıb. Rita Qəhrəmanyan fevralın 27-də, talandan bir gün əvvəl, axşam saat 10-da Samvel adlı ermənigildən qayıtdıqlarını deyib. Pasportunda milliyyətini şüurlu olaraq erməni göstərən, erməni qadınıyla evlənmiş, uşaqları erməni olan və talandan bir gün əvvəl erməni Samvelgildə qonaqlıqda olmuş Qriqoryanın ermənilərə nifrət etdiyini iddia etmək məntiqsizdir! DTK-nın Sumqayıt şəhər şöbəsinin arayışında deyilir ki, Mejlumyanların onu tanımasından sonra Qriqoryan narahat olmağa başlamışdı və uzun müddət özünə gələ bilməmişdi. Hətta başını əlləri arasına alaraq deyirmiş ki, onun bütün planları pozuldu. Qriqoryan hər şeyi inkar etsə də, sonralar üzləşmə zamanı onu tanımış başqa bir Sumqayıt sakini Poqosyan haqda deyirdi: «O gecə görsəydiniz, o mənim qarşımda necə dovşana dönmüşdü. İndi gör necə gəzir?» Və bununla da öz iştirakını təsdiq edir.

Demək olmaz ki, SSRİ DTK-sında Qriqoryan haqda məlumatsız olublar və yaxud buna əhəmiyyət verməyiblər. Əldə olan arxiv sənədləri bunun tam əksini sübut edir. Eduard Qriqoryanın şəxsiyyəti və hərəkət-



**VLADİMİR NİKİTİN**

**SSRİ Prokurorluğunun Sumqayıt hadisələrini araşdırmış istintaq qrupunun üzvü**

ləri SSRİ DTK-sına tam məlum idi. Bir məqam da xüsusi olaraq diqqəti cəlb edir: Eduard Qriqoryanın və eyni zamanda həyat yoldaşı Rita Qəhrəmanyanın işlədikləri Sumqayıt boru-prokat zavodunun DTK-dan olan kuratoru da Sergey Ohanesyan adlı erməni idi. Ohanesyan 1986-cı ildə Moskvadan Sumqayıta təyinat almışdı. Asif Cəbrayılov göstərir ki, böyük sahələrə başqa millətlərdən olan kadrlar kuratorluq edirdi: «Onun valideynləri Moskvada yaşayırdı. Boru-prokat müəssisəsi ərazisinə görə, işçilərin sayına görə Sumqayıtda ən böyük müəssisələrdən biri idi. Həmin dövrdə məhz bu zavodda çoxlu erməni var idi» (14–16).

Onun qohumlarının bir hissəsi Ermənistanda, bir hissəsi isə Moskvada yaşayırdı. İstintaqa məlum idi ki, nömrəsiz avtomobillərdə armatur parçalarını və daşları məhz xeyli erməninin işlədiyi boru-prokat zavodunda kəsib hazırlamış və küçədə, o cümlədən avtovağzalın yanında Qriqoryanın qardaşı Albertin və başqa bir yerli olmayan ermənininin köməyi ilə adamlara paylamışdılar. Asif Cəbrayılov davam edir: «O meydana cinayətkar qruplar üçün naməlum şəxslər tərəfindən müxtəlif nömrəsiz maşınlarda daş parçaları, eyni həcmdə kəsilmiş armaturlar gətirib paylayırdılar. Sonradan biz məlumat aldıq ki, bu daşlar və armatur hissələri boru-prokat zavodunda kəsilib naməlum şəxslər tərəfindən gətirilib. Sergey Ohanesyan həmin zavodun kuratoru idi. Bütün bunlar – iğtişaşlar zamanı naməlum şəxslər tərəfindən daş, armaturların gətiril-



**ASİF CƏBRAYILOV**

**Sumqayıt hadisələri zamanı DTK-nın Sumqayıt şəhər şöbəsinin əməliyyat müvəkkili**

məsi və s. bu şəxslərin əvvəlcədən iğtişaşlara hazırlıqlı, hadisələrin baş verəcəyi barədə məlumatlı olmasından xəbər verir» (14–16).

Belə məlum olur ki, Eduard Qriqoryanın DTK-dan olan kuratoru da elə erməni Sergey Ohanesyan idi. Eyni ölçüdə kəsilmiş və soyuq silah kimi paylanmış armatur parçaları da Ohanesyanın kurator, Dervoyed soyadlı bir nəfərin isə direktor olduğu boru-prokat zavodundan gətirilmişdi. «Talançıların çoxunda zavodlarda ucu itilənmiş armatur hissələri və boru kəsikləri var idi ki, onlar açıq-aşkar əvvəldən hazırlanmışdı» (207, 61; 226).

Azərbaycana münasibəti heç də yaxşı olmayan Viktor Krivopuskov «Qiyamçı Qarabağ» kitabında «Sumqayıtın nəticələri əvvəlcədən müəyyənləşmişdi» adlı hissədə yazırdı: «Mənim xidmət yoldaşlarım: polkovniklər Tkaç və Qudkov 1988-ci il fevralın 27–29-da Sumqayıtda baş vermiş cinayətlərin açılmasında iştirak etmişdilər. Onların hər ikisi çoxsaylı şahidləri sorğu etmişdilər. Ölkənin ən yaxşı xəfiyyələrinin istintaqa təqdim etdiyi və talanın, qətllərin əvvəlcədən təşkil edildiyini sübut edən faktlar az deyildi. Kütləvi iğtişaşlar ərəfəsində erməni ailələrinin siyahısı əldə edilmiş, yerli müəssisədə zorakılıq üçün metal çubuqlar hazırlanmışdı» (141). Həm də təkcə armaturlar deyil, binaların üzərində şəhərdə baş verənləri çəkəcək kameraların bərkidilməsi üçün ştativlər də əvvəlcədən, məhz boru-prokat zavodunda hazırlanmışdı. Bunu Əli Hə-

sənov da təsdiq edir: «Bu ştativlər, armaturların hamısı boru-prokat zavodunda kəsilmişdi, hətta bunları düzəldən fəhlələr də tapılmışdı. Fəhlələr izahatlarında: «Bizə tanımadığımız kəslər tərəfindən sifariş verilən armaturların pulu əvvəlcədən ödənilmişdi. Ştativlərə gəldikdə isə onların məhz ştativ olduğunu bilmirdik: bizə deyirdilər, filan formada dəmir lazımdır, biz də kəsib verirdik» deyə bildirmişdilər» (14–16).

Bu fikirlər akademik Ziya Bünyadovun 1989-cu ilin yanvarında dərc olunmuş «Nə üçün Sumqayıt?» məqaləsində də öz əksini tapıb: «Sumqayıt faciəsi erməni millətçiləri tərəfindən ciddi şəkildə planlaşdırılmışdı. Onun başlanmasına bir neçə saat qalmış gizli olaraq şəhərə erməni tele və fotorepartyorlar gəlmişdilər və onlar artıq gözləyirdilər» (93). Talançı qrupa rəhbərlik edən E.Qriqoryan da, talanda istifadə edilmiş armatur parçaları da Ohanesyanın kurator olduğu boru-prokat zavodundan çıxmışdı. DTK böyük zavodlarda kimin kurator olmasına mühüm əhəmiyyət verirdi. Odur ki, bütün çoxminlik zavodlarda DTK nəzarətçisi kimi erməni və rusları təyin edirdilər. Məsələn, kimya birliklərinə Volkov, boru-prokat zavoduna isə Ohanesyan nəzarət edirdilər. DTK-nın Sumqayıt şöbəsində cəmi iki nəfər olan azərbaycanlılar isə bir qayda olaraq, yalnız mədəniyyət sahəsində kurator olurdular.

Asif Cəbrayılov: «Orada azərbaycanlı kadrlara mühüm sahələr həvalə olunmamışdı. Ukraynadan təyinat almış və orada fəaliyyət göstərən şəxs – Volkov böyük kimya birliklərinə, Ohanesyan isə boru-prokat zavoduna rəhbərlik edirdi» (14–16).

Elə buna görədir ki, məhz bu prinsip üzrə Sumqayıtın ən böyük zavoduna və ən çox erməninin çalışdığı boru-prokat zavoduna məhz ermənini, özü də erməni millətçiliyinin yenidən baş qaldırdığı 1986-cı ildə Moskvadan birbaşa göndərmişdilər. Bəs belə olan halda talana görə məsuliyyəti nə üçün azərbaycanlılar daşımalıdır? Məhz Sergey Ohanesyan Sumqayıt boru-prokat zavodundan qaynaqlanan talana hazırlıq haqda məlumatların gizlədilməsində əsas rol oynayıb və buna görə məsuliyyət həm də onun üzərindədir. Bu məqamlar da Sumqayıt hadisələrində erməni və DTK izlərinin bütün istiqamətlərə uzandığını və kəsişdiyini göstərən çoxsaylı nümunələrdən biridir. O dövrdə SSRİ-nin ən nüfuzlu siyasi xadimlərindən biri olmuş Yakovlev deyirdi: «Əgər sizə bu işi sonadək araşdırmaq və Sumqayıt hadisələrində həqiqətdə kimin günahkar olduğunu müəyyən etmək müyəssər olsa, bu çox gözəl olar! Bu, təşkil olunmuş provokasiya idi!» (14–16)



**VLADİMİR LEBEDEV**

**Sumqayıt hadisələri zamanı Azərbaycan SSR Dövlət Təhlükəsizliyi Komitəsinin Sumqayıt şəhər şöbəsinin rəisi**

Qriqoryanın şəxsiyyəti ətrafında yaranmış vəziyyət SSRİ və Azərbaycan DTK-nın, o cümlədən DTK-nın Sumqayıt şəhər şöbəsinə məlum idi. Qriqoryanın qrupu DTK-nın Sumqayıt şöbəsinin də diqqətini cəlb etmişdi.

Azərbaycan SSR Dövlət Təhlükəsizliyi Komitəsinin Sumqayıt şəhər şöbəsinin o zamankı rəisi podpolkovnik V.N.Lebedevin Azərbaycan SSR DTK-nın o zamankı sədri İ.İ.Qorelovskiyə göndərdiyi məxfi məktubda Eduard Qriqoryan haqda məlumat verilir.

*«Məxfi – 2 nömrəli nüsxə. 17 oktyabr 1988-ci il*

*Azərbaycan SSR-in Dövlət Təhlükəsizliyi Komitəsinin sədri general-mayor, yoldaş Qorelovskiyə. Bakı şəhəri.*

*Eduard Robertoviç Qriqoryan bu ilin fevralında Sumqayıt şəhərində baş vermiş kütləvi iğtişaşların təşkilatçılarından və fəal iştirakçılarından biri olub. Dindirmə zamanı Qriqoryanın qrupunun üzvləri ifadə veriblər ki, talan və qətllər başlamazdan əvvəl o, erməni millətindən olan şəxslərlə görüşüb, onlardan narkotik təsirli həblər alıb və sonra bunları qrup üzvlərinə paylayıb. Həbsdə olan Qriqoryan belə bir fikirlə yaşayır ki, həyat yoldaşı vasitəsilə Dağlıq Qarabağdakı əlaqələrini fəallaşdırsın və özünün istintaqdakı davranışı ilə bağlı onlara məlumat versin. Odur ki, Qriqoryan haqda istintaqın materiallarını, o cümlədən onun təşkilatçı rolu haqda sübutları aşkarlamağı, eyni vaxtda Qarabağ komitəsinin Sumqayıt hadisələrində iştirakı məsələsini dərindən öyrənmək üçün Ermənistan SSR DTK-sı və DTK-nın Dağlıq Qa-*

*rabağ Muxtar Vilayəti şöbəsi ilə kordinasiyada əməliyyat istintaq qrupu yaratmağı məqsədəuyğun hesab edirəm.*

*Azərbaycan DTK-nın Sumqayıt şəhər şöbəsinin rəisi podpolkovnik V.N.Lebedev» (8, 95–96).*

Göründüyü kimi, DTK-nın Sumqayıt şəhər şöbəsinin rəisi podpolkovnik Lebedev Eduard Qriqoryanın Qarabağdan gəlmiş ermənilərlə görüşdüyü haqda məlumatı yuxarı instansiyalara göndəribmiş. Eduard Qriqoryanın qrupunun üzvləri də onun əvvəllər tanımadıqları Kamo adlı erməni ilə görüşdüyünü hələ 1988-ci ildə təsdiqləmişdilər.

Nizami Səfərov həbsxanada verdiyi müsahibədə də göstərir ki, Eduard məni bir nəfərlə tanış etdi. Dedi ki, bu Kamodur. İndiyəcən tanımırdım mən Kamonu. O, təklikdə Kamo ilə danışdı.

Sual: – Siz Kamonu əvvəllər görmüşdünüz?

Cavab: – Xeyr. Mən onu heç vaxt görməmişdim.

Məsələ ondadır ki, Eduard Qriqoryanın hadisələr ərəfəsində və hadisələrin başlandığı gün iki dəfə Kamo adlı erməni ilə görüşdüyü məlum idi. Belə ki, fevralın 27-də qrup üzvləri kafedə yığışdıqları gün və fevralın 28-də talana başlamazdan əvvəl də Eduard Qriqoryan Kamo ilə görüşüb. Nizami Səfərov ifadəsində deyir: «Biz yenə orada görüşdük. Mən Kamonu gördüm. Onlar yenə təkbətək danışdılar. Sonra Edik əlində kağızla qayıtdı. Orada familiyalar, ünvanlar var idi».

Vladimir Nikitin talanların erməni millətindən olanlar tərəfindən edildiyini təsdiq edir: «Ən ağır cinayətlər ermənilərə qarşı törənmişdi. Bəs bunları kim edirdi?! Elə həmin millətin nümayəndələri! Bu bizi hədsiz təəccübləndirirdi. Yenə də təkrar edirəm, hədsiz təəccüblənmişdik». DTK-nın Sumqayıt şöbəsinin rəisi olmuş Vladimir Lebedev də talanı məhz ermənilərin təşkil etdiyini dolayısı ilə təsdiqləyir. «Həmin vaxt Sumqayıtda 18000 erməni yaşayırdı ki, onların arasında olan zəngin ailələrin əksəriyyəti «Krunk» təşkilatının üzvü idi. 18000 ermənidən 1500-ü əvvəllər məhkum olunmuş və əllərində odlu, həmçinin soyuq silah olanlar idi. Sizcə, kimi kimdən qorumaq lazım idi?!» (14–16)

Göründüyü kimi, SSRİ-nin DTK orqanları Eduard Qriqoryan haqda hər şeyi bilirdi. Amma bütün bu yazışmalar DTK-nın ən yuxarı eşelonlarında laqeyd qarşılanırdı. DTK təşkilatçıları axtarmaq niyyətindən uzaq idi. Halbuki talanın məhz təşkilatçılarının üzə çıxarılması, iş bölgüsünə görə DTK-nın üzərinə düşürdü. Bunu Kaliniçenko da təsdiq edir: «İşin istintaqı belə bölünmüşdü: milis oğurluq və talanları, biz ölüm hal-



NİYAZİ VƏLİXANOV

**1988-ci ildə Oryol vilayət Prokurorluğunun böyük müstəntiqi, SSRİ Prokurorluğunun Sumqayıt hadisələrini araşdıran istintaq qrupunun üzvü**

larını araşdırmalı, DTK isə iğtişaşın təşkilatçılarını müəyyənləşdirməli idi» (14–16). Təşkilatçıların araşdırılması üçün Pavel Kondratyeviç Xodenkovun və Aleksey Alekseyeviç Xripkovun rəhbərliyi ilə 16 nəfərdən ibarət qrup da yaradılmışdı. Lazımi ifadələr həmin qrupa təşkilatçıların axtarılması üçün göndərilirdi.

Niyazi Vəlixanov deyir: «Eduard Qriqoryanın əlaqələrinin (söhbət həm iğtişaşlar zamanı onun ünsiyyətdə olduğu, həm də ifadələrə görə həmin şəxslərin sumqayıtlı olub-olmaması şübhə altında olan adamlardan gedir – İ.M.) müəyyən edilməsi üçün o vaxt həm istintaq, həm də əməliyyat tapşırıqları verilirdi, istintaq hərəkətləri aparılırdı. Yenə də bu əməliyyat tapşırıqları həmin o işlə məşğul olan qrupa göndərilirdi. Lakin DTK-nın Sumqayıta ezam etdiyi şəxslər təşkilatçılarla bağlı istintaqçıların qaldırdıqları məsələləri araşdırmırdılar. Və sorğular cavabsız qalırdı» (14–16).

Kaliniçenko qeyd edir ki, talanların birbaşa iştirakçısı olmuş kəsləri dindirdiyi zaman onlar kütləni idarə edənlərin əlamətlərini təsvir edirdilər. Sonra təsvir edilən şəxslər barəsində arayış almaq üçün sorğu göndərirdi ki, filan adamın dediyinə görə, həmin kəslər filan görünüşə malikdir, əyinlərində filan-filan geyim var. Bu sorğulara təxminən belə cavablar alınırdı: «Tərəfimizdən aparılan çevik tədbirlər nəticəsində həmin kəslərin müəyyənləşdirilməsi mümkün olmadı» (14–16).



**MƏNSUR İBAYEV**

**Qriqoryanın qrupunun məhkəmə prosesinin hakimi**

Yeri gəlmişkən, Kaliniçenkonun DTK-nın təşkilatçılar və Qriqoryanla əlaqədə olmuş erməni vasitəçilərlə bağlı istintaqçıların sorğularını müxtəlif bəhanələrlə rədd etmələri haqda sözlərini 1988-ci ildə Azərbaycan DTK-nın Sumqayıt şəhər şöbəsinin cəmi iki azərbaycanlı əməliyyat müvəkkilindən biri olmuş Asif Cəbrayılov da təsdiqləyir. Oxşar vəziyyətlə o da dəfələrlə üzləşmişdi. Asif Cəbrayılov: «Bütün hallarda Moskva DTK-dan gəlmiş yüksək rütbəli zabitlərə məruzələr edilirdi. Biz öz tərəfimizdən bu məruzələri edərkən onlar deyirdilər: «Bizim tərəfdən bu məsələlərə aydınlıq gətiriləcək». Çox təəssüflər olsun ki, bir neçə gün keçdikdən sonra onlar bizə bildirirdilər ki, «bu məlumatlar təsdiq edilmədi, tapılmadı», yaxud «prosesə heç bir aidiyyəti yoxdur» (14–16).

Baş vermiş cinayətin arxasında özünü büruzə verən, amma araşdırılmamış məqamlar haradasa təşkilatçıların olduğunu demək üçün məhkəməyə də əsas vermişdi. Təşkilatçılar hakimi də maraqlandırmışdı.

Qriqoryanın qrupunun məhkəmə prosesində hakim olmuş Mənsur İbayev göstərir: «Biz məhkəmədə müəyyən etdik ki, həmin işin istintaqı onlar tərəfindən, demək olar ki, qərəzli, birtərəfli, qeyri-obyektiv aparılır. Həmin istintaqda bu hadisənin təşkilatçılarının müəyyən edilməsi üçün heç təşəbbüs belə göstərilməmişdi. Mən deyərdim ki, onlar şüurlu surətdə bu hadisənin təşkilatçılarının erməni olduqlarını gizlədirdilər. Tarixə düşməsini istəmirdilər. Lakin biz məhkəmədə müəyyən etdik ki, doğrudan da, bu hadisənin təşkilatçıları ermənilərdir» (14–16).



**HACƏLİ HACƏLİYEV**

**1988-ci ildə Sumqayıt talanları zamanı DTK-nın Sumqayıt şəhər şöbəsində əməliyyat müvəkkili**

Qriqoryanın həbsi haqda azərbaycanlı əməliyyatçılarda məlumat var idi. O zaman əməliyyat müvəkkili olmuş Hacəli Hacəliyev qeyd edir ki, «Paşa» ləqəbli Qriqoryan Eduard Robertoviç barəsində məlumat alaraq bu barədə SSRİ DTK-nın Sumqayıt hadisələri üzrə əməliyyat sahəsinə rəhbərlik edən Popov Yevgeni Alekseyeviçə məlumat vermişdi. Amma Popov onun bu məlumatına şübhə ilə yanaşmışdı.

H.Hacəliyev göstərir ki, ayın 27-də Moskvadan böyük bir əməliyyat qrupu Sumqayıt şəhər şöbəsinə gəlmişdi. Onlara Qriqoryan haqda bildirəndə, onlar sərt reaksiya verdilər ki, guya, belə bir şey ola bilməz – erməninin belə bir hadisədə iştirakı mümkün deyil! Lakin o həbs olunandan sonra onlar belə, təhqiqatın aparılmasına məcbur oldular. Bundan sonra Eduard Qriqoryanla bağlı qeydiyyat-əməliyyat işi açılıb və əməliyyatın gedişində onun hadisələr ərəfəsində Sumqayıt sakini olmayan naməlum şəxslərlə intensiv şəkildə görüşdüyü bəlli olub. H.Hacəliyev daha sonra qeyd edir ki, motivləri aydınlaşdırarkən, hadisələr ərəfəsində, təxminən 1–2 ay qabaq Qriqoryanın yanına Sumqayıt sakini olmayan şəxslərin gəlib-getdiyi, onların məxfi şəraitdə Qriqoryanla görüşüb uzun-uzadı məzmunu məlum olmayan söhbətlər apardığı barədə məlumatlar daxil oldu. Daha sonra Eduard Qriqoryanın onunla həbsdə olmuş, əslən Qarabağdan olan Osipyan soyadlı bir şəxslə hadisələr ərəfəsində dəfələrlə görüşüb uzun-uzadı söhbətlər apardığı məlum olub. H.Hacəliyev: «Sorğuların birində onunla

birlikdə həbsdə olmuş Osipyan familiyalı bir erməni barəsində məlumat əldə etmişdik. Həmin erməni özü Dağlıq Qarabağdan idi – Xankəndi şəhərindən. Biz o vaxt DTK-nın Stepanakert şöbəsinə də bir sorğu göndərdik, belə bir cavab aldıq ki, «burada qeydiyyatda belə bir adam yoxdur və yaşamır!» – sorğulara, adətən, belə neqativ cavablar gəlirdi» (14–16).

Əməliyyatçılar Maşa Petrosyan adlı qadını da axtarıb. Əməliyyat sənədlərində qeyd edilir ki, onun sorğulanmasından Qriqoryan çox ehtiyat edirdi (8).

Cinayətin əsas iştirakçılarından olan Aleksandr Dralev, Vadim Muravyov, İqor Ağayev, Aleksandr Vorobyov və b. da məsuliyyətdən yaxa qurtarmışdılar. İstintaq yalnız azərbaycanlıları axtarırdı (30, 148–149).

Eduard Qriqoryanın Özbəkistanda islah-əmək koloniyasında cəza çəkdiyi məlum olduqda onun əlaqələrini müəyyənləşdirmək üçün Hacəliyev Özbəkistanın müvafiq orqanlarına sorğu göndərmək qərarına gəlir, lakin SSRİ DTK-dan gəlmiş nümayəndələr həmin sorğunu müxtəlif bəhanələr gətirərək imzalamaqdan və göndərməkdən imtina etmişdilər. Bunu H.Hacəliyev də təsdiq edir: «Mən belə bir sorğu hazırlamışdım və o vaxt SSRİ DTK-dan gəlmiş, əməliyyat qrupuna rəhbərlik edən polkovnik Popov Yevgeni Alekseyeviçə müraciət etdim. Dedim ki, belə bir sorğu hazırlamışam. O, çox sərt reaksiya verdi və imzalamağa, bir növ, etiraz etdi. Lakin bununla belə, biz o sorğunu göndərdik. Lakin tam cavab ala bilmədik! Ümumiyyətlə, o vaxt göndərilən sorğulara reaksiya çox neqativ idi» (14–16).

Vladimir Kaliniçenko, Niyazi Vəlixanov, Asif Cəbrayılov və Hacəli Hacəliyevin üst-üstə düşən ifadələrində üç mühüm məqam öz təsdiqini tapır:

– Birincisi, DTK təşkilatçıları nəinki axtarmırdı, əksinə, onları örtbasdır edirdi;

– İkincisi, E.Qriqoryanın Dağlıq Qarabağdakı millətçi ermənilərlə əlaqəsi var imiş;

– Üçüncüsü, Sumqayıt hadisələrinin təşkilində adıçəkilən əksər ermənilərin izi Özbəkistana gedir və orada itir. Qriqoryanla əlaqəli olduğu bildirilən və istintaqçıların axtardığı Osipyan, Sərkisyan və Çatıryanın izləri məhz Dağlıq Qarabağdan başlayır və Sumqayıtdan keçərək Özbəkistana, Daşkəndə aparırdı. Amma bu izlər axtarılmadı. Məsələn, Qriqoryanın həyat yoldaşı Rita Qəhrəmanyanın ifadəsində belə bir məqam var. Hadisələrdən bir neçə gün əvvəl axşam Eduard Qriqoryan və həyat yoldaşı,

milliyyətcə erməni olan Rita Qəhrəmanyan evə qayıdarkən küçədə iki nəfər onlara yaxınlaşıb 30-cu kvartalın hansı tərəfdə olduğunu soruşublar. Eduard Qriqoryan həyat yoldaşından geri qalaraq onlarla söhbət edib. «Edik mənə dedi ki, irəli gedim. Hündürboy, möhkəm bədənli adam Edikdən soruşdu ki, 30-cu kvartalda nə baş verir. Edik dedi ki, bilmir. Xarici görkəmindən və söhbətdən görünürdü ki, onlar Sumqayıtdan deyillər. Həm də rus dilində aksentsiz danışırdılar. … Küçədə bizdən başqa da adamlar var idi. Amma onlar məhz bizə yaxınlaşdılar» (230).

Rita Qəhrəmanyanın ifadəsində onun diqqətini cəlb etmiş daha bir maraqlı məqam var. O deyir: «Arıq oğlan Ediklə danışdığı müddətdə daim gülümsəyirdi. Hündürboy isə özünü içmiş kimi göstərirdi». Bu məqamlar göstərir ki, çox böyük ehtimalla həmin adamlar narkotikin təsiri altında olublar.

Eduard Qriqoryan isə həyat yoldaşını evə qoyduqdan dərhal sonra evdən çıxaraq geri qayıdıb.

N.Vəlixanov bildirir: «Qriqoryanın arvadı Rita Qəhrəmanyan hadisələrdən bir gün əvvəl axşamüstü evə qayıdanda evin yaxınlığında bir neçə qara plaşlı adam gördükləri barədə ifadə vermişdi. Əri Eduard onları görəndə Ritanın yanından ayrılıb həmin adamlara yaxınlaşmış, nə barədəsə söhbət eləmişdilər. Rita Qəhrəmanyan dedi ki, onların şəxsiyyətini tanımır, bundan əvvəl onları görməyib və həmin adamların, həqiqətən də, sumqayıtlı olub-olmaması onun üçün şübhə altındadır» (230).

Yeri gəlmişkən, Lebedevin Qorelovskiyə yazdığı məktubda ermənilərin yaratdığı «Qarabağ» komitəsinin Sumqayıt hadisələrinə aidiyyətini təsdiq edən arxiv sənədləri var. Məsələn, Azərbaycan DTK-nın əməliyyat işçilərinin işçi yazışmalarında da maraqlı bir fakt meydana çıxıb. Azərbaycan DTK-nın 1-ci şöbəsinin 2-ci bölməsinin əməliyyat müvəkkilləri Əmiraslanov Ə.Q. və Əsədullayev Ə.Q. işçi yazışmalarda yazırlar ki, onlar Sumqayıtdakı avtonəqliyyat istehsalat birliyində olarkən Birliyin rəisi Nadirov M.A. Musaelyan soyadlı bir nəfər haqda danışıb. Musaelyan yaxın ətrafının yanında deyibmiş ki, Sumqayıt hadisələrindən xeyli əvvəl erməni millətindən olan şəxslərdən Komitənin fonduna hərədən 25 rubl pul yığırdılar.

Yeri gəlmişkən, dəfələrlə xatırlayacağımız arvadı erməni olan Sumqayıt sakini Konstantin Pxakadze məhz Qarabağ komitəsinin üzvü idi və komitənin tapşırıqlarını yerinə yetirdiyini sonralar etiraf etmişdi (11, 330–331; 230).

Başqa tərəfdən, Sumqayıtda yaşayan ermənilərin əksəriyyəti Azərbaycanın ermənilərin kompakt yaşadığı Dağlıq Qarabağ ərazisindən gəlmiş şəxslər idi. Onlar Sumqayıtda yaşayan ermənilərin, demək olar ki, əksəriyyətini təşkil edirdilər və Dağlıq Qarabağla sıx əlaqəli idilər. İfrat millətçi erməni «Qarabağ» təşkilatının Sumqayıtda yaşayan ermənilərdən pul yığması, pul verməyənləri isə cəzalandırmaları xeyli məntiqlidir.

Nəhayət, Moskvadan gəlmiş istintaq qrupu Qriqoryanın dəstəsinin üzvü olan Nadir Nəcəfovun «mayor» ləqəbli bir erməni dərzi ilə əlaqələrini də araşdırmayıb. Halbuki Nadir Nəcəfov 3 mart 1988-ci il tarixli ifadəsində onların – yəni Qriqoryan, Gəncəliyev və Nəcəfovun yaşadıqları evin birinci mərtəbəsində atelyenin fəaliyyət göstərdiyini və orada «mayor» ləqəbli bir erməni dərzinin işlədiyini, həmin erməninin onlarla çox yaxın münasibətlərdə olduğunu demişdi. Dərzinin nə üçün «mayor» ləqəbi daşıdığı və kriminal keçmişə malik bu üç nəfərlə nə üçün yaxşı münasibətdə olduğu yoxlanmayıb. Ancaq bu fakt belə deməyə əsas verir ki, bu qrupun əlaqəsi təkcə E.Qriqoryanla olmayıb və başqa bir erməni də onlarla sıx əlaqədə olub. Qəribədir ki, ermənilərlə bu qədər yaxın olan bu qrup ən qatı antierməni hərəkətlərə yol vermişdi. Ancaq Moskvadan gəlmiş istintaq qrupunu daha çox azərbaycanlılar maraqlandırırdı. Moskvadan gəlmiş istintaq qrupunda Xaçaturyan adlı erməni bu işdə xüsusi fəallıq göstərirdi. Asif Cəbrayılovun verdiyi məlumata görə, bu qrupun içində erməni millətindən olanlar da var idi. Xaçaturyan Moskva DTK-da fəaliyyət göstərən zabit idi. Bu zabitin azərbaycanlılara qarşı çox neqativ münasibəti var idi və onun fəaliyyəti barədə mütəmadi olaraq qrupun rəhbərliyinə şikayətlər edilirdi. «O, azərbaycanlılara qarşı qeyri-qanuni hərəkətlər edir, təhqiramiz sözlər deyirdi. Bu bizim qürurumuza dəyirdi, bu barədə müraciətlər edəndə vəd verirdilər ki, onun haqqında tədbir görəcəklər. Ancaq heç bir tədbir görülmürdü. O, Sumqayıtda gənclərin qanunsuz olaraq saxlanılmasına rəhbərlik edirdi. Baxmayaraq ki, bu gənclərin hadisələrə aidiyyəti var-yoxdur, aparırdılar. Qadınlara təhqiramiz münasibət göstərirdilər. Kontrmaterialların toplanmasında Xaçaturyanın əli var idi» (14–16).

Sumqayıt talanlarından xeyli müəmmalı izlər Stepanakertə və Yerevana gedirdi.

İbadət Səfərəliyev göstərir ki, onun qrupunda 3 erməni var idi. Mən onları üzdən tanıyırdım. Onlar kütləni arxalarınca səsləyərək ermənilərin

yaşadıqları ünvanlara istiqamət verir və evlərə qalxmağa çağırırdılar. Onlar evləri talan edir, əşyaları yandıraraq eyvandan aşağı tullayırdılar. Sonra digər binaya istiqamətlənib orada 3 kişini öldürdülər.

Sumqayıt talanlarını gözü ilə görmüş və talançıların mənzilinə hücum etdiyi şəxslərdən biri – Melkumyan Roza Antonovna Yerevanda dindirilmə zamanı ifadə verərkən maraqlı bir məqama toxunub. Bu məqam talanlarda Edurad Qriqoryandan başqa bir erməni izinin də meydana çıxmasına səbəb olur. Roza Melkumyan artıq Yerevanda olarkən verdiyi və ermənilərin yaratdığı Sumqayıt.info internet saytında yerləşdirilmiş müsahibədə deyir: «Hətta biz Yerevan ləhcəsində onlar kimi danışa bilmirik. Üç-dörd nəfər oğlan erməni dilində danışır və deyirdi: «Yox, biz ona görə gəlməmişik ki, onları sağ saxlayaq. Biz gəlmişik ki, hər şeyi yandıraq, yaxud onları öldürək. Biz onları buraxmayacağıq» (231). Həmin vaxt azərbaycanlıların öz aralarında erməni dilində, özü də Yerevan ləhcəsində danışmaları qeyri-mümkün idi. Əvvəla ona görə ki, həmin adamların ermənilərə münasibəti pis olmalı idi. Başqa tərəfdən, azərbaycanlılar həmin vaxt Ermənistanın rayonlarında yaşayırdılar. Roza Melkumyanın açıqladığı bu məqam talançılar arasında erməni dilində danışanların olduğuna şahidlik edən yeganə ifadə deyil. Gözdən əlil olan Esiyan Levon 22 sentyabr 1988-ci ildə verdiyi ifadədə ona hücum edən şəxslər haqda deyir: «Xatırlayıram ki, erməni dilində söyürdülər. Özü də erməni dilində təmiz, aksentsiz danışırdı, bu adam erməni dilində sərbəst danışırdı. Mən bu səsi tanıya bilmərəm, səs çox idi, ona görə də səsi tanımaqda çətinlik çəkirəm» (11, 136).

Başqa bir erməni millətindən olan şəxsin adı DTK-nın yazışmalarında əks olunub. 1988-ci il avqustun 23-də Azərbaycan DTK-da fəaliyyət planı təsdiqlənir. Planda deyilir ki, «Sumqayıt talanlarında təşkilatçı kimi iştirak etmiş Eduard Qriqoryan talanlar ərəfəsində Stepanakert şəhərinin sakini Sərkisyan Suren Yuryeviçlə görüşüb. Sərkisyan əvvəllər Qriqoryanla bir yerdə cəzaçəkmə müəssisəsində cəza çəkib. Qriqoryan ermənilərin siyahısını və narkotik təsirli həbləri ondan alıb və daha sonra həmin həbləri iğtişaş iştirakçılarına paylayıb». Daha sonra qeyd olunur ki, materialların analizi belə deməyə əsas verir ki, Qriqoryanın Dağlıq Qarabağın erməni icmasının ekstremist nümayəndələri ilə əlaqəsi var və bu əlaqəni yoxlamaq üçün Sərkisyanın əvvəlki yaşayış yeri, xidməti və cəzaçəkmə yerləri haqda məlumatları yoxlamaq lazımdır. Bununla da əməliyyat-axtarış təd-

birləri ilə təşkilatçıların izinə düşməyə çalışır (9, 87–88). Bu plan əsasında hərəkət edən Azərbaycan SSR DTK-nın Sumqayıt şəhər şöbəsinin rəisi podpolkovnik Lebedev Dağlıq Qarabağ Muxtar Vilayətinin DTK şöbəsinin rəisi Voykoya məktubunda Sumqayıt talanlarında iştirak edən Qriqoryanla əlaqəli olmuş Sərkisyan Suren Yuryeviç adlı şəxsi tapmaqda ondan kömək istəyir: «Məxfi. Azərbaycan SSR DTK-nın DQMV şöbəsinin rəisi yoldaş Voykoya. Stepanakert şəhəri.

Bizdə olan məlumatlara əsasən Stepanakert şəhərində Sumqayıt şəhər şöbəsinin əməliyyat axtarış işinin obyekti ilə yaxın əlaqədə olan 1956-cı il təvəllüdlü, Stepanakertdə doğulmuş, Stepanakert şəhərində Pioner küçəsi, ev 4-də yaşayan Sərkisyan Suren Yuryeviç bu ilin fevralında Sumqayıt şəhərindəki iğtişaşlarda iştirak edib.

Xahiş edirik, Sərkisyan Suren Yuryeviçi müəyyənləşdirəsiniz. Şəhərlərarası danışıqlara görə ödəniş qəbzləri əsasında onun ölkənin başqa şəhərlərindəki əlaqələrini, imkan daxilində əməliyyat yolu ilə onun yaşayış yerini dəyişməsi səbəblərini müəyyənləşdirəsiniz. Tədbirin keçirilməsi zamanı xahiş edirik ki, Sərkisyanın ehtiyatlı ola biləcəyini və qeyri-leqal vəziyyətə keçməyə cəhd edəcəyini nəzərə alasınız.

DTK-nın Sumqayıt şəhər şöbəsinin rəisi podpolkovnik Lebedev V.N

31 avqust 1988-ci il» (9, 85).

10 gündən sonra Stepanakertdən cavab alan Lebedev yazır:

«Məxfi. Nüsxə №1. Arayış: Əməliyyat axtarışla bağlı yazıya Stepanakertdən verilmiş cavaba əsasən Sərkisyan Suren Yuryeviç hazırda Daşkənd şəhərində yaşayır. Stepanakertdə Pioner küçəsi, ev 4-də onun atası Sərkisyan Yuri Baxşiyeviç yaşayır. Şəhərlərarası telefon stansiyasının məlumatına əsasən onun atasının mənzilindən Daşkəndə 202 64 97 nömrəli telefona zəng olub. Bakı şəhərində isə 74 17 18 və 64 94 40 nömrəli telefonlara zəng edilib. Qardaşı Sərkisyan Sergey Yuryeviç Moskvada yaşayır. Başqa məlumat yoxdur.

10 sentyabr 1988-ci il» (9, 86).

DTK-nın əməliyyat axtarış tədbirləri bundan sonra davam etdirilməyib. Halbuki axtarış üçün Daşkənddə və Bakıda ünvanlar vardı.

Bu yazışmalar Sumqayıt talanları ərəfəsində Eduard Qriqoryanla əlaqədə olmuş, Dağlıq Qarabağdan gəlmiş bir ermənininin axtarışının aparıldığını göstərir. Amma Sərkisyanın axtarılması haqda məlumatlar, birincisi, ictimaiyyətdən gizlədilib, ikincisi, onun axtarışı heç bir izahat

verilmədən müəmmalı şəkildə dayandırılıb. Halbuki o zaman SSRİ mövcud idi və SSRİ DTK-sının sorğusu ilə Özbəkistan DTK-sı Sərkisyanı tapa və istintaqa ifadə verməsini təmin edə bilərdi.

Nəhayət, daha bir məqam. Sumqayıt hadisələrinə qədər Stepanakertdə yaşamış, Eduard Qriqoryanla əlaqəli olmuş, Sumqayıt talanları zamanı Sumqayıta gəlmiş Sərkisyan, talanlardan sonra izi itirmək üçün yaşayış yerini dəyişib və Daşkənddə məskunlaşıb. Təbii ki, bu qədər təsadüf ola bilməzdi.

Sumqayıtdan Ermənistana uzanan və Ermənistanda itib-batan istintaq izlərindən biri də Yerevandakı idman-konsert kompleksinin direktorunun avtomobili ilə bağlı olan yazışmalardır. O zaman Azərbaycan DTK-sında əməliyyat müvəkkili işləmiş Yuri Stepanoviç Qalasılkin bu hadisə haqda məlumat alaraq arayış hazırlamışdı.

Onun 1988-ci ilin martında əllə yazılaraq təqdim etdiyi arayışda göstərilir ki, Bayramov soyadlı bir vətəndaş fevralın 15–20-si arasında evə qayıdarkən Sumqayıt yaxınlığındakı Nasosnı qəsəbəsində, 94 nömrəli evin yanında ağ rəngli, qara oblisovkalı Qaz-24 markalı, 19-91 nömrəli avtomobilin dayandığını görüb. Şahid bildirib ki, avtomobilin nömrəsində seriyanı tam xatırlamasa da, onun Ermənistan seriyası olduğu yadındadır. Avtomobilin içərisində möhkəm bədənli 4–5 kişi oturmuşdu və nə isə müzakirə edirdilər. Mənbə deyir ki, o, avtomobilin yanından keçərkən həmin adamlar onu 4–5 metr baxışları ilə ötürüblər. O, əvvəllər Sumqayıtda həmin adamları görməmişdi. İkinci gün o həmin evdə yaşayan qohumlarından həmin avtomobil və adamlar haqda soruşub. Amma onlar belə bir avtomobili tanımadıqlarını və onların evində bu nömrədə avtomobil sahibinin yaşamadığını deyiblər. Qalasılkin deyir: «Bu, həqiqətən, çox maraqlı idi. Ona görə ki, erməni nömrəsi ilə maşının bu rayona gəlməsi, sadəcə, absurd idi. Dedi ki, nömrəni unutmamaq üçün onu binanın üzərində cızıb. Mən bu ifadəni dərhal nəzarətə aldım. Xüsusi xidmət əməkdaşlarımız çağırıldı və biz həmin yerə getdik. Həqiqətən, binanın üzərində maşının nömrəsi cızılmışdı».

Yuri Qalasılkinin sorğusuna Azərbaycan SSR Dövlət Avtomobil Müfəttişliyindən Azərbaycan DTK-nın 3-cü şöbəsinə daxil olmuş cavabda göstərilir ki, Qaz-24 markalı, ağ rəngli, 19-91 nömrəli avtomobil onlarda qeydiyyatda yoxdur və olmayıb. Sonra Qalasılkin qeyd edir ki, Yerevana sorğu göndərdik. Təbii ki, maşını müəyyənləşdirmək lazım idi. Yerevanda da paralel olaraq, SSRİ DTK-sı işə başlamışdı. Deməli, hər şey razılaşdı-



**YURİ QALASILKİN**

**1954-cü ildən DTK-da işləyib. Sumqayıt hadisələri zamanı əməliyyat müvəkkili olub.**

rılmış şəkildə gedirdi. Teleqramda qısa olaraq: «Xahiş edirik ki, filan nömrəli maşının sahibini müəyyənləşdirəsiz və filan-filan tarixlərdə harada olması barədə məlumat verəsiniz» – yazılmışdı. Bu məlumatın əsasında Azərbaycan DTK-nın 5-ci şöbəsinin rəisi polkovnik Sadıxov 22 mart 1988-ci ildə Ermənistan DTK-nın 3-cü şöbəsinin rəisi podpolkovnik Edilyana aşağıdakı məzmunda şifrteleqram göndərir:

***«Şifrteleqram № 2204***

*Ermənistan DTK-nın 3-cü şöbəsinin rəisi podpolkovnik A.Q.Edilyana*

*Xahiş edirik ağ rəngli 19-91 nömrəli Qaz-24 şəxsi avtomobilin sahibinin şəxsiyyətinin dəqiqləşdirilməsi haqda göstəriş verəsiniz, onun haqqında, onu xarakterizə edən məlumatları, ifşaedici materialları təqdim edəsiniz, habelə aydınlaşdırasınız ki, həmin avtomobil fevralın 15-dən 30-dək harada olub.*

*5-ci şöbənin rəisi polkovnik R.A.Sadıxov».*

Bir həftədən (22 mart 1988-ci il) sonra Yerevandan aşağıdakı məzmunda cavab şifrteleqram daxil olur:

*«Daxil olan şifrteleqram № 2512 (9, 88)*

*Məxfi. Azərbaycan SSR-in DTK-nın 5-ci şöbəsinin rəis müavini yoldaş Mirzəyevə*

*Qaz-24 markalı ağ rəngli avtomobil tərəfimizdən müəyyənləşdirilib: Ermənistan SSR-in Dövlət Avtomobil Müfəttişliyində 19-91 ARX dövlət*

*nömrəsilə qeydə alınmış avtomobil 1929-cu il təvəllüdlü, Ermənistan SSR-in Ani rayonunun Qarabert kəndində doğulmuş, hazırda idman-konsert kompleksinin direktoru işləyən Çaqikyan Robert Amayakoviçə məxsusdur. Hazırda Yerevan şəhərində yaşayır. Çaqikyanın başqa yerdə olması və 19-91 ARX nömrəli Qaz-24 markalı avtomobilin Yerevandan, şəhərdən çıxması haqda məlumatımız yoxdur. Çaqikyan Ermənistan SSR DİN-in qeydiyyatında yoxdur. Ermənistan DTK-nın 3-cü şöbəsinin rəisi podpolkovnik Edilyan A.Q».*

Beləliklə, Ermənistan DTK-sı avtomobilin sahibinin şəxsiyyətini müəyyənləşdirsə də, Azərbaycandan göndərilmiş məktubu sona qədər araşdırmaqdan praktik olaraq imtina edib. Çaqikyanın şəxsiyyəti haqda məlumatı isə ona görə gizlətmək mümkün olmayıb ki, bunu başqa kanallar vasitəsilə də yoxlamaq mümkün idi.

Y.Qalasılkin: «Təbii ki, hadisələrin sonrakı inkişafına imkan vermədilər. Axı hər bir normal düşüncəli insan anlamalı idi ki, bu nömrə göydəndüşmə deyil və bu faktı müəyyənləşdirmək lazımdır! Bax belə nüanslar bütün iş prosesi boyunca mövcud idi» (14–16).

Sumqayıt hadisələrində başqa bir erməni izi də müəyyənləşmişdi. Bu Azərbaycan DTK-nın Dağlıq Qarabağ Vilayət şöbəsində işləyən rabitəçi Çaturyan idi. Çaturyanın məhkəmə zalında dəfələrlə Qriqoryana yaxınlaşaraq onunla nə barədəsə danışması və yuxarı qalxıb dəfələrlə telefonla harasa zəng vurması diqqəti cəlb etmişdi. Ali Məhkəmənin kargüzarlıq işçiləri bu məqamı müşahidə etmişdilər və bu barədə işə prokuror kimi çıxan Aslan İsmayılova məlumat vermişdilər. Bu barədə Aslan İsmayılov özü məlumat verir: «Bir gün fasilələrin birində Ali Məhkəmənin kargüzarlıq işçiləri – 2 nəfər gənc oğlan mənə yaxınlaşdı ki: «Aslan müəllim, burada bir nəfər şəxs Qriqoryanla aşağıda söhbət etdikdən sonra qalxır ikinci mərtəbəyə və oradan harasa zəng vurur və uzun-uzadı söhbət edir».

Prokurorla kargüzarlıq işçiləri razılığa gəlirlər ki, həmin adam növbəti dəfə görünəndə birlikdə hərəkət etsinlər. 2 ya 3 gün sonra həmin şəxs yenidən Ali Məhkəmənin binasında görünür. Aslan İsmayılovla Ali Məhkəmənin əməkdaşları ona yaxınlaşıb kimliyini müəyyənləşdirmək istəyirlər: «O mənə kobud şəkildə dedi ki: «Nə olsun ki, Respublika Prokurorluğunun əməkdaşısınız, mən sizə hesabat verməli deyiləm!» Onda mən həmin o gənclərə dedim ki, kömək eləyin, bunu aparaq! Gənclər dərhal mənimlə bir yerdə onun qolundan yapışdılar. Onda bir az təşvişə

düşdü. Dərhal başladı ki: «Siz niyə qanunu pozursuz, hara aparırsız?» – başladı çığırmağa. Dedim: «Ali Məhkəmənin sədrinin otağına!» Onda sakitləşdi. Əlini saldı cibinə, vəsiqəsini göstərdi. Vəsiqədə Azərbaycan DTK-nın əməkdaşı kimi qeyd edilmişdi. Familiyası Çaturyan idi. Gətirdik onu Hüseyn Talıbovun həmin mərtəbədə yerləşən otağına» (14–16).

Araşdırmalar göstərir ki, bu Çaturyan Levon Akopoviç idi. O, DTK-nın Dağlıq Qarabağ şöbəsində, Stepanakertdə işləyirdi. DTK işçisi olması ona maneəsiz hərəkət etmək imkanı yaradırdı. Çaturyanın da izi başqa əlaqəli ermənilər kimi Dağlıq Qarabağda itir. Çaturyanla bağlı məqam da Dağlıq Qarabağdakı qüvvələrin Sumqayıt hadisələri və Qriqoryanla əlaqəli olduqlarını göstərir.

Dağlıq Qarabağın erməni icmasının yaratdığı «Qarabağ» komitəsinin Sumqayıt talanları ilə əlaqələrini göstərən bir fakt da əvvəl Sumqayıtda yaşamış, sonra Ermənistanın Abovyan şəhərinə köçmüş, «Qarabağ» komitəsinin fəal üzvlərindən olmuş Konstantin Mixayloviç Pxakadze adlı bir şəxs haqqında arxivlərdə qalmış sənəddir. Sənəddə yazılıb:

*«Məxfi*

*I nüsxədə*

*Ermənistan SSR DTK-nın 6-cı şöbəsinin rəisinə*

*Pxakadze haqqında*

*Sumqayıt şəhər şöbəsində olan məlumata əsasən 1957-ci il təvəllüdlü, orta təhsilli, heç bir partiyanın üzvü olmayan, milliyyətcə gürcü, son iş yeri superfosfat zavodunda montyorluq olmuş, hazırda Abovyan şəhərində yaşayan Konstantin Mixayloviç Pxakadze fevral hadisələrindən dərhal sonra Sumqayıtdan çıxıb. Son dövrdə yenidən 3 dəfə Sumqayıtda olub. Agentura məlumatlarına əsasən Pxakadze çox aqressiv ovqatdadır və yaxın ətrafındakı adamlara deyib ki, Sumqayıt əhalisi fiziki məhv olmağa qədər, etdiklərinə görə cəzalanmalıdır. Pxakadze Sumqayıtdakı kimyəvi obyektlərin mühafizəsi sistemini öyrənirmiş. Söhbət zamanı Pxakadze dedi ki, o, Qarabağ komitəsinin fəallarındandır və Sumqayıta komitənin rəhbərlərindən biri olan yazıçı Samvel Şahmuradyan tərəfindən məlumat toplamaq üçün göndərilib və ona ezamiyyə xərcləri də ödənilib.*

*Azərbaycan SSR DTK-nın Sumqayıt şəhər şöbəsinin rəisi podpolkovnik V.Lebedev»* (11, 330–331).

Lebedevin bu sorğusuna əvvəlki sorğular kimi, bu dəfə də Ermənistan SSR DTK-dan heç bir cavab verilmir.

Niyazi Vəlixanovun sözlərinə görə, Ermənistanda ekstremist qrupların, həmçinin «Krunk» təşkilatının Sumqayıtda yaşayan bu və ya digər şəxslərlə əlaqəsinin olub-olmaması barədə Ermənistan Dövlət Təhlükəsizlik Komitəsinə də sorğular verilir, cavablar alınırdı. Amma bir çox hallarda o cavablar tam deyildi. Ona görə də, demək olar ki, bu sahədə də iki respublikanın DTK-sının əməkdaşlığı baş tutmadı (14–16).

Bu sənəddə 3 ən mühüm cəhət var. Birincisi, Sumqayıt sakini olan K.Pxakadzenin arvadı Naira adlı erməni qadın, o özü isə qatı millətçi «Qarabağ» komitəsinin üzvü idi. Deməli, «Qarabağ» komitəsinin Sumqayıtda əlaqələri var idi və komitə Sumqayıtla maraqlanırdı və Sumqayıtda Qarabağ təşkilatının üzvləri fəaliyyət göstərirdilər. Bir müddət keçdikdən, ara sakitləşdikdən sonra Pxakadze onun adının heç yerdə hallanmadığını görüb gürcü familiyası altında yenidən Azərbaycana gələrək, «Qarabağ» komitəsinin və onun liderlərindən olan Samvel Şahmuradyanın tapşırıqlarını yerinə yetirməyi davam etdirib. Samvel Şahmuradyanın Qriqoryana alibi axtarmaq haqda tapşırıq verməsi isə istintaqçılara məlum idi.

Hacəli Hacəliyev: «Biz Sumqayıt şəhərində olan imkanlarımız vasitəsilə belə bir məlumat əldə etdik ki, o vaxt «Krunk»un rəhbərlərindən olan Samvel Şahmuradyan Qriqoryan Edikin azad olunması üçün alibi tapılması, onun, guya, bu hadisələrin qurbanı kimi qələmə verilməsi barədə sübutlar hazırlamaq istəyib, göstərişlər vermişdi. Ermənilər də onun bu hadisələrdən kənarlaşdırılması üçün sübutlar axtarırdılar» (14–16).

Ümumiyyətlə, istintaq materiallarında tez-tez belə ifadələrə rast gəlinir: «sumqayıtlı olmayan», «qara plaşlı», «erməni dilində danışan», «qara kombinzonlu və azərbaycanlıya oxşamayan, azərbaycanca ləhcə ilə danışan», «yalnız Qriqoryanın tanıdığı portfelli adam» və s. Hətta bəzi zərərçəkmiş ermənilərin də ifadələrində belə geyimli adamların xüsusi olaraq diqqəti cəlb etdikləri haqda məqamlar var. Bu sıravi istintaqçıların da diqqətini cəlb edirdi. Bəzi ifadələrdə, hətta istintaqçıların da həmin adamları axtardıqları, amma bu məsələnin sonuna çata bilmədikləri məlum olur.

Sumqayıt hadisələri zamanı DTK-nın Sumqayıt şöbəsinin əməliyyat müvəkkili olmuş Asif Cəbrayılov göstərirdi ki, hadisələrin elə birinci günü nömrəsiz minik avtomobilləri, qara plaşlı şəxslər barədə informasiyalar daxil olurdu. «Hadisələrin gedişatı göstərdi ki, iğtişaşlar baş verdikdən sonra bu şəxsləri Sumqayıt şəhərinin müxtəlif məhəllələrində görənlər oldu və bu barədə bizə məlumatlar verildi» (14–16).

Kaliniçenko: «Hadisələrin təşkilatçısının kim olduğu sualına Qriqoryan cavabından savayı heç nə almadıq! Mənim işin obyektiv aparıldığına bir qədər şübhəm var idi. ... Düşünürəm ki, bu suala konkret cavab tapılmadı. «Niyə tapılmadı?» sualına «imkan yox idi» cavabı verilə bilər. Lakin şəxsən mən cavaba inanmıram! Fikrimcə, kifayət qədər imkan var idi. Çünki əlamətlər və yetərincə faktlar mövcud idi» (14–16).

Niyazi Vəlixanov A.Cəbrayılovun fikirlərini təsdiq edir: «Qara plaşlılar» barəsində də məlumatlar daxil olurdu, onların şəxsiyyətinin müəyyən edilməsi üçün yenə də əməliyyat tapşırıqları verilirdi, ancaq o işlərin hansı qaydada həll olunması və onların nəticəsi bizə bildirilmirdi. Katusev gələndən sonra göstəriş verdi ki, «işlər yekunlaşsın, məhkəməyə göndərilsin». Bundan sonra o məsələlər istintaq qrupu üçün maraq kəsb etmirdi. Ona görə də onun sonrakı taleyi mənim üçün aydın deyil» (14–16).

Ancaq təşkilatçılarla məşğul olmuş rusiyalı istintaqçılardan biri etiraf edibmiş ki, o Sumqayıtdakı yerli olmayan, müəmmalı şəxslərin izinə düşübmüş. Amma ona axtarışı davam etdirməyə icazə verməyiblər. Təşkilatçıları tapa bilməmələri ilə bağlı professional söhbət zamanı rusiyalı istintaqçı səmimi olub. Aslan İsmayılovun bu barədə sualına çox sərt cavab verib: «Mən qara plaşlıları müəyyən etmişəm, onların harada olduğunu da tapmışam! İş üzrə müttəhimlərə də onları təqdim etmişəm və müttəhimlər də onları tanıyıb. Onların yerini də müəyyən etmişəm – Daşkənd! Onları gedib gətirmək üçün Qalkinə müraciət də etmişəm. Sadəcə, Qalkin mənə izah edib ki, «Qorbaçovun dediklərini siz eşitməyibsiz ki, bu, Azərbaycanda «xuliqan» elementlərin işidir?! İstintaqı da bu cür yekunlaşdırmaq lazımdır!» Ona görə də istintaq bu cür yekunlaşdırıldı!» Aslan İsmayılov: «Ondan sonra, yəni Sumqayıt işi bitəndən sonra Orta Asiya hadisələri baş verəndə, həmin o polkovnikin dedikləri yadıma düşdü. Həmin adamlar, demək, orada da bu işin təşkilatçılığında idi» (14–16).

Sumqayıt hadisələrini etnik toqquşma kimi təqdim etmək olarmı? Sumqayıt hadisələrində Pavlovski və Samoylov soyadlı rus və ukraynalı gənclər də iştirak etmişdi. Fevralın 29-da isə Ohanov soyadlı bir erməni başqa bir ermənini bıçaqlayaraq yaralamışdı. İstintaq qrupunun rəhbəri Qalkin bu epizodu Sumqayıt talanları cinayətindən ayıraraq ayrıca xuliqanlıq hadisəsi kimi istintaqa göndərmişdi. Bu hadisə Sumqayıt talanının tərkib hissəsi kimi qeydə alınmamışdı. Bundan başqa, fevralın 29-da Valeri Markaryan adlı erməninin avtobusu azərbaycanlıların üstünə sürərək 4 azərbaycan-



**VLADİMİR QALKİN**

**SSRİ Baş Prokurorluğunun Sumqayıt hadisələrini araşdırmış istintaq-əməliyyat qrupunun rəhbəri**

lını öldürməsi də Sumqayıt qətlləri sırasına daxil edilməyib və ayrıca iş kimi araşdırılıb.

Sumqayıt hadisələri ilə əlaqəli olub, amma istintaqçıların araşdırmadığı Moskva, Siyasi büro tərəfindən tələsdirildikləri üçün araşdıra bilmədikləri məqamlar da var idi. Hər şeydən əvvəl, Sumqayıtda talanlar baş verən gecə bütün hadisələri çəkən naməlum operatorların kim olduğu indiyə qədər məlum deyil. Halbuki onlar sanki şəhərin hansı nöqtəsində olmağı əvvəlcədən bilirdilər. Bunu Y.Qalasılkin də təsdiq edir: «Həmin gün axşam xarici televiziyalarda bütün hadisələr nümayiş olundu. Səhəri gün müraciət tərtib etdim ki, SSRİ DTK-sına bu videoyazını əldə etmək üçün arayış göndərilsin. Orada bu işlə məşğul olan xüsusi idarə var idi. Mən başa düşürdüm ki, lenti əldə etsək, istənilən operator və rejissor kameraların harada quruldluğunu dərhal müəyyən edəcək. Fikir verin, hətta öncədən quraşdırılmış kameralar da var idi. Mənə rədd cavabı verdilər! (14–16)

Bir neçə gün sonra Sumqayıtdakı bir neçə binanın damında videokameraların qoyulması üçün əvvəlcədən yerə bərkidilmiş, qaynaq üsulu ilə düzəldilmiş ştativlər tapılmışdı. Naməlum operatorlar əvvəlcədən qoyulmuş bu ştativlərin üzərində kameralarını quraraq şəhərdə baş verənləri çəkirdilər. Əli Həsənov da bunu təsdiq edir: «Təbii, biz məəttəl qaldıq, axı hadisələr harada çəkildi, necə çəkildi? Başladıq bu məsələylə maraqlanmağa. Binaların üzərində metaldan hazırlanmış stasionar ştativlər tap-

dıq! Onları, sən demə, 3–4 ay əvvəl boru-prokat zavodunda hazırlayıblar. Orada armatur kəsilibmiş – evlərə girəndə vurmaq üçün, öldürmək üçün. Biz bu ştativləri götürdük. Bəlli oldu ki, binanın üstündə, dam örtüyündə artıq əvvəlcədən kamera qoyulmaq və çəkmək üçün stasionar ştativlər qurulub. Orada bir az gözümüz açıldı! Bildik ki, hər şey əvvəlcədən təşkil olunub» (14–16).

İstintaqın rəhbəri V.Kaliniçenko jurnalist Saveli Pereslə söhbətində demişdi: «Ümumiyyətlə, sən fikirləşmisənmi ki, damlardakı operatorlar haradan çıxmışdılar? Onlar marşrutu bilirdilər? Sən bu barədə fikirləşmisən?» (201)

Asif Cəbrayılov qeyd edir: «Biz onu saxladıq, əlində qara sumka var idi, qabağı maskalanmış idi, bağlı idi, içərisində kamera vardı. Onu gətirib maşına mindirdik. Şöbədə araşdırdıq, şəxsi araşdırma qrupuna təqdim etdik. Sonradan götürüb apardılar və onun haqqında bizə heç bir məlumat vermədilər» (14–16).

Həmin videokadrlar dərhal Avropa və Amerikaya göndərildi və bütün telekanallarda göstərilərək azərbaycanlılar haqda vəhşi obrazı formalaşdırmaq işinə xidmət etdi. Təbii ki, bu barədə bütün veriliş və məqalələr ermənilərin bir sualı ilə yekunlaşırdı: «Bundan sonra Dağlıq Qarabağ Azərbaycanın tərkibində necə qala bilər?» Sanki bütün çıxış edənlər məhz bu sualı səsləndirmək üçün Sumqayıt hadisələrinə münasibət bildirirdilər. Sumqayıt talanları məhz sualın bu cür qoyuluşuna xidmət etmək üçün təşkil edilmiş və törədilmişdi.

Daha bir müəmmalı məqam Sumqayıt hadisələri ərəfəsində, həmin günlərdə Ermənistandan Azərbaycana xeyli adamın gələrək mehmanxanalarında qalmasıdır. Fevralın 21-dən martın 3-dək Bakıdakı «Abşeron» mehmanxanasına Ermənistanın müxtəlif şəhərlərindən 73 nəfər yerləşdirilmişdi. Aeroport mehmanxanasında isə fevralın 25-dən martın 1-dək 30 nəfər yerləşib. Dəmiryol vağzalındakı «Bakı» mehmanxanasında 7 nəfər, «Gənclik» mehmanxanasında isə fevralın 25–26-da 3 nəfər qalıb. İşi araşdıran sovet müstəntiqlərinin planlarında mehmanxanada yaşamış erməni və azərbaycanlıları dindirmək olub. Onların işçi yazışmalarında belə qeydlər və sorğu ediləcək şəxslərin siyahısı var. Amma müstəntiqlər bu işi, ümumiyyətlə, başlamayıblar və işi məntiqi sonluğa çatdırmayıblar. Abşeron mehmanxanasında fevralın 21-dən martın 1-dək soyadı və atasının adı, doğum ili, yaşayış yeri eyni olan bir nəfər hər dəfə adını

dəyişməklə hər gün müxtəlif nömrələrdə qalıb. Bir nömrədə Şaqrayan, başqa nömrələrdə isə Şəfəq, Şafaq, Şəfayət adları ilə qeyd olunub.

Cinayət işində kütləvi iğtişaşlar dövründə azərbaycanlıları ittiham etmək məqsədilə ermənilərin öz soydaşlarına qarşı törətdiyi təxribatlara dair bir çox materiallar mövcuddur.

Araşdırma zamanı müəyyən edilmişdir ki, Sumqayıtda baş verən hadisələr dövründə ermənilər öz soydaşlarına qarşı qəsdən və ya xüsusi məqsədlə təxribatlar törədib, sonradan həmin hadisələrdə azərbaycanlıları ittiham etməyə çalışmışlar.

Məsələn, Sumqayıt şəhəri 9-cu mikrorayonda yaşayan Benik Qriqoryan ad-soyadlı bir erməni öz mənzilini, həmçinin Babayan soyadlı qohumunun mənzilini yandırmış, sonra bunun Fəxrəddin Quliyev ad-soyadlı bir azərbaycanlı tərəfindən törədilməsi barədə yalan məlumat vermişdi. Araşdırma zamanı həmin ermənilərin evlərinə baxış keçirilərkən məlum olmuşdu ki, faktiki olaraq boş mənzillər yanmışdır. İstintaq qrupunun üzvləri bu hala diqqət yetirdikdə Benik Qriqoryan onlara rüşvət təklif etmişdi. Amma SSRİ Baş Prokurorluğunun istintaq qrupu həmin fakta heç bir hüquqi qiymət verməmişdi. Bundan əlavə, aparılmış istintaqla müəyyən edilmişdi ki, bəzi hallarda Sumqayıt şəhərində ermənilərə qarşı törədilmiş cinayətlərin miqyasını süni surətdə şişirtmək və sonradan həmin cinayətləri azərbaycanlıların üzərinə atmaq məqsədilə ermənilər öz əmlaklarını götürüb mənzillərini boşaldaraq, köçüb gedərkən qəsdən orada yanğınlar törətmişlər. Belə ki, hadisələr dövründə 9 saylı MİS-in rəisi vəzifəsində işləmiş Abdullayev Abdulla Bəhmən oğlu ifadəsində göstərmişdir ki, rəisi olduğu MİS-in xidməti ərazisinə aid olan 9-cu mikrorayondakı 36 №-li binada Seda adlı erməni qadının yaşadığı mənzildə yanğın baş verməsi barədə məlumatla əlaqədar istintaqçılarla birlikdə hadisə yerinə getmiş, mənzilin qapısı bağlı olduğundan qapını sındıraraq ora daxil olmuş, evin tamamilə boşaldıldığını, boş otaqların birinin ortasında şəbəkədən ayrılmamış elektrik qızdırıcısının tüstüləndiyini görmüş, sonradan qonşulardan öyrənmişdir ki, evin sahibi olan erməni qadın 1–2 gün əvvəl evinin əşyalarını çıxararaq tanışlarının evinə aparmışdır. Bu barədə o (A.Abdullayev), sonradan rus müstəntiqlərinə ətraflı ifadə vermək istərkən, onlarla arasında mübahisə yaranmış, müstəntiq ondan ifadəsini dəyişməyi tələb etmiş, lakin o buna razılıq verməyərək hadisə barədə əsl həqiqəti söyləmişdir (230).

Hadisələr dövründə Azərbaycan LKGİ Sumqayıt şəhər komitəsinin 1-ci katibi işləmiş Məmmədov Eldar Əhməd oğlunun ifadəsindən görünür ki, 18-ci mikrorayon tərəfdə yerləşən 9 mərtəbəli binada bir erməninin yaşadığı mənzildə yanğın olması barədə aldığı məlumatla əlaqədar komsomol əməliyyat dəstəsinin tərkibində həmin ünvana getmiş, mənzilə daxil olarkən orada heç kimin olmadığını, otaqların birinin ortasında masanın üzərində boş bir boşqab olduğunu və masanın bir hissəsinin yandığını, ev sahiblərindən də orada heç kimin olmadığını görmüş və onları qarşılayaraq yanğını görüb söndürənlərdən biri izah etmişdir ki, mənzili yandırmaq üçün içinə neft doldurulmuş boşqaba yanan şamı qoyurlar ki, şam yanıb qurtarandan sonra neft alışıb yansın və bu yolla mənzildə yanğın baş versin.

Üçüncü müəmmalı və araşdırılmamış məqam ermənilərin öz bank hesablarını bağlamalarıdır. Sumqayıt hadisələri ərəfəsində Sumqayıtda yaşayan ermənilər 1 ay 20 gün müddətində bank hesablarında olan bütün pullarını götürüblər. Cəmi 8343691 manat pul hadisə ərəfəsində kassalardan götürülüb. Təkcə 1988-ci ilin yanvar ayında, yəni talanlara 1 ay qalmış Sumqayıt sakini olan ermənilər kassalardan 7326000 rubl pul çıxarmışdılar. Sumqayıt sakini olan 381 nəfər isə qısa müddət ərzində kassadakı bütün pullarını götürərək bank hesablarını bağlamışdılar. Bankda cəmi 40 manat əmanəti olan da, 3800 manatı olan da pulunun hamısını çıxararaq hesabını bağlamışdı. Hətta Stepanyan R.Ş. adlı bir erməni sakin iki müxtəlif hesabının ikisindən də bütün pullarını çıxararaq hər iki hesabı ləğv etmişdi. Eyni hərəkət Rüstəmyan soyadlı Sumqayıt sakinində də müşahidə olunur. Bu, həmin şəxslərin əvvəlcədən nə baş verəcəyi haqda bilmələri və şəhəri tərk etməsinin göstəricisidir.

1988-ci ildə Əmanət Bankının Sumqayıt şəhər şöbəsinin rəisi olmuş Mehdi Mehdiyev bunu təsdiq etmişdir: «1987-ci ildən pulları çıxarmağa başlamışdılar, lakin biz onu sezmirdik. Biz, əsasən, fevral ayında sezdik. Fevral ayında pulları sürətlə çıxardılar. Burada artıq Respublika Bankından da Sumqayıtda birdən-birə göstəricinin aşağı düşməsilə maraqlandılar» (14–16).

Mehdi Mehdiyev hadisələrdən sonra 3–4 ay əvvəlki prosesləri xatırlayaraq şəhər rəhbərliyinə bu barədə danışmışdı. Əli Həsənov da bunu təsdiq edir: «Mehdi gəldi mənim yanıma. Dedi, Əli müəllim, mən əvvəl başa düşməzdim, indi bu hadisədən sonra istəyirəm sizə bir şey deyim ki, keçən il, yəni oktyabr-noyabr aylarında (1987-ci il), hadisədən 3 ay qabaq

bütün ermənilər öz əmanətlərini çıxarıblar. Bizdə 3900 ailə idi, 11500 erməni yaşayırdı Sumqayıtda. Demək, nə qədər ermənininin adına burada əmanət qoyulmuşdusa, 100 faiz hamısı götürülüb. Dedim, səndə nə qalıb? Dedi, bütün sənədlər! Dedim, gətir bura. Gətirdi» (14–16).

Xeyli ermənininin əvvəlcədən talan haqda məlumatlı olması ehtimalını daha bir fakt gücləndirir. Belə ki, talan günləri 200 mənzilə hücum olsa da, cəmi 19 epizodda ölüm hadisəsi baş verib və 32 nəfər qətlə yetirilib. Onlardan da 6-sı azərbaycanlı idi.

Qriqoryanın talançı qrupunun üzvləri də öz ifadələrində bildirirdilər ki, onların hücum etdikləri evlərin bir çoxunda nəinki heç kim yox idi, həm də evləri tamam yığışdırmışdılar və onlar boş evə daxil olaraq heç kimi və heç nə tapmamışdılar. Qalasılkin: «Daxil olan məlumatlarda Sumqayıtda nəsə hazırlandığı deyilirdi. Həmin məlumatlarda telefon qovşaqlarının sıradan çıxması qeyd olunurdu. Telefon qovşaqları isə bir qayda olaraq, həddindən artıq yükləndikdə sıradan çıxır. Həmçinin mənzil-istismar sahələrində xüsusi siyahıların tərtib olunması barədə məlumatlar da daxil olurdu (14–16).

Nəhayət, daha bir müəmmalı məqam Qorbaçovun göstərişindən sonra tələsik üç azərbaycanlının Moskvada açıq məhkəməsinin qurulmasından sonra baş verənlərdir. Əvvəl Əhməd Əhmədova ölüm hökmü verilsə də, daha sonra onların evinə bu hökmün dəyişdirilməsi haqda məktub gəlir. Məktubda yazılmışdı: «Əhməd Əhmədov SSRİ Ali Məhkəməsinin Cinayət İşləri üzrə Məhkəmə Kollegiyasının 1988-ci il 18 noyabr tarixli hökmü ilə müstəsna cəza növü olan güllələnməyə məhkum edilmiş, lakin SSRİ Ali Sovetinin Rəyasət Heyətinin fərmanı ilə güllələnmə cəzası dəyişdirilərək, həbs cəzası ilə əvəz edilmişdir». Ancaq altı ay keçdikdən sonra gələn ikinci məktubda Əhməd Əhmədovun haqqında ölüm hökmünün həyata keçirildiyi qeyd edilmişdi. İkinci müəmmalı məqam isə İsmayılov və Cəfərovun vəkillərinin qısa müddətdə gözlənilmədən vəfat etməsidir.

Ən mühüm müəmmalardan biri isə Eduard Qriqoryanın izinin Yerevanda itməsidir. Eduard Qriqoryan 26 avqust 1991-ci ildə Stavropoldan gətirilərək Bakıdan Yerevan şəhərindəki 1 saylı istintaq təcridxanasına göndərilib. Qəribədir ki, ermənilərə qarşı talanın təşkilatçılarından biri olmuş və onda bilavasitə iştirak etmiş cinayətkarı Bakıda yox, ermənilərin böyük icmasının yaşadığı Stavropolda və Yerevanda yerləşdirirlər. Onun izi Yerevanda itir.

Sumqayıt hadisələrinin ilk günü fevralın 28-də Sumqayıt şəhərinin Prokurorluğunda cinayət işi açılmışdı. Böyük ədliyyə müşaviri İsmət Qayıbovun imzaladığı qərarda deyilirdi: «Cinayət işinin açılması haqqında qərar. 28 fevral 1988-ci il. Sumqayıt şəhərinin prokuroru, böyük ədliyyə müşaviri İsmət Qayıbov Sumqayıt şəhərindəki kütləvi iğtişaşlar haqda materialları araşdıraraq müəyyən edib: 28 fevral 1988-ci ildə Sumqayıt şəhərinin ərazisində talanlarla, erməni millətindən olan şəxslərin mənzillərinin dağıdılması və onlara qarşı başqa zorakı hərəkətlərlə müşayiət olunan kütləvi iğtişaşlar baş vermişdir. Qeyd olunanların əsasında Azərbaycan Cinayət Prosessual Məcəlləsinin 104, 109, 131-ci maddələrini rəhbər tutaraq Qərara alıram: Azərbaycan Cinayət Məcəlləsinin 72-ci maddəsinin əlamətləri üzrə materiallar əsasında cinayət işi açılsın və istintaqa başlansın» (11, 1; 230). Bu fakt ermənilərin Sumqayıt hadisələrini Azərbaycan xalqı və dövlət orqanlarının təşkil etməsi haqda iddialarını puça çıxaran çoxsaylı faktlardan biridir. Və sübut edir ki, hadisənin ilk günü Azərbaycanın hüquq-mühafizə orqanı olan Prokurorluq cinayət işi açıb və bu qərarında erməni millətindən olan şəxslərə qarşı zorakılıq hadisələrinə artıq ilkin qiymət verib. Sumqayıtın prokuroru baş verənləri zorakılıq, dağıdıcılıq və talan kimi xarakterizə edib, cinayətkarların tutulması və cəzalandırılması məqsədilə rəsmi fəaliyyətə başlayıb. Elə həmin gün həbs olunanlar da vardı. Məsələn, Eduard Qriqoryan və bir çoxları hələ fevralın 29-da, yəni Moskvadan xüsusi qrup gələnə qədər artıq həbs olunmuşdular. Bunu Azərbaycanın hüquq-mühafizə orqanları həyata keçirmişdi. SSRİ-nin istintaq qrupu isə martın 1-dən işə başladı və İsmət Qayıbovu işdən kənarlaşdırdı. O, SSRİ Baş prokurorunun müavini A.F.Katusevin imzaladığı qərarla yaradılmış, SSRİ Baş prokurorunun yanında xüsusi vacib işlər üzrə müstəntiq, böyük ədliyyə müşaviri V.S.Qalkinin rəhbər təyin edildiyi 181 nəfərlik istintaq qrupunun üzvlərindən biri idi. (İstintaq qrupunun yaradılması haqda Qərar, 1 mart 1988-ci il.)

SSRİ Baş prokurorunun müavini A.F.Katusev SİTA-nın müxbirinə verdiyi müsahibədə deyirdi: «Fevralın 28-də zorakılığın ilk qurbanları aşkar olan kimi Sumqayıt şəhərinin prokuroru cinayət işi qaldırmışdı. Martın 1-də bu iş SSRİ Baş prokuroru yanında mühüm işlər üzrə müstəntiq V.S.Qalkin tərəfindən icraata qəbul edilmişdir» (206).

181 nəfərlik istintaq qrupunun yalnız 41 nəfəri azərbaycanlı idi. Onlar mühüm məsələlərlə bağlı istintaqlara deyil, yalnız o qədər də vacib olmayan işlərə cəlb edilirdilər.

Kütləvi iğtişaşlar baş verdiyi dövrdə Sumqayıt şəhərində yaşamış və işləmiş hüquq-mühafizə, partiya və sovet orqanlarının işçilərinin ifadələri də hadisələrin əsl mahiyyətini üzə çıxarmağa imkan verir.

Sumqayıt şəhər Daxili işlər şöbəsinin partiya komitəsinin sabiq katibi Xancanov Hüseynağa Ağayar oğlu ifadəsində göstərmişdi ki, ilk qarşıdurmalar fevralın 27-də qeydə alınmışdı. Ayın 28-də isə şəhərdə artıq 12 nəfərin öldürülməsi faktı qeydə alınmışdı. Daxili işlər şöbəsinin o vaxtkı rəisi vəzifəsini icra edən milis podpolkovniki Xanlar Cəfərov vəziyyətə nəzarət etmək üçün şəhərə göndərilmiş general Krayevdən «Nasosnı» (indiki H.Z.Tağıyev) qəsəbəsində yerləşdirilmiş qoşun hissələrinin Sumqayıta yeridilməsinə göstəriş verməsini xahiş etdikdə general Krayev ona «beş-on xuliqanın da öhdəsindən gələ bilmirsiniz» deyə kömək etməkdən imtina etmişdi. Bu səbəbdən itkilərin sayı artmış və ötən növbəti gün ərzində daha 20 nəfərin öldürülməsi qeydə alınmışdı. Öldürülənlərin 26-sı erməni, 6 nəfəri isə azərbaycanlı olmuşdu. Yalnız bundan sonra şəhərə qoşun hissələri yeridilmiş, komendant saatı tətbiq edilmişdi. Şəhərə yeridilmiş ordu hissələrinin əsgərləri azərbaycanlılarla kobud davranmış, günahsız insanları həbs etmiş, onlara qarşı fiziki zor işlətmişlər. Onlara tapşırılmışdı ki, tutulanlar ermənidirsə, onları dərhal buraxsınlar. Bu səbəbdən erməni təxribatçılar ələ keçməmişlər. Digər tərəfdən Sumqayıtın və ümumiyyətlə, Azərbaycanın hüquq-mühafizə orqanlarının əməkdaşları istintaq-əməliyyat tədbirlərindən kənarlaşdırılmışdılar. Belə bir şəraitdə ermənilərin qabaqcadan, qeyd-şərtsiz zərərçəkmiş tərəf kimi tanınması asanlaşmış, tutulan ermənilərin hamısı səhvən yaxalanmışlar kimi azadlığa buraxılmışlar (230).

H.Xancanovun özünü SSRİ DTK-nın baş müstəntiqi, polkovnik Zubtsev adlı birisi şəxsən sorğu-sual etmiş, on yeddi gün – hər gün ona izahat yazdırmışdı. O, Zubtsevə bu cinayətlərin ermənilərin təxribatı olması barədə izahat verəndən sonra Zubtsev ona demişdi ki, bunu təkcə siz demirsiniz, bir çoxları deyir və vəd etmişdi ki, araşdırma aparacaq. Bundan sonra onlar hadisələrin baş verdiyi 3-cü mikrorayon ərazisinə getmişlər. Burada binaların dağıdılması sistemli şəkildə həyata keçirilmişdi. Binaların aşağı mərtəbələrində yaşayan erməni ailələri və onların mənzilləri heç bir zərər görmədiyi halda, yuxarı mərtəbələrdə yaşayan erməni ailələri və onların mənzilləri hücuma məruz qalmış, adamlar öldürülmüş, mənzillər qarət olunmuş və əmlak sındırılıb-dağıdılmışdı. O bütün bunları Zubtsevə göstərib həmin vəziyyətin hansı səbəblərdən baş verə bilə-

cəyini ona izah etmiş, bildirmişdi ki, əgər azərbaycanlılar həqiqətən ermənilər öldürmək niyyətində olsaydılar, elə aşağı mərtəbələrdəki mənzillərə soxular və orada yaşayan erməniləri öldürərdilər. Amma qətllər xüsusi plan və sxem əsasında həyata keçirilmişdi. Onun özünün apardığı araşdırmalar göstərmişdi ki, «Krunk» millətçi təşkilatına üzvlük haqqı ödəyən ermənilərə heç nə olmamış, qətlə yetirilən və xəsarət alan ermənilər isə bir qayda olaraq, ermənilərin kasıb olanları və «Krunk»a pul ödəmək iqtidarında olmayan ailələrin nümayəndələri olmuşdu. Zubtsev onun dediklərini başa düşmüş, bir istintaqçı və kriminalist kimi cinayətlərin baş vermə səbəblərini və mexanizmini anlamış, geri qayıdarkən yolda ona: «Sizə inanıram və dediklərinizi faktlar da sübut edir. Amma siz kimə arxayınsınız? Heydər Əliyevə? O ki, artıq yoxdur» deyə bildirmişdi (230).

İş üzrə dindirilmiş Sumqayıt şəhərinin keçmiş güc strukturlarının işçilərinin bir neçəsi (R.Əliyev, T.Məmmədov, F.Camalov və qeyriləri) göstərmişlər ki, onlar faktiki olaraq Sumqayıt hadisələrinin istintaq və əməliyyat yolu ilə təhqiqindən kənarlaşdırılsalar da, müəyyən etmişlər ki, Sumqayıt şəhərində özlərini «Qafandan qovulmuş azərbaycanlılar» kimi təqdim edən 20–25 nəfərdən ibarət təxribat qrupu fəaliyyət göstərir. Bu barədə onlara, hətta bəzi zərərçəkmiş ermənilər də məlumat vermişlər. Həmin məlumatlar SSRİ Baş Prokurorluğunun istintaq-əməliyyat qrupuna çatdırılsa da, məlum olmayan səbəblərdən həmin məlumatların yoxlanması təşkil edilməmişdi. Eyni məzmunda ifadə SSRİ Baş Prokurorluğunun istintaq qrupunda tərcüməçi kimi fəaliyyət göstərmiş Nofəl Əhmədov tərəfindən verilmişdi. O göstərmişdir ki, istintaq-əməliyyat qrupunun üzvləri öz aralarında yuxarıda qeyd olunan təxribat qrupu barədə məlumat aldıqlarını dəfələrlə bildirsələr də, həmin təxribat qrupunun ifşa edilməsi üçün tədbirlər görməmişlər (230).

DTK-nın Sumqayıt şəhər şöbəsinin sabiq əməkdaşı Hacəli Hacəliyev ifadəsində göstərmişdi ki, Sumqayıt hadisələrinin əsas təşkilatçılarından və icraçılarından biri olan «Paşa» ləqəbli Qriqoryan Eduard Robertoviç barəsində məlumat alaraq, bu barədə SSRİ DTK-nın Sumqayıt hadisələri üzrə əməliyyat sahəsinə rəhbərlik edən Popov Yevgeni Alekseyeviçə məlumat vermiş, lakin o buna şübhə ilə yanaşaraq, milliyyətcə erməni olan şəxsin ermənilərə qarşı törədilən cinayətləri təşkil edə biləcəyinə inanmadığını demişdi. Təxminən mart ayının əvvəllərində DTK-nın

Sumqayıt şöbəsinin rəisi Lebedev Vladimir Nazaroviç onu çağıraraq Eduard Qriqoryan barədə verdiyi məlumatın doğru çıxdığını və sonuncunun artıq həbs olunduğunu xəbər vermişdi.

Sumqayıtda ermənilərin təxribat törətmələri onlardan bəzilərinin hadisələr dövründəki davranışlarından da aydın görünmüşdür. Belə ki, Sumqayıt şəhərinin baş pediatrı Quliyeva Xalidə Şirin qızı ifadəsində göstərmişdir ki, qarşıdurma baş verdikdən dərhal sonra şəhərdə tibb işçilərindən ibarət xüsusi qərargah yaradılmış, təcili tibbi yardım maşınları yaralıları xəstəxanalara daşımış və onlara lazımi yardım göstərilmişdir. Milliyyətcə erməni olan Amalya adlı tibb bacısı ona yaxınlaşıb xəbər vermişdi ki, ölən ermənilərin hamısı Qarabağ əsillidir. X.Quliyeva daha sonra göstərmişdi ki, Sumqayıtdakı hadisələr ərəfəsində Dağlıq Qarabağ Muxtar Vilayətinin partiya komitəsində çalışanlardan biri Sumqayıtda yaşayan və 2 saylı uşaq poliklinikasında baş tibb bacısı işləyən Svetlana adlı bacısına zəng vurub şəhərdə tezliklə qarşıdurma yaranacağını xəbər verib tapşırmışdır ki, şəhəri tərk etsin.

Sumqayıt hadisələrindən bir neçə ay sonra pediatrların Ümumittifaq qurultayında Ermənistan nümayəndə heyətinin tərkibində qurultaya gəlmiş Dağlıq Qarabağdan olan Nelli Qriqoryan adlı-soyadlı həkim fasilə zamanı ona yaxınlaşaraq adamların az olduğu yerə çəkilib söhbət etmələrini xahiş etmiş, söhbət zamanı bildirmişdir ki, Dağlıq Qarabağda vəziyyət getdikcə gərginləşir, mitinqlərdə iştirak etməyənləri, uydurma «soyqırımı»nı dəstəkləməyənləri ləkələyir, müxtəlif bəhanələrlə həbs edirlər. Ermənilər Azərbaycanda da xüsusi planlar hazırlayır və həyata keçirməyə çalışırlar, hətta Sumqayıtda da bu istiqamətdə təbliğat aparılır. Sumqayıt hadisələri zamanı həlak olan ermənilərin qohumlarına deyirlər ki, onlar «Krunk»un üzvü olsaydılar, sağ qalardılar (230).

Hadisələr dövründə Sumqayıt şəhərinin tabeliyində olan H.Z.Tağıyev adına qəsəbədəki hərbi qarnizonda yerləşdirilmiş ermənilərə göstərilən tibbi yardımın vəziyyətinə nəzarət etmək üçün buradakı hospitalda olarkən ona xəbər verilmişdi ki, tibbi nəzarətdə ağır xəstə olan bir erməni uşağı vardır. Ermənilər xəstə uşağın sağalma ehtimalının az olmasını bildiklərindən onu öldürüb sonra bunu azərbaycanlıların boynuna atmaq istəyirlər. Guya, azərbaycanlılar xəstə erməni uşağını öldürüblər. Həmin söhbəti eşidən kimi o, uşağın yatdığı palataya yaxınlaşmış və orada tanıdığı, erməni millətindən olan, 1 nömrəli doğum evində işləyən Silva adlı tibb bacısını görüb işarə ilə kənara çağırmışdır. Silva ona xəbər vermişdi

| Ad, soyad | Doğulduğu il və yer | Ünvan |
|---|---|---|
| Danielyan Nikolay Artemoviç | 1939, DQMV, Əsgəran r-nu, Badara kəndi | ev 4/2, m.25 |
| Danielyan Seda Osipovna | 1938 | ev 4/2, m.25 |
| Avakyan Yuri Baqratoviç | 1936, DQMV, Hadrut r-nu Moxrenes kəndi | ev 5/2, m.47 |
| Qriqoryan Emma Şirinovna | 1930, Şaumyan (k) r-nu, Armyanskiye Borisı kəndi | ev 5/2, m.45 |
| Aramyan Armo Aşotoviç | 1928, DQMV, Kətük kəndi | ev 6/2, m.21 |
| Aramyan Artur Armoyeviç | 1936, DQMV, Kətük kəndi | ev 6/2, m.21 |
| Aruşanyan Vladimir Ovanesoviç | 1936, DQMV, Arçadzor kəndi | ev 6/2, m.16 |
| Aruşanyan Razmella Atanesovna | 1939, DQMV, Çldran kəndi | ev 6/2, m.16 |
| Movsesova Yersilya Baxşiyevna | 1902, DQMV, Martuni r-nu – Bakıda yaşayıb | ev 6/2a, m.18 |
| Tovmasyan Rafik Ambarsumoviç | 1956, DQMV, Mardakert r-nu, Vəng kəndi | ev 6/2, m.8 |
| Trdatov Qabriel Abramoviç | 1925, Şamaxı r-nu, Kərkənc kəndi | ev 6/2, m.6 |
| Mehtiyeva Tamara Gerasimovna | 70-75 yaş, Ermənistan, Sisyan r-nu | ev 16, m.49 |
| Qambaryan Aleksandr Aleksandroviç | 1926, DQMV, Yuxarı Çaylı kəndi | ev 17, m.40 |
| Arakelyan Artaş Levonoviç | 1937, Şəmkir r-nu, Çardaxlı kəndi | ev 5a, m.9 |
| Melkumyan Raisa Arsenovna | 1934, DQMV, Hadrut r-nu, Cilan kəndi | ev 2b, m.21 |
| Melkumyan Eduard Soqomonoviç | 1960, DQMV, Hadrut r-nu, Cilan kəndi | ev 2b, m.21 |
| Melkumyan İrina Soqomonovna | 1961, DQMV, Hadrut r-nu, Cilan kəndi | ev 2b, m.21 |
| Melkumyan İqor Soqomonoviç | 1957, DQMV, Hadrut r-nu, Cilan kəndi | ev 2b, m.21 |
| Melkumyan Soqomon Markaroviç | 1931, DQMV, Hadrut r-nu, Cilan kəndi | ev 2b, m.21 |

**Sumqayıt təxribatında öldürülən ermənilərin çoxu DQMV-dən idi**

ki, ermənilər uşağın anasına deyirlər ki, «onsuz da uşaq gələcəkdə şikəst olacaq, qoy ölsün, aparaq meyiti Sumqayıtın mərkəzi meydanında, Leninin heykəlinin yanında qoyaq, qoy görsünlər ki, azərbaycanlılar erməni uşaqlarına da rəhm etmirlər». Dərhal əsgərlərin köməyi ilə həmin uşaq daha ciddi nəzarət altına alınmış və tibbi yardım göstərildikdən sonra onun vəziyyəti yaxşılaşmışdı.

Ermənilər özləri də etiraf etmişlər ki, Sumqayıt hadisələri olmasaydı, Dağlıq Qarabağ münaqişəsi tamam başqa cür inkişaf edəcəkdi, Stepanakertdəki (Xankəndi) mitinqlər səngiyəcək və daşnakların planları alt-üst olacaqdı. Həmin dövrdə Sumqayıt şəhər partiya komitəsinin ikinci katibi işləmiş Mələk Bayramovanın, Şəhər Xalq Deputatları Soveti İcraiyyə Komitəsinin sədri vəzifəsində işləmiş Məmmədov Təvəkkül Yaqub oğlunun və qeyrilərinin ifadələrindən görünür ki, şəhər rəhbərliyi və yerli güc strukturlarının fəaliyyəti Moskvadan göndərilmiş general Krayev və qeyrilərinin göstərişi və əmrləri ilə iflic vəziyyətə salınmışdı (230).

«Sumqayıt» qəzetinin redaktoru Məlikov Qüdrət Balakişi oğlu ifadəsində göstərmişdir ki, şəhərdə məlum hadisələr baş verdikdən sonra onlar

yerli «Sosialist Sumqayıtı» qəzetinin növbəti nömrəsinin maketini çap etmək üçün hazırlamışlar. Lakin Moskvadan təyin edilmiş Krayev soyadlı hərbi komendant qəzetin çap edilməsinə icazə verməmiş və demişdir ki, hadisəni onların yazdığı kimi «ekstremistlər» deyil, bir yığın xuliqanlar törətmişlər, qəzetdə «ekstremistlər» barədə yazmaq olmaz. Moskvadan gəlmiş nümayəndə, hətta onların məsələlərinə büroda baxılacağı və cəzalandırılacaqları ilə hədələmişdi (230).

Sumqayıt şəhər partiya komitəsinin sabiq təlimatçısı Rəhimov Seyfəddin Kərim oğlu ifadəsində göstərmişdir ki, Sumqayıtdakı həmin məlum günlərdə insanları sakitləşdirmək üçün mitinq iştirakçıları arasında söhbətlər aparmışlar. Lakin eyni zamanda meydanda antiermənı təbliğatı aparan, özlərini Ermənistandan qaçıb gəlmiş və guya, bir avtobus meyit gətirmiş şəxslər kimi təqdim edən, yerli adama oxşamayan kişi və qadınlar da peyda olmuşlar. Xatırlayır ki, bir sarı rəngli, «PAZ» markalı avtobusda belə bir dəstə mərkəzi meydanda da görünmüşdür. Avtobus mitinq iştirakçılarının ortasında dayananda avtobusdan çığırtılar eşidilmişdi. Avtobusun qapıları açılanda, onun içindən, guya, öldürülmüş insanların ayaqları görünürmüş. Avtobusdan düşən qara geyimli gənc kişi və qadınlar qışqıra-qışqıra Ermənistanda ermənilərin azərbaycanlıları qırmaları, qadınların döşlərini kəsmələri və s. barədə ağlar səslə danışıb ermənilərdən qisas almağa çağırışlar etməyə başlamışlar. Mitinq iştirakçılarından kimsə onların yalan dediyini qışqırdıqda, avtobusdan düşən şəxslərdən biri həmin mitinq iştirakçısına tərəf dönüb: «Sən özün ermənisən» deyə camaatı onun üstünə qızışdırmış və ətrafındakılara «bunlardan hay çıxan deyil, mən bilirəm, ermənilər harada yaşayırlar» deyərək, bir qrup şəxsi öz arxasınca aparmışdır (230).

Sumqayıt şəhərinin psixiatrı Tağıyev Mail Bağı oğlu ifadəsində göstərmişdir ki, 1988-ci ilin fevral ayının əvvəllərində məzuniyyət vaxtı Soçidə dincələrkən təsadüfən Sumqayıtda o zaman rus dilində çıxan «Коммунист Сумгаита» qəzetinin müxbiri işləyən Anaida Martirosyan adlı-soyadlı qadınla rastlaşmış və fevralın 10-da Sumqayıta qayıdacağını bildirərək, bir yerdə qayıtmağı təklif etmişdi. Anaida isə demişdi ki, o, Sumqayıta bu tezliklə qayıtmaq istəmir, martın ortaları üçün qayıtmağı planlaşdırır. O, təəccübünü bildirdikdə, Anaida demişdi ki, onun məzuniyyəti uzun deyil, amma bilir ki, tezliklə Sumqayıtda böyük xoşagəlməz hadisələr baş verəcək, bu səbəbdən Sumqayıtda olmaq istəmir. Tağıyev

Anaidanın bu sözlərinə o qədər əhəmiyyət verməsə də, hadisələr başlayanda Anaidanın sözləri yadına düşmüş və anlamışdı ki, Anaidaya Sumqayıtda ermənilər tərəfindən təxribat törədiləcəyi məlum imiş. M.Tağıyev həkim olduğu üçün Sumqayıtda yaşayan ermənilərin əksəriyyətini tanımış və hadisə günlərində tibbi yardım üçün müraciət edən və ya gətirilən ermənilərin hamısının ən kasıb və dinc ermənilər olduğunu görmüşdü. Erməni tanışları ilə o vaxtkı təmaslarından ona məlum olmuşdur ki, Sumqayıtda «Krunk» təşkilatının emissarı Qarabağdan Sumqayıta hərbi komissar kimi dəyişdirilib göndərilmiş Kalantarov soyadlı erməni polkovnik olub. O, buradakı ermənilərin hamısının siyahısını və ünvanlarını bilirmiş və hadisələr ərəfəsində iş yerini dəyişmək adı ilə Sumqayıtı tərk edib (230).

Beləliklə, küçə talançılarına qədər və geriyə uzanan izlər:

1) Stepanakert, Yerevan və Moskvadan başlayır;

2) Sumqayıt hadisələri və Qriqoryanla bilavasitə əlaqədə olmuş Sərkisyan Suren Yuryeviç, Osipov-Osipyan, Kamo adlı şəxs, Maşa Petrosyan, Çaqikyan Robert Amayakoviç, Konstantin Pxakadze və Çaturyan Levon Akopoviçdən keçərək;




**Eduard Qriqoryan nəinki öz qrupunda, hətta bütün təxribatda birləşdirici fiqur idi**

3) yenə Qriqoryanla bilavasitə əlaqədə olmuş, amma adları bilinməyən müəmmalı qara plaşlı adamlardan;

4) Eduard Qriqoryana çıxır. Eduard Qriqoryan və ondan sonra isə müəmmalar bitir və artıq hamı haqda hər şey birmənalı aydındır. Onun yaxın adamları qardaşları;

5) Ernest və Albert Qriqoryanlar və onlara kömək edənlər;

6) bilavasitə talanda iştirak etmiş, öz aralarında erməni dilində danışanlar və azərbaycanlılardan ibarət olan kiçik yarımqruplar.

Hadisələrin gedişində məlum olur ki, sonuncu yarımqruplar Eduard Qriqoryanın əsl planından məlumatsız olublar. Qriqoryanın qrupuna daxil olan 2–3 nəfərlik kiçik qruplar nəinki bir-birlərini tanımırdılar, hətta istintaq materiallarından görünür ki, bir-biri ilə pis münasibətlərdə olanlar da vardı. Onları bir qrupda yalnız Qriqoryan birləşdirirdi. Bütün bunlar onu göstərir ki, qrupda mərkəzi, birləşdirici fiqur məhz Eduard Qriqoryan olub. Ancaq bilavasitə talanda iştirak edən adamlardan başqa arxa planda qalan və yalnız Qriqoryanın tanıdığı adamlar da var idi. Sonradan onların da erməni əsilli olduqları və Sumqayıta kənardan gəldikləri məlum olacaq.

### 3.3. Azərbaycan xalqının Sumqayıt hadisələrinə münasibəti

Erməni millətçiləri Sumqayıt faciəsini törətdikdən sonra bu faciədən öz məkrli planlarının reallaşması üçün istifadə etməyə, azərbaycanlıları vəhşi, özlərini isə məzlum göstərərək dəridən-qabıqdan çıxmağa başladılar. Lakin Sumqayıt hadisələri Azərbaycan xalqının müdrikliyinin və insansevərliyinin daha bir nümunəsi oldu. İnsanlar əsl mərdlik və beynəlmiləlçilik göstərərək, xuliqanlıq edən ünsürlərin cinayətkar əməllərinə uymayaraq, azğınlaşmış kütləni qətiyyətlə geri oturtmaq üçün özlərində cəsarət və şəxsi hünər tapdılar. Həmin fəciəli günlərdə bir çox sumqayıtlı öz həyatını təhlükə altına qoyaraq erməni millətindən olan vətəndaşların həyatını xilas etməyi bacarmışdılar.

Sadə azərbaycanlıların həmin dəhşətli günlərdə göstərdikləri fədakarlıqlar haqqında çoxsaylı faktlar mövcuddur. Hadisələrdən sonra Sumqayıt şəhərinin komendantı təyin edilmiş V.Krayev yazırdı ki, əgər sakinlər bizə kömək etməsəydilər, qurbanların sayı daha çox olardı. Bir nəfər azərbaycanlı avtobus sürücüsü, on nəfər ermənini dərhal Şəki şəhərinə öz vətəninə aparmışdı. Başqa bir azərbaycanlı ailə çoxmərtəbəli evin qabağında xuli-

qanların yolunu kəsmişdi. Bir fəhlə öz erməni dostu ilə avtobusda gedərkən bir dəstə adam qəfildən maşını saxlayıb ermənini tələb etmişdi, azərbaycanlı fəhlə özü yaralansa da, dostunu xilas etmişdi (74, 3).

SSRİ Prokurorluğu Baş istintaq idarəsi rəisinin müavini V.Nenaşev və SSRİ Prokurorluğu yanında xüsusi işlər üzrə müstəntiq V.Qalkin «İzvestiya» qəzetinə müsahibələrində də azərbaycanlıların həmin hadisələr zamanı özlərini soyuqqanlı apardıqlarını təsdiq etmişdilər: «Azərbaycanlıların mütləq əksəriyyəti bu hadisələri ürəkağrısı ilə qarşıladılar. Sumqayıtda baş verənlər heç vəchlə iki xalqın qarşılıqlı münasibətlərini xarakterizə etmir. İstintaqın gedişində öz dramatikliyinə görə qeyri-adi beynəlmiləlçilik nümunələri verən onlarla epizod üzə çıxarılmışdır. Qəti surətdə demək lazımdır: erməniləri gizlətmiş azərbaycanlı ailələr bizi daha böyük bədbəxtliklərdən qorudular (206).

Əliyevlər ailəsi Sumqayıtda tanınmış bir erməninin ailəsini öz qanadı altına almışdır. Xuliqanlar binanın qapısına yaxınlaşdıqda ailənin kişiləri ilə yanaşı, həm də qadınlar onları qarşılamış xuliqanların yolunu kəsmişlər. Təhrikçilər öz məqsədlərinə çata bilməmişlər. Superfosfat zavodunun direktoru N.Ağayev B.Ohanyan adlı fəhləni ailəsi ilə Sumqayıtdan Bakıya gətirib öz qohumlarının yanında düşürmüş, qayğısını onlardan əsirgəməmişdi (32, 1988-ci il 24 mart).

Hadisələr zamanı sumqayıtlıların insani hərəkətlərini sübut edən faktlardan biri də asayişi bərpa etmək, erməniləri qorumaq üçün müxtəlif yaşayış yerlərində, istehsal kollektivlərində, tədris müəssisələrində, əsasən, gənclərdən ibarət könüllü dəstələr yaradılması idi. Məhz onların sayəsində daha çox tələfatın qarşısını almaq mümkün olmuşdu (189, 124–125). Xuliqanlar Sumqayıt Ali Texniki məktəbin binasına soxularaq dərsləri dayandırmışlar. Lakin müəllimlərin təmkini və dönməzliyi kütləni geri çəkilməyə məcbur etmişdi. Bir erməninin belə burnu qanamamış, bir nəfər belə azərbaycanlı tələbə fitnə-fəsada uymamışdı (32, 1988-ci il 24 mart).

Azərbaycanlıların böyük risk altında erməniləri xilas etmələrini elə Sumqayıtın erməni millətindən olan sakinləri də qeyd edirdilər. Bu barədə «Sosialist Sumqayıtı», «Коммунист Сумгаита» qəzetlərində, respublika mətbuatında çoxlu faktlar mövcuddur. Akopyanlar ailəsi «Коммунист Сумгаита» qəzetinin redaksiyasına göndərdikləri məktubda yazırdılar ki, erməni millətindən olan mən və mənim ailəm təhrikçilərin və şüursuz

ünsürlərin günahından Sumqayıtda baş vermiş şuluqluqlarla əlaqədar çətin vəziyyətdə qalmışdıq. Bizə ilk kömək əlini uzadan da elə mənim azərbaycanlı qonşularım oldular. Bizim çoxsaylı ailəmizə onlar öz kiçik mənzilində yer verdilər. Biz onların ürəklərinin istisi, yardımı və qonaqpərvərliyi ilə qızındıq (137, 2 mart 1988).

R.Andiryan soyadlı erməni isə yazırdı: «Günahsız insanlar ölmüşdür… Lakin onlar Dağlıq Qarabağ hadisələrinə görə şuluqluq törətmiş xuliqanların, banditlərin əlindən ölmüşlər. Əclaf millətdən kənar anlayışdır… həmin günlərdə məhz azərbaycanlı qonşularım mənə kömək əli uzatdılar (137, 2 mart 1988).

Kaliniçenko da bunları təsdiq edirdi: «Birinci mərtəbədə adını həmişəlik yaddaşıma həkk etdiyim azərbaycanlı qadın yaşayırdı. Onun adı Səməngül idi. Hadisələr baş verən gün qadın evində erməni ailəni gizlətmişdi. Talançılar ondan şübhələnib evinə soxularaq erməniləri təhvil etməyi tələb etmişdilər. Lakin o heç kimi satmamışdı. Həmin erməni qadın və uşaqlar sağ qalmalarına görə məhz həmin qadına borcludurlar» (14–16).

Avanesyan Marina (İra) Aleksandrovna artıq Yerevanda olarkən verdiyi ifadədə bu faktları xatırlamışdı: «Heç bir Sumqayıt ermənisi vicdanlı azərbaycanlıların bizə etdiyi köməyi dana bilməz! O dəhşətli günlərdə bizə məhz kimin kömək olduğunu heç kim unutmayacaq! Yeri gəlmişkən, elə bizim ailəni də azərbaycanlı qadın xilas etmişdi» (231).

Erməni şovinistlərinin azərbaycanlılara qarşı apardığı siyasət Azərbaycanda, Bakıda yaşamış erməni Petoyanın əzab çəkməsinə səbəb olmuşdu. O, iki xalqı bir-birinə düşmən edən qüvvələrin çirkin məqsədlərini yaxşı dərk edirdi. Buna dözə bilməyib intihar etdi. O, ölümündən sonra məktub qoyub və bütün baş verənlərdə erməni millətçilərini ittiham edib: «Ölümümdə mən Dağlıq Qarabağ və Ermənistandan olan erməni ekstremistləri günahlandırıram. Qəzetlərdən, habelə televiziya və radio verilişlərindən onların Azərbaycan xalqına qarşı hansı bəla və müsibətlərin gətirdiyinin şahidi olunca məni yuxusuz gecələr narahat edir. Mən durmadan bunu fikirləşirəm və belə bir rüsvayçılığı qəbul edə bilmirəm. Ermənilər tərəfindən edilənlərə qarşı öz etirazımı bildirmək məqsədilə özümü qurban edirəm. Q.İ.Petoyan». Onun qızı Tereza Petoyan deyir: «O deyirdi ki, olanlardan çox utanır. Həmişə ermənilərin alicənab olduqları haqqında söhbət gəzərdi, indi də, inanıram ki, bu xalqın bəzi nümayəndələrində vicdan hissi qalıb, dürüst insanlar olmamış deyil, axı niyə

onların səsi eşidilmir?! Niyə toplantıya Zori Balayanı çağırırlar?! Bu qudurğan millətçinin tribunadan səslənməsinə necə icazə verirlər?!

O, çox utanırdı. Mən də utanıram. Mən hər şeyin əvvəlki kimi olmasını istəyirəm. İstəyirəm ki, yenə birgə iştirak etdiyimiz toy mərasimləri, mehriban ad günü ziyafətləri olsun. İstəyirəm ki, hər yerdə mehribanlıq olsun! Axı niyə mənim atam dünyadan köçməli idi?! Bir şeyi dəqiq bilirəm ki, mən buradan köçüb getmək istəmirəm».

Sumqayıt talanları ərəfəsində və gedişində şəhər hüquq-mühafizə orqanları, o cümlədən o zamankı sovet milisi adlanan polis imkanları daxilində xeyli vətəndaşı talandan qoruya bilmişdi. Məsələn, şahidlərin 1988-ci ildə sovet istintaqçılarına verdikləri ifadələrdə göstərilir ki, Sülh küçəsində «Moskviç» markalı avtomobilin sərnişinlərini məhz milis öz həyatını riskə ataraq xilas etmişdi. Esiyan Levon Şirinoviç müstəntiq Savelyevə 6 aprel 1988-ci ildə verdiyi ifadədə bildirmişdi ki, həyat yoldaşı ilə onu hücumçuların əlindən alıb xəstəxanaya apararaq orada ilkin tibbi yardım göstərdilər və sonra Bakıya evlərinə yola saldılar. Qızını isə artıq polislər Bakıdakı evlərinə çatdırmışdılar (11, c.1, i.v. 125–139). Esiyan Narine Levonovna 11 avqust 1988-ci ildə verdiyi ifadədə deyir: «Milis işçilərini gördüm. Onlar kütlənin qarşısını alırdılar». Qızı, doğrudan da, mülki geyimli oğlan (Heydərov Pərvərdigar Hüseyn oğlu), onun ata-anasını isə milis işçiləri, o cümlədən Sumqayıt şəhər milis idarəsinin 1-ci şöbəsinin rəisi Məmmədəli Dəmirov, Nuriyev familiyalı milis işçisi xilas etmişdilər (şahidin dindirilmə protokolu, 11 avqust 1988). «Moskviç»də olan başqa bir qadın Esiyan Albina Aleksandrovna da bu faktı təsdiqləyir: «Xatırlayıram ki, əvvəlcə uniformada olan iki milis işçisi yaxınlaşdı və bizə kütlənin arasından çıxmağa kömək etdilər, sonra isə mülki geyimdə olan oğlan bizi xəstəxanaya apardı». Esiyan Albinanın ifadəsində daha bir maraqlı məqam var. «Bizim maşını saxlayıb sənədlərimizi istədilər. Kimsə sənədimizi aldı. Kütlənin içərisində bir oğlan yaxınlaşıb sənədlərimizi dartıb həmin adamdan aldı, baxdı və dedi ki, bunlar erməni deyil, ləzgidirlər. Mən başa düşdüm ki, o kimdirsə, bizi xilas etmək istəyir» (11, c.1, i.v. 125–138).

Bu, Sumqayıt şəhər milis idarəsinin işçisi Heydərov Pərvərdigar Hüseyn oğlu idi. Bu məqam onun 6 iyul 1988-ci ildə verdiyi ifadəsində də öz əksini tapıb. Məmmədəli Dəmirov bununla kütləni azdırmaq və erməniləri xilas etmək istədiyini demişdi. Nizami Səfərovun ifadəsindən: «Milis işçiləri

adamları yarıb sərnişinlərə tərəf keçdilər. Milislərin arasında bir polkovnik vardı. Kütlə onlara daş və ağac atmağa başladı. Kimsə polkovnikin furajkasını vurub yerə saldı. Milis işçiləri «Moskviç»in sərnişinlərini aradan çıxarıb apara bildilər» (11, c. 16, i. v. 190–208).

Sumqayıtda yaşamış ermənilərin məlum hadisələrdən sonra İrəvanda verdikləri müsahibələr Azərbaycan sovet milisinin Sumqayıt talanları zamanı fəaliyyətinə işıq salır. Onu da qeyd edək ki, aşağıda təqdim olunan məlumatlar erməni müəlliflərin yaratdığı www.sumgait.info saytından götürülüb.

Melkumyan Roza Antonovnanın dediklərindən:

Yaşadığı ünvan: Sumqayıt şəhəri, 3-cü mikrorayon, ev 17/33 b, mən. 15

«O, Sumqayıt prokurorluğu və ya xüsusi idarədən (OBXSS) olan iki nəfər və qızıyla birgə bizim məhəlləyə çatdı. Sabir maşının nömrəsindən onların olduğunu yəqin etdi. Məmmədov özü isə ağlamağa başladı. Bizim qana bulaşmış halımızı görəndə az qala ürəyi dayanacaqdı. «Mən sizi heç bir vəchlə burada qoyub gedə bilmərəm. Elə indicə sizi də özümlə aparacam» – bizə belə dedi». Daha bir sitat: «Onlar bizi stansiyadan keçən yolla apardılar. Axşamüstü evlərinə çatanda orada da bir qrup adam toplaşmışdı. Quldurlar maşını saxlamaq istəyirdilər. Prokurorluqdan olan həmin kəslər biri arxada, biri isə qabaqda olmaqla maşını müşayiət etdilər» (11, c.1, i.v.1–5). Hakimiyyət orqanlarının fəaliyyəti ilə bağlı daha bir məqam: «Lyudanı prokurorluğa çağırdılar, o getdi. Məlum oldu ki, şifonerindən qızıl və pul dolu çantasını oğurlayan oğlanı tutublar» (231).

Xələfyan İrina Mixaylovnanın dediklərindən:

Yaşadığı ünvan: Sumqayıt şəhəri, 3-cü mikrorayon, ev 5/2, mən. 38

«Gecə on ikinin yarısı yaxın qohumlarımız ilə bərabər qəbiristanlıq tərəfə getdik. Yanımızda 5 milis işçisi var idi, onlar bizi tək buraxmadılar».

Petrosyan Vladimir Qriqoryeviç və Petrosyan (Xələfyan) Marina Mixaylovnanın dediklərindən:

Yaşadıqları ünvan: Sumqayıt şəhəri, 4-cü kvartal, ev 24, mən. 2

«Mən dedim: Gedək, milisə xəbər verək. Onlar gəlib bizi qoruyar. Qısası, milisə xəbər verdik. Onlar mikroavtobusla gələrək bizimlə birgə qəbiristanlığa yola düşdülər». «Həyətimizdə hüzr var idi, mağar qurulmuşdu. Süfrə açdıq, qohumlarımızla birgə stol arxasına keçdik. Milislər gözətçilik edirdi. Günorta saatlarında bir dəstə adamın bizə tərəf gəldiyinin şahidi olduq. Təxminən 7 milis işçisi var idi, lakin heç birinin silahı yox idi. Həyətdə olan ağac parçalarını, dəmir boruları götürərək dəstənin üzərinə getdilər» (231).

Qəmbəryan Valena Aramovnanın dediklərindən:
Yaşadığı ünvan: Sumqayıt şəhəri, 3-cü mikrorayon, ev 17/33, mən. 40
«Aprelin 5-i oğlum Romanla birlikdə Mərkəzi Komitəyə getdik, Axundovun qəbulunda olduq. Görüş zamanı: «Bizə ev verdiyiniz üçün təşəkkür edirəm. Lakin bizim buna ehtiyacımız yoxdur. Mən yoldaşımın öz vətənində dəfn olunmasını xahiş etmək istəyirəm, – dedim. – O, yoldaşım yad torpaqdadır – ifadəsini eşidəndə bir az incidi də! Heç kim, heç vaxt, heç yerdə, heç bir azərbaycanlı bizi saxlayıb «Niyə burada gəzirsən?» sualını verməyib. Gecə saatlarınadək uşaqlarımız həyətdə oynayıb, onların dostları elə həmin azərbaycanlılar olub. Xeyirdə-şərdə həmişə bir yerdə olmuşuq və heç kim də bizi incitməyib! ...Gəlib bizi şəhər milis idarəsinə apardılar və orada bizi müayinə etdilər. Ağ ciyərlərimdə və ayaqlarımda dözülməz ağrılar var idi, mənə çox çətin idi. Rəisin adı Məmmədov Urşan Feyruz oğlu idi» (231).
Avakyan Kamo Yuryeviçin dediklərindən:
Yaşadığı ünvan: Sumqayıt şəhəri, 3-cü mikrorayon, ev 5/2, mən. 47
«Bizim üçün bu, gözlənilməz deyildi. Ona görə ki, bu vaxta qədər, gündüz çağı artıq milis işçiləri oranı mühafizə edərək onları qovurdu».

Qəmbəryan Aleksandrın dediklərindən məlum olur ki, hətta Xaçmazdan milisə kömək də göndərilmişdi. Qəmbəryan deyir: «Təxminən gecəyarısı 15 milis işçisi gəldi. Onların bizə dediklərinə görə Xaçmazdan gəlmişdilər... Kütlənin bir hissəsi kənara çəkildi, onları xüsusi geyimdə olan milis işçiləri qovmağa başladılar. Sonra vəziyyət dəyişdi. Artıq kütlə özü milisə hücum çəkərək onları ayaq altına saldı. Milislər dedilər: «Biz burada qalıb sizi qorumalıyıq». Mən dedim: «Yaxşı, buyurun». Anam stul gətirdi, onlar əyləşdilər. Sonra əyinlərində qara plaş və ağ şərf olan daha bir neçə nəfər peyda oldu. Heç bir vəsiqə-filan olmadan bizə yaxınlaşdılar. Bizə başsağlığı verib dedilər: «Heç nəyə əl vurmayın, heç yerə tərpənməyin. Evdə qalın! Meyitə toxunmayın, yerini dəyişməyin! Hər şey necə var, elə də dursun! Biz hər şeyi həll edəcəyik. Bunu deyib getdilər. Bundan sonra daha dörd nəfər gəldi – Respublika Prokurorluğundan. Roma onlardan birini tanıdığını dedi. Qapı döyüləndə biz elə bildik həmin qara plaşdakı adamlardı. Əlimizdə bıçaq qapıya yaxınlaşaraq: «Kimdi?» deyə xəbər aldıq. – Respublika Prokurorluğundanıq – cavabı gəldi. Onlar da içəri keçdilər, bizə başsağlığı verdilər. Yenə də eyni sözlər: «Heç yerə getməyin, heç nəyə toxunmayın, barmaq izlərini götürəcəyik» – deyərək getdilər. Nə təcili maşın, nə də sıravi maşın

yox idi həmin vaxt. 3–4 nəfər təşkil edərək «ZİL» maşınına oturduq. Orada, həmçinin milis işçilərinə aid olan «Villis» maşını da var idi» (231).

Qəmbəryan Roman Aleksandroviçinin dediklərindən:

Yaşadığı ünvan: Sumqayıt şəhəri, 3-cü mikrorayon, ev 17/33, mən. 40

«Gecəyarısı 15 nəfərə yaxın milis işçisi gəldi. Gecə 1 radələrində isə Sumqayıt Prokurorluğundan iki müstəntiq gəldi. Onlar: «Hər şeyi olduğu kimi saxlayın. İndi biz ekspertlər çağıracağıq, fotoşəkillər çəkəcəklər» – dedi. Sonra Respublika Prokurorluğundan da gələnlər oldu...» (231)

Sumqayıtda baş verən hadisələrdən sonra ermənilər və onların tərəfdarları böyük hay-küy qaldıraraq geniş antiazərbaycan kampaniyasına başladılar. Bu hadisələr onların əlində Dağlıq Qarabağ avantürasını qızışdırmaq və Azərbaycan torpaqlarını ələ keçirmək üçün əsl kozır rolunu oynadı. Hadisələrdən dərhal sonra Ermənistan mətbuatında, SSRİ və xarici ölkə kütləvi informasiya vasitələrində, radio və televiziya kanallarında bir-birinin ardınca Sumqayıtda törədilmiş hadisələr haqqında həqiqətə uyğun olmayan, qurbanların sayını bir neçə dəfə artıran, bu hadisələrdə əsassız olaraq yalnız Azərbaycan xalqını günahkar elan edən materiallar getməyə başladı.

Erməni ziyalılarından Z.Balayan, S.Kaputikyan, S.Xanzadyan, Q.Ulubabyan və başqaları çoxsaylı müsahibələrdə Sumqayıtda baş verən hadisələri saxtalaşdıraraq, onları Azərbaycan xalqının ayağına yazmağa başladılar. Məsələn, S.Xanzadyan «Yurmala» qəzetinə verdiyi müsahibədə deyirdi: «Bu hadisələr (Sumqayıt hadisələri – İ.M.). Azərbaycanda yaşayan erməniləri, bütövlükdə erməni xalqını qorxutmaq üçün yaxşı planlaşdırılmış və təşkil olunmuş aksiya idi… Hesab edirəm ki, Sumqayıtda ermənilərin qətli Azərbaycan rəhbərlərinin razılığı ilə baş vermişdi» (189; 137, 11 mart 1988). Müasir erməni ədəbiyyatının «görkəmli nümayəndələrindən» olan bu yazıçı ağ yalana əl atmaqdan belə çəkinməyərək, guya, Sumqayıtda 32 nəfərin deyil, 450 erməninin öldürüldüyünü, hətta morqda birkalarda 161, 162 və s. sıra nömrəsi olan meyitləri öz gözləri ilə gördüyünü elan etmişdi. Maraqlıdır, görəsən, S.Xanzadyanı kim, hansı şəhərdə, hansı morqa buraxmışdı? Bəlkə, meyitlərin üzərində onların hansı milliyyətə aid olduqlarını da qeyd etmişdilər. Bu sualı heç kim erməni yazıçısına verməmişdi. Sonra o, daha ağ yalana əl ataraq yazır ki, üç gün Sumqayıtda müdafiəsiz erməni ailələrin vəhşicəsinə öldürür, qadınları zorlayır, sonra isə onları diri-diri tonqala atırdılar, günahsız uşaqları öldürürdülər. Moskva isə susurdu.

Yalnız üç gündən sonra, qətliamın dördüncü günü Sumqayıta qoşunlar yeridilmişdir (S.Xanzadyanın bu məqaləsi «Коммунист Сумгаита» (1988, 11 mart) qəzetində də kiçik ixtisarla getmişdi).

Faktların təhrif edilməsi, tarixi hadisələrin öz milli maraqları naminə saxtalaşdırılması erməni müəlliflərin xroniki xəstəliyidir. Erməniləri dünyanın ən yaxşı təbliğatçıları adlandıran ingilis jurnalisti Skotland Liddel hələ 1919-cu ildə yazırdı ki, provokasiya və fitnəkarlıqda erməni tatarı (azərbaycanlını – İ.M.) çox geridə qoyub (13, 245). O göstərirdi ki, Rusiyada və Qafqazda bir adam tapmazsan ki, ermənilər haqqında yaxşı söz desin… Lakin xaricdə onların təbliğatı sayəsində Avropa və bütün dünya onların tərəfindədir. S.Liddel erməni mətbuatının vəziyyəti gərginləşdirmək üçün ağ yalanlara əl atdığını, öz səhifələrində, guya, ermənilərə qarşı qırğınlar, vəhşiliklər haqda çoxsaylı məlumatlar yerləşdirməklə Qafqazdakı milli münaqişələrə görə məsuliyyət daşıdığını açıq bildirirdi (13, 240–245). XX əsrin əvvəllərində Rusiyanın Türkiyədə vitse-konsulu olmuş V.Mayevski isə yazırdı ki, «erməni müəllifləri… həqiqətdən diqqətlə düşünülmüş şəkildə, səylə yazırlar. Onlarda hər şey faktların şişirdilməsi əsasında qurulmuşdur. Onların bütün fəaliyyəti elə yalan-palanlar, elə eşidilməmiş qəddarlıq uydurmaqdan ibarətdir ki, bunlar ermənilərə qarşı rəğbət, türklərə qarşı isə nifrət doğursun» (57, 27).

Ermənilərin Sumqayıtla bağlı bu uydurmaları Sumqayıt hadisələri ilə bağlı yaradılmış istintaq qrupunun rəhbəri V.Qalkini də narahat etmişdi. Müxbirin «İstintaqa nə mane olur?» sualına müstəntiq «ən əvvəl şayiələr mane olur» cavabını vermiş və əlavə etmişdi ki, istintaq tərəfindən qəti müəyyən olunmuşdur ki, Sumqayıtda şuluqluqlar zamanı bir uşaq belə həlak olmamışdır. Həlak olanlar nə 400, nə 500 nəfər deyil, cəmi 32 nəfərdir (206). Qanını tökməklə erməniləri müsəlmanlara hücum etməyə sövq etdiklərini, sonunculardan layiqli cavab aldıqdan sonra dünyada «yazıq ermənilərə» rəğbət yaratmaq üçün haray-həşir qopardıqlarını yazır, bir ingilis zabitinin sözlərini nümunə gətirirdi ki, «daşnak üçün öldürülmüş erməni çox qiymətlidir» (13, 258).

İstintaqa ümumi rəhbərliyi həyata keçirən A.Katusev də istintaqa «Sumqayıt işi» ilə əlaqədar şayiə və uydurmaların mane olduğunu bildirmişdir (204).

Ermənilərin hadisələri saxtalaşdırmaq, istintaqı özlərinə uyğun məcraya yönəltmək üçün bütün vasitələrə əl atdıqlarını A.Katusevin müsa-

hibəsindəki bir məqam təsdiq edir. Q.Ulubabyan soyadlı Ermənistan sakini istintaq qrupuna məktubla müraciət etmiş, məktuba Sumqayıtda yaşamış vətəndaş A.Qriqoryanın ərizəsini də əlavə etmişdi. Ərizədə kütləvi iğtişaşlar zamanı A.Qriqoryanın üç uşağının və arvadının öldürülməsi haqqında məlumat da var idi. Bununla əlaqədar olaraq A.Qriqoryan 4 iyul 1988-ci il tarixli izahatında aşağıdakıları bildirmişdir: Biz hamımız, mən, arvadım, oğlum Pavel və qızım Yelena sağ-salamatıq. Mənim heç zaman Vladimir adlı oğlum olmayıb. Guya, mənim arvadımın və övladlarımın ölümü ilə bağlı mən heç kimə müraciət etməmişəm və bununla bağlı Moskvaya da getməmişəm. Mənə mənim adımdan yazılmış şəhadətnamənin surəti verilmişdir. Lakin oradakı imza mənim deyildir, mən belə imza atmıram. Ərizədə göstərilən məlumatlar uydurmadır» (204; 167, 184).

Ermənilərin Sumqayıtla bağlı gözləntilərinin əsl mahiyyətini, obyektivliyini və ədalət hissini itirməmiş Robert Arakelov öz kitabında təsdiq edir: «Stepanakertdə yüksək vəzifəli şəxslərin dilindən tez-tez aşağıdakı sözləri eşitmək olurdu. Sumqayıt bu an yaxşı fürsət idi, heyif ki, biz belə əlverişli məqamdan tam istifadə edə bilmədik» (76, 29).

İstintaqın gedişində aydın olmuşdur ki, xuliqanların bir qismini əvvəllər məhkumluğu olmuş cinayətkar ünsürlər, tüfeylilər təşkil edir. Yaxalanmış şəxslərin orta yaş həddi 20-yə yaxın idi.

Erməni millətindən olub itkin düşmüş şəxslərin axtarılması gedişində aydın olmuşdu ki, onların bir çoxunu Azərbaycan ailələri öz qanadı altına almışlar, bəziləri Bakıya getmişlər. Buna görə də müxtəlif şayiələr gəzməyə başlamışdı. Bununla əlaqədar olaraq şəhər prokuroru İ.Qayıbov çıxış edərək şayiələrin əsassız olduğunu, olduqca şişirdilmiş, uydurmalara çevrildiyini bildirmişdi (31).

Sumqayıt faciəsi, hər şeydən əvvəl, Azərbaycan xalqına qarşı yönəlmiş, yaxşı təşkil olunmuş provokasiya idi. Bu fitnəkarlığın törədilməsində məqsəd – erməni xalqının genosidinin davam etməsi haqqında SSRİ-də və xaricdə ictimai rəy yaratmaq və buna görə də Azərbaycanın tərkibində ermənilərin yaşamaq imkanlarının olmaması, Qarabağın Ermənistana verilməsi ilə bağlı tələblərə bəraət qazandırmaq idi.

Xarici kütləvi informasiya vasitələrində bu hadisələrin fövqəladə operativliklə işıqlandırılması indiyə qədər hamıya təəccüblü gəlir. Sumqa-

yıtda baş verənlər haqqında elə ertəsi gün bütün dünya mətbuatı danışmağa başlamışdı. Baş vermiş talanlar haqqında kinofoto sənədlər, şahid ifadələri əsas material kimi həm Ermənistanda, həm də Dağlıq Qarabağda antiazərbaycan isterikasının qızışdırılmasında mühüm vasitəyə çevrilmişdi.

Azərbaycanda baş verənlər çox primitiv şəkildə qələmə verilirdi: «Müsəlman azərbaycanlılar xristian erməniləri soyqırımına məruz qoymaq üçün Sumqayıt hadisəsini törədiblər». Nəticədə, dünya ictimai rəyi Azərbaycana qarşı yönəldilmiş oldu. Vəziyyəti azərbaycanlıların əleyhinə yönəldən bir məqam da Qərb ölkələrində Azərbaycan haqqında obyektiv məlumatların az olması idi. Əsas informasiya mənbələri ya ermənilər, ya da ki, ermənipərəst mərkəzlər idilər. Ən yüksək dövlət xadimləri belə münaqişə haqqında çox az, əksər hallarda yanlış məlumatlara malik idilər. Həm də nəzərə almaq lazımdır ki, Azərbaycanın dünya informasiya vasitələrinə çıxmaq imkanı, demək olar ki, yox idi. Ermənistana gəlincə isə onu dəstəkləyən güclü erməni diasporu xaricdə geniş maliyyə, lobbiçilik, informasiya təsirinə malik idi və onun vasitəsilə geniş ictimai rəyi öz xeyirlərinə dəyişdirə bilirdilər. Bu amillər Dağlıq Qarabağ hadisələrinin sonrakı gedişində Azərbaycanın mövqeyinin zəifliyinin, onun informasiya blokadasına alınmasının əsas səbəblərindən oldu.

# IV FƏSİL

# SUMQAYIT HADİSƏLƏRİNİN GEOSİYASİ NƏTİCƏLƏRİ

## 4.1. Azərbaycan SSR rəhbərliyinin Sumqayıt hadisələrinə reaksiyası

Sumqayıt şəhərində 1989-cu il fevralın 27–28-də baş vermiş hadisələr bütün dünyada geniş əks səda doğurmuş, kütləvi informasiya vasitələrinin, radio və televiziyaların əsas xəbər başlığına çevrilmişdi. Ancaq Azərbaycan rəhbərliyi bu dəfə də qeyri-çeviklik göstərərək əhalini operativ məlumatlandırmaq əvəzinə, gözləmə mövqeyi tutmuş, Moskvanın göstərişlərini gözləmişdi. Yalnız Azərbaycan rəhbərliyi martın 1-də Azərinform adından Sumqayıtda baş vermiş şuluqluqların dayandırılmasını, sənaye, nəqliyyat, ticarət, ictimai-iaşə, məişət xidməti müəssisələrinin normal ahənglə işləməsini və tədris müəssisələrində məşğələlərin davam etməsini qeyd etmiş, azğınlıq etməkdə ifşa olunmuş şəxslərin hüquq-mühafizə orqanları tərəfindən tutulduğunu bildirməklə kifayətlənmişdi (32, 1988, 2 mart). Martın 3-də isə respublika qəzetlərində Sumqayıtın siyasi vəziyyətinə dair Azərinformda bir qədər ətraflı məlumatı dərc edildi. Məlumatda fevralın 28-də Sumqayıtda bir dəstə xuliqanın şuluqluq saldığı, Dağlıq Qarabağda və Ermənistanda hadisələr ətrafında fitnəkar şayiələrin, təhrikçi söz-söhbətlərin təsiri altına düşmüş, səbatsız, yetkin olmayan adamların qeyri-hüquqi hərəkətlərə cəlb olunduğu, qeyri-şüuri azğınlıq və emosiyalar şəraitindən istifadə edən cinayətkar ünsürlərin quldurluq hərəkətləri törətdiyi, faciəli hadisələrin baş verdiyi, tələfatın olduğu bildirilirdi. Məlumatda partiya, sovet, hüquq-mühafizə orqanlarının vəziyyəti normal hala salmaq üçün qəti tədbirlər gördüyü diqqətə çatdırılır, cinayətkar hərəkətlərdə ifşa olunmuş şəxslərin hüquq-mühafizə orqanları tərəfindən yaxalandığı bildirilirdi (64).

Hadisələrin faciə halına gəlməsinə baxmayaraq, Sumqayıt əhalisi təmkin göstərmiş, əmək ahəngi pozulmamışdı. Şəhərin bütün sənaye, nəq-

liyyat, ticarət xidməti, təhsil müəssisələri lazımi rejimdə işləməkdə davam edirdilər. Şəhər xidmət bölmələrinin fasiləsiz işinin təmin edilməsi, yaşayış binalarının və ictimai binaların təmiri, ictimai asayişin qorunması ilə bağlı məsələlər həll edilirdi. Zərərçəkənlərə lazımi yardım göstərilirdi. Onlara təcili tibbi yardım göstərilməsi üçün Bakı və Sumqayıtın səhiyyə müəssisələrinin zəruri qüvvələri səfərbər edilmiş, bu məqsədlə 44 xüsusi briqada təşkil edilmişdi (9, v.56). Evsiz-eşiksiz qalmış şəxslər şəhər partiya komitəsi icra hakimiyyəti binalarında, mədəniyyət sarayında və mərkəzi meydanda toplaşmışdı (5000-dən çox adam – İ.M.). Həmin dövrdə Sumqayıtın əhalisi 250000 nəfər idi ki, onların 17500-nü ermənilər təşkil edirdi. Vəziyyəti normallaşdırmaq, məsələləri həll etmək üçün Azərbaycan KP MK bürosunun qərarı ilə Azərbaycan SSR Nazirlər Sovetinin sədri Həsən Seyidovun başçılıq etdiyi hökumət komissiyası yaradılmışdı. Eyni məzmunlu məlumat SİTA tərəfdən də yayılmış, lakin onun məlumatında Sumqayıtda 31 adamın öldürüldüyü, həlak olanlar arasında müxtəlif millətlərdən olan adamların, qocaların və qadınların olduğu bildirilirdi (32, 1988, 5 mart). Hadisələrdən dərhal sonra Azərbaycanda olan Sov.İKP MK Siyasi bürosu üzvlüyünə namizəd, SSRİ Ali Soveti Rəyasət Heyəti sədrinin birinci müavini P.Demiçev və Azərbaycan KP MK birinci katibi K.M.Bağırov Sumqayıtda yerli əhali ilə görüşmüş, şəhər həyatının əsas məsələləri, ictimai asayişin təmin edilməsi, antiictimai təzahürlərin təhqiqi üçün görülən tədbirlərlə maraqlanmışdılar (32, 1988, 5 mart).

Azərbaycan KP MK, Azərbaycan SSR Ali Sovet Rəyasət Heyəti və Nazirlər Soveti Sumqayıtda həlak olanların ailələrinə qohumlarına və yaxın adamlarına başsağlığı vermişdilər (32, 1988, 5 mart). Qəzetlərdə isə müxtəlif millətlərdən olan «zəhmətkeşlərin» xalqlar dostluğunu tərənnüm edən məktubları çap edilir, hətta guya, Ermənistan SSR və Dağlıq Qarabağda vəziyyətin normal hala düşdüyü, azərbaycanlı qaçqınların doğma yerlərə qayıtdığı, onlara yardım göstərildiyi haqqında qeyri-obyektiv məlumatlar verilirdi.

Azərbaycan KP MK 1988-ci il martın 16-da «Sumqayıt Şəhər Partiya Komitəsi bürosunun əhali arasında təşkilatçılığı işində böyük nöqsanları, siyasi naşılığı və şəhərdə faciəli hadisələrin qarşısını almaqda fəaliyyətsizliyi haqqında» məsələ müzakirə etdi. Qəbul edilmiş qərarda Sumqayıt Şəhər Partiya Komitəsinin siyasi naşılıq və məsuliyyətsizlik göstərdiyi qeyd olunur, faciəli hadisələrin Şəhər Partiya Komitəsinin bürosu və

onun katiblərinin, Şəhər Sovetinin İcraiyyə Komitəsinin respublikada yaranmış mürəkkəb şəraitə lazımınca qiymət verməməsi, sayıqlığı artırmaq, şəhərdə ictimai asayişi təmin etmək üçün konkret tədbirlər görməməsi, gözləmə mövqeyi tutmaları nəticəsində baş verdiyi qeyd olunurdu. İğtişaşların zəhmətkeşlərin, xüsusən gənclərin ideya-siyasi, beynəlmiləl tərbiyəsi sahəsində Sumqayıt icra orqanlarının böyük nöqsanlarının şəhər rəhbərlərinin qayğısızlığının və siyasi naşılığının nəticəsi olduğu bildirilir və mürəkkəb şəraitdə şəhərin bir sıra sovet, partiya rəhbərlərinin, partiya fəallarının, kommunistlərin qətiyyətsiz olması və özlərini itirməsi, başlanan hadisələrin nəticələrinin nə qədər təhlükəli ola biləcəyinə lazımınca əhəmiyyət vermədikləri vurğulanırdı.

Qərarda baş vermiş faciəli hadisələr üçün əsas məsuliyyət Şəhər Partiya Komitəsinin birinci katibi C.Müslümzadənin üzərinə qoyulmuşdu. Qərarda deyilirdi: «Dəfələrlə xəbərdarlıq edildiyinə baxmayaraq, o, məzuniyyətdən dərhal qayıtmaq barəsindəki göstərişləri yerinə yetirməmiş, Sov. İKP MK-nın tələblərinin yerinə yetirilməsi üçün yubanmadan işi təşkil etmək haqqında respublika partiya fəalları yığıncağının qərarına etinasızlıq göstərmişdir. Ağır vəziyyətdə Müslümzadə yoldaş partiya fəallarını şəhərdə vəziyyətin normal hala salınması uğrunda mübarizəyə səfərbər etməyə bacarmamış, özünə güvənməklə bağışlanmaz səhvə yol vermiş, siyasi rəhbər qarşısında qoyulan yüksək tələblər səviyyəsində olmamışdır» (6). MK bürosu C.M.Müslümzadəni «siyasi laqeydlik göstərdiyinə, təşkilatçılıq işində və siyasi işdə böyük nöqsanlara yol verdiyinə, partiyalıya yaraşmayan rəftarına, bunların Sumqayıtda faciəli hadisələrlə nəticələndiyinə, habelə MK bürosunda düzgün olmayan davranışına və baş vermiş hadisələrə özünütənqid ruhunda qiymət vermədiyinə» görə Sumqayıt ŞKP-nin birinci katibi vəzifəsindən azad etmiş və Sov. İKP sıralarından çıxarmışdı (6).

Qərarda Sumqayıt Şəhər İcraiyyə Komitəsinin sədri T.Məmmədov, katiblər M.A.Bayramova, A.X.Samolazov da baş vermiş hadisələrdə təqsirkar bilinmiş, «yaranmış şəraitdə süst və təşəbbüssüz hərəkət etdikləri, lazımi iş aparmamaları, yerlərdə vəziyyətdən xəbərsiz olduqları, adamların əhvali-ruhiyyəsinə yaxından bələd olmadıqları, yetişməkdə olan hadisələrin qarşısını almaq üçün vaxtında tədbirlər görmədikləri» vurğulanmışdır. MK bürosu şəhər DİŞ-in rəisi X.H.Cəfərovu da şuluqluq salan ünsürlərə müqavimət göstərməyə professional cəhətdən hazır olmamaqda ittiham etmişdi.

Faciəli hadisələrlə nəticələnmiş mənfi halların qarşısını almaq üçün vaxtında tədbirlər görmədiyinə görə T.Məmmədovun şəhər icraiyyə komitəsinin sədri vəzifəsindən uzaqlaşdırılması, ona, katiblər M.A.Bayramov və A.X.Samolazova uçot vərəqələrinə yazılmaqla şiddətli töhmət verilməsi, Şəhər DİŞ-in rəisi X.H.Cəfərovun partiya sıralarından xaric edilməsi haqqında qərar qəbul edilmişdi.

Azərbaycanın partiya rəhbərliyi şəhər partiya təşkilatından zəhmətkeşlərin beynəlmiləl tərbiyəsini, ideoloji və siyasi tərbiyə işini kökündən yaxşılaşdırmaq, bu işdə ciddi nöqsanları və qüsurları aradan qaldırmaq üçün konkret tədbirləri həyata keçirməyi tələb etmiş, şəhərdə vəziyyətin normal hala salınmasını, asayişin, mütəşəkkilliyinin və intizamın möhkəmləndirilməsi işinin hər vasitə ilə gücləndirilməsini təşkil etməyi tapşırmışdı (6) Daxili İşlər Nazirliyindən Sumqayıt şəhər DİŞ-in şəxsi heyətini möhkəmlətmək, milis işçilərinin peşə hazırlığını artırmaq üçün təcili tədbirlər görülməsi tələb edilmişdi (6).

Azərbaycan KP MK-nın bu qərarından görünür ki, Azərbaycan rəhbərliyi, o cümlədən Sumqayıt şəhər rəhbərliyi üçün baş vermiş hadisələr gözlənilməz olub. Amma bununla belə respublika rəhbərliyi bu hadisələrə ilkin siyasi qiymət verməklə onun Azərbaycan xalqı və dövləti ilə heç bir əlaqəsinin olmadığını bəyan etmiş oldu. Bu həm də o demək idi ki, Sumqayıt hadisələri Azərbaycanın yürütdüyü siyasət olmayıb, hələ səbəbləri araşdırılmalı olan bir müəmmadır.

Azərbaycan KP MK bürosunun yuxarıda göstərilmiş qərarında Sumqayıtda iğtişaşa imkan yaratmış səbəblərin və şəraitin nəzərdən keçirilməsi üçün Azərbaycan KP MK-nın ikinci katibi V.N.Konovalov başda olmaqla komissiya yaradılmışdı.

Büronun qərarına uyğun olaraq Sumqayıt şəhər PK plenumu keçirilmiş, C.M.Müslümzadə birinci katib vəzifəsindən azad edilmiş, bundan əvvəl Naxçıvan MSSR Nazirlər Sovetinin sədri vəzifəsində işləmiş Zülfi Hacıyev Sumqayıt şəhər PK-nın birinci katibi seçilmişdi.

Sumqayıt şəhər XDS-in sessiyasında da təşkilati məsələlərə baxılmış T.Məmmədov sədr vəzifəsindən azad edilmiş, bundan əvvəl Sumqayıt alüminium zavodunun direktoru işləmiş R.F.Eminbəyli Sumqayıt şəhər XDS İK-in sədri seçilmişdi (19, 16).

Respublika qəzetlərinin 11 mart 1988-ci il tarixli nömrəsində Azərbaycan SSR Nazirlər Soveti yanında Xalq Təsərrüfatı İdarəetmə İns-

titutunda tanınmış iqtisadçıların, alimlərin, o cümlədən Azərbaycanda yüksək vəzifələrdə işləyən ermənilərin iştirakı ilə DQMV-in sosial-iqtisadi inkişafı ilə bağlı görüşün materialları dərc edildi. Həmin görüşdə SSRİ EA-ın akademiki, «Əsas fondların, əsaslı vəsait qoyuluşlarının və yeni texnikanın iqtisadi səmərəliliyi» problemi üzrə Elmi Şuranın sədri Tiqran Xaçaturov da iştirak etmişdi. Həmin görüşdə iqtisadçıların DQMV, Azərbaycan SSR, Ermənistan SSR, SSRİ-in sosial inkişafına dair gətirdikləri müqayisəli göstəricilər bir daha sübut etdi ki, əksər göstəricilər üzrə Dağlıq Qarabağ Azərbaycan, Ermənistan və SSRİ-nin inkişaf göstəricilərini dəfələrlə üstələyir. Həm də sübut olunmuşdu ki, vilayətin iqtisadiyyatının sabit fəaliyyət göstərməsi, onun iqtisadi həyatının səmərəliliyi Azərbaycanın digər iqtisadi rayonları ilə, ümumən respublikanın xalq təsərrüfatı kompleksi ilə qarşılıqlı əlaqələrdən həlledici dərəcədə asılıdır. Görüşdə iştirak edən T.Xaçaturov özü etiraf etmişdi ki, bu məsələlər barəsində onun əlində olan məlumatlar tam deyil (32, 1988, 11 mart).

1988-ci il martın 25-də Sumqayıt Şəhər Soveti İcraiyyə Komitəsinin iclasında şəhərdə vəziyyəti normallaşdırmaq üçün tədbirlər müəyyənləşdirildi. Qəbul edilmiş qərarda faciəli hadisələrdən dərhal sonra iğtişaşların aradan qaldırılması, əhalinin həyat və sağlamlığının qorunması üçün görülmüş işlər də öz əksini tapmışdı. Belə ki, təcili yardım xəstəxanasında zərərçəkənlərə yardım üçün xüsusi şöbə təşkil edilmiş, Bakıdan əlavə xüsusiləşdirilmiş briqadalar göndərilmişdi. Evsiz qalmış və mənzillərini tərk etmiş ailələrin müvəqqəti yaşaması üçün «Metallurq», «Energetik» sanatoriya-profilaktoriyaları, OADKYC-nin şəhər məktəbinin binası, Nasosnı (indiki Hacı Zeynalabdin Tağıyev) qəsəbəsində bina ayrılmışdı ( v.42). Onlar üçün xüsusi həkim briqadaları təşkil olunmuş, gündə 3 dəfə yemək, pulsuz ərzaq və ilkin tələbat malları verilmişdi. Bu məqsədlə 94618 manat 73 qəpik pul xərclənmişdi. Ölənlərin ailələrinə və zərərçəkənlərə 465266 manat məbləğində maddi yardım göstərilmişdi. 201dağıdılmış və qarət edilmiş mənzil təmir edilmişdi.

Şəhər İcraiyyə Komitəsində erməni millətindən olan şəxslərin qəbul edilməsi, onların qaldırdıqları məsələlərə dərhal baxılması təşkil edilmiş, Sumqayıt və Bakıda onlar üçün 58 mənzil ayrılmışdı. Məişət əşyalarının alınmasında da onlara kömək göstərilmişdi. Əhali arasında izahat işləri aparılır, ictimai asayiş, insanların təhlükəsizliyini qorumaq üçün tədbirlər görülürdü. Bunanla yanaşı, şəhər təsərrüfatının işini yaxşılaşdırmaq,

ideya-tərbiyə işin təkmilləşdirmək, şəhərdə vəziyyəti daha da normalaşdırmaq üçün ilkin tədbirlər planı təsdiq edilmişdi (189, 111–114). Planda digər məsələlərlə yanaşı, iğtişaşlarla əlaqədar olaraq ölkənin digər şəhərlərinə və regionlarına getmiş erməni millətindən olan Sumqayıt şəhər sakinlərinin qaldıqları yeri müəyyənləşdirmək üçün tədbirlərin görülməsi, onların şəhərə qayıtmaları üçün həmin regionlara sovet və ictimai orqanların, əmək kollektivlərinin nümayəndələrini göndərmək qərara alınmışdı. Şəhər İcraiyyə Komitəsinin 19 aprel 1988-ci il tarixli iclasında Sumqayıtı tərk etmiş erməni millətindən olan şəxslərlə iş üzrə komissiya da yaradılmışdı. Komissiya Sumqayıtdan getmiş ermənilərin Moskvaya, MK-yə göndərdikləri məktubları da araşdırmalı idi. Bu məktubların əksəriyyəti Moskvadan, Kislovodskdan, Armavirdən, Saratovdan göndərilmişdi. Məktubların əksəriyyətində ermənilərin Sumqayıta qayıtmamaq arzusu bildirilir, onlara dəymiş maddi ziyanın ödənilməsi və məskunlaşdıqları şəhərdə yaşamaları üçün şərait yaradılması tələb olunurdu. Bütün bunlar bir neçə məqama diqqət yetirməyi zəruri edirdi. Birincisi, ermənilər daha yaxşı həyat üçün Sumqayıt hadisələrindən bir bəhanə kimi istifadə edərək əvvəldən şəhəri tərk etməyə hazırlaşırdılar. Bu isə yaxşı düşünülmüş və həyata keçirilmiş planın mövcudluğundan xəbər verir. 1988-ci ilin mayın əvvəllərində Sumqayıtdan Ermənistana köçmüş ermənilərin sayı 2530 nəfər idi ki, onların cəmi bir neçəsi zərər görmüş insanlar idi (9, v.43). Onların geri qayıtmaları üçün Ermənistana Azərbaycan SSR hökumətinin səviyyəsində xüsusi komissiya göndərilsə də, çox az adam geri qayıtmışdı. Deməli, şəhəri tərk edənlərin yalnız cüzi hissəsi Ermənistana getmiş və bir müddətdən sonra da oranı tərk etmişlər. Bu onu sübut edir ki, Ermənistan üçün Sumqayıt erməniləri artıq oynanılmış kart idi və onlardan təbliğatda istifadə etməkdən ötrü onların Ermənistandan kənarda yaşamaları daha münasib idi. Yeri gəlmişkən, bu plan sonralar da işə yaramışdı. Azərbaycandan köçən ermənilərin əksəriyyəti Ermənistana buraxılmamış, Rusiyada məskunlaşmışdılar.

Həmin vaxt Ermənistan SSR Nazirlər Soveti sədrinin müavini işləmiş, Ermənistanda Sumqayıtdan gəlmiş erməni qaçqınlarla bağlı komissiyaya başçılıq etmiş V.Movsesyan «Голос Армении» qəzetinin 26 dekabr 2009-cu il tarixli nömrəsində iddia edir ki, guya, Sumqayıtda yaşayan 18600 erməninin 18000-ni Ermənistana gəlmişdi (162).

Bununla bağlı o vaxt Sumqayıtda olan Sov.İKP MK partiya-təşkilat şöbəsi müdirinin müavini Xarçenkonun məlumatları çox əhəmiyyət kəsb

edir. Fevralın 29-da ermənilərin toplaşdığı mədəniyyət sarayında Xarçenkonu girov götürən ermənilər onlara şəhəri tərk etmək üçün təyyarə verilməsini tələb etmişdilər. Xarçenkonu ermənilər yalnız Moskvanın onları köçürmək planının olduğuna inandıqdan çonra buraxmışdılar. Xarçenkoya o zaman bir məqam böyük təsir göstərmişdi: Bütün Sumqayıt erməniləri Ermənistana deyil, Rusiyaya getmək istəyirdilər: «Bizim söhbət etdiyimiz heç bir kəs Ermənistana uçmaq arzusunu bildirmədi. Onların hamısı Krasnodar, Stavropol və ya Rostov vilayətinə aparılmalarını istəyirdilər. Nə üçün? Ermənilər deyirdilər: «Biz Ermənistanda heç kimə lazım deyilik. Onlar bizi əsl erməni hesab etmirlər, əslində, biz əsl erməni də deyilik» (207, 66).

Ç.Sultanov da Azərbaycan KP MK məsul işçisi R.Axundovun sözlərinə əsaslanaraq xilas edilmiş ermənilərin hamısının Rusiyaya, Krasnodar və Rostov vilayətlərinə getmək arzusunda olduqlarını, heç kimin Ermənistana getmək istəyində olmadığını göstərir (201, 187). V.Nikolayev də bu fikirləri təsdiq etmişdir (175). Bütün bunlar Sumqayıt ermənilərinin əksəriyyətinin, guya, Ermənistana getmələri haqqında erməni təbliğatının növbəti uydurmasını tamamilə təkzib edir.

Üçüncüsü, Ermənistan SSR-dən deportasiya edilmiş azərbaycanlılara dəymiş maddi, mənəvi ziyanın ödənilməsi ilə bağlı edilən müraciətlərin təmin edilməsi üçün erməni rəhbərliyi hər hansı tədbir gördümü? Yox, çünki Moskvada və digər mərkəzlərdə (elə Bakıda – İ.M.) onları müdafiə edən lobbiləri yox idi. Sumqayıtda isə zərər çəkmiş ermənilərə maddi yardım göstərilməsi üçün Azərbaycan büdcəsindən külli miqdarda vəsait ayrılmışdı. Həlak olanların hər birinə 500 manat, onun ailəsinin hər üzvünə 100 manat, bütövlükdə 145 nəfər 32600 manat həcmində yardım almışdı (9, v.44).

Təkcə Azərbaycan SSR Nazirlər Sovetinin 11 mart 1988-ci il tarixli sərəncamı ilə Sumqayıt Şəhər İcraiyyə Komitəsinin büdcəsindən bu məqsədlə 364000 manat pul ayrılmışdı. Erməni ailələrinə digər yardımlar da göstərilmiş, yeni mənzillər verilmiş, ümumiyyətlə, ermənilərin şəhərdə təhlükəsiz və normal şəraitdə yaşamaları üçün zəruri addımlar atılmışdı. Ermənilərə istehsal müəssisələri, müxtəlif kollektivlər vasitəsilə də maddi yardımlar göstərilirdi. Özü də bu o zaman edilirdi ki, sumqayıtlıların bir çoxu ağır məişət şəraiti olan «Naxalstroy»larda yaşayırdı. Şəhərin özündə isə Ermənistandan qovulmuş 18000-dən çox azərbaycanlı məskunlaş-

mışdı. Operativ surətdə həlak olanların 24 ailəsinə və mənəvi zədə alanların 2 ailəsinə onların xahişi ilə Bakıda mənzil verilmişdi (9, v.45).

Bütün bu faktlar sübut edir ki, 1988-ci il fevral hadisələrindən sonra da həm respublika, həm şəhər, həm də idarələr səviyyəsində ermənilərə maddi-mənəvi dəstək göstərilir, onların hüquqlarının pozulmasına yol verilmirdi. Bu faktlar ermənilərin Sumqayıtda, eləcə də bütün Azərbaycanda ayrı-seçkiliyə, hətta soyqırımına məruz qalmaları haqqında əsassız iddialarını tamamilə təkzib edir. Halbuki erməni şovinistlərinin həyata keçirdikləri soyqırımı və deportasiya siyasəti nəticəsində elə həmin ilin – 1988-ci ilin sonlarında Ermənistan SSR-də artıq bir nəfər belə azərbaycanlı qalmamışdı.

Sumqayıt hadisələri ilə bağlı bir versiya da diqqəti cəlb edir: bu hadisələr respublika rəhbərliyini nüfuzdan salmaq, onun respublikanı idarə etmək iqtidarında olmaması və buna görə də Azərbaycanda qayda-qanun yaratmaq zəruriliyinə mərkəzi inandırmaq məqsədilə törədilmişdi. Təsadüfi deyildi ki, bu hadisələrin işıqlandırılmasında xarici ölkə KİV-ləri fövqəladə operativlik nümayiş etdirmişdilər. Hadisələrin səhəri günü bütün dünyada belə bir fikir formalaşdırılmasına başlanmışdı ki, müsəlman azərbaycanlılar xristian erməniləri ona görə öldürürlər ki, onlar Qarabağda azad yaşamaq istəyirlər (165, 36).

1988-ci il mayın 7-də Sumqayıt hadisələri yenidən Azərbaycan KP MK bürosunda müzakirə edildi. Gərgin keçən müzakirələrdən sonra yeni qərarlar qəbul olundu. Bu qərarlar içərisində Sumqayıt şəhərində vəziyyətin normallaşdırılmasına dair hökumət komissiyasının hesabatı haqqında qərar və 1988-ci il fevralın 27–29-da Sumqayıtda faciəli hadisələrə gətirib çıxarmış səbəblər haqqında qərar (protokol №74) xüsusi qeyd edilməlidir (9). Sumqayıt şəhərində vəziyyətin normallaşdırılmasına dair görülmüş tədbirlər haqqında qərarda hökumət komissiyasının gördüyü işlər üzrə hesabat dinlənilmişdi. Hesabatda həm Sumqayıtda vəziyyətin normallaşdırılması, asayişin təmin edilməsi, həm də şəhərin erməni əhalisinə göstərilən yardım, onların problemlərinin operativ həlli ilə bağlı görülən tədbirlər öz əksini tapmışdı (9, v.34–49).

Hesabatla bağlı Azərbaycan KP MK bürosunun qəbul etdiyi qərarda hökumət komissiyasına Sumqayıt şəhərini tərk etmiş erməni millətindən olan şəxslərin tezliklə qayıtmaları istiqamətində şəhər partiya komitəsi və icraiyyə komitəsi ilə əlavə tədbirlər görülməsi tapşırılmışdı. Ermənilərin

qaldırdıqları məsələlərə dərindən və diqqətlə yanaşılması, onların ehtiyac və problemlərinin öyrənilməsi, onlarla həssas şəkildə izahat işi aparılması öz əksini tapmışdı. Qərarda bu işin Ermənistan SSR partiya, sovet orqanları ilə sıx əlaqədə aparılması da xüsusi vurğulanmışdı (9, v.11).

Azərbaycan KP MK bürosunun 7 may 1988-ci il tarixli iclasında Sumqayıtda kütləvi iğtişaşlara gətirib çıxarmış səbəblər və şəraitin təhqiqatı ilə bağlı komissiyanın hesabatı da dinlənilmişdi. Hesabat Azərbaycan KP MK Sumqayıt hadisələri ilə bağlı əvvəlki qərarlarından heç nə ilə fərqlənmirdi. Burada da şəhər partiya komitəsi və onun rəhbərliyi ittiham edilirdi. Hadisələrin baş verməsi zəhmətkeşlərin ideya-siyasi, beynəlmiləl tərbiyəsindəki nöqsanlarla əlaqələndirilir, sosial problemlərə lazımi diqqətin olmaması, mədəni istirahətin təşkilində nöqsanlar, mürəkkəb ekoloji vəziyyət, daxili işlər orqanlarının hazırsızlığı, xüsusi kontingentlərində nöqsanlar xüsusi vurğulanırdı (9, v.52–77).

Tamamilə məxfi qrif adı altında saxlanılan bu sənədlərdə bir sıra məqamlar diqqəti cəlb edir. Dağlıq Qarabağ vilayət partiya komitəsinin keçmiş birinci katibi Boris Kevorkovun və başqa şəxslərin Dağlıq Qarabağda baş vermiş hadisələrə görə məsuliyyəti məsələsinə baxılarkən B.Kevorkov çıxış edərək göstərmişdi ki, vilayətdə erməni millətçiləri tərəfindən uzun müddət ərzində Dağlıq Qarabağı Azərbaycandan ayırmaq üçün fitnəkar, qızışdırıcı məktublar və vərəqlər açıq şəkildə yayılır, imzalar və pul vəsaitləri toplanır. Moskvaya, mərkəzi orqanlara nümayəndə heyətləri göndərilirdi. Ermənistandan gəlmiş emissarlar vilayətdə açıq-aşkar antiazərbaycan təbliğatı aparır, pozuculuq fəaliyyəti ilə məşğul olurdular.

B.Kevorkovun çıxışından məlum olur ki, o hələ hadisələr başlamazdan xeyli əvvəl – 1984–1985-ci illərdə bu haqda Bakıya məlumatlar göndərmiş, Z.Balayanın «Ocaq» kitabını buraxdığını, S.Xanzadyanın DQMV-in Ermənistana verilməsi ilə bağlı Moskvaya məktubla müraciət etdiyini Azərbaycan rəhbərliyinin diqqətinə çatdırmışdı.

Bir məqam da diqqəti cəlb edir. Kevorkov qiyamçıların liderlərinin kimliyinin məlum olduğunu, onların cəzalandırılması vacibliyi haqqında məsələni Azərbaycan rəhbərliyi qarşısında qaldırsa da, Moskvanın Azərbaycandakı qeyri-rəsmi nümayəndəsi, Azərbaycan KP MK-nın ikinci katibi V.Konovalov: «Bu artıq başqa mövzunun söhbətidir, bu barədə sonra danışarıq», – deyərək onun sözünü kəsmişdi (30, 179–180).

Bakıda B.Gevorkovu işdən çıxarıb yerinə qatı millətçi H.Paqosyanın gətirilməsini də razılıqla qarşıladılar. Hərçənd, onun Bakının göstərişlərinə əməl etmədiyini, Yerevana meyil göstərdiyini B.Gevorkov bildirmişdi.

Daha bir məqam: B.Gevorkov həmin iclasda deyirdi ki, Dağlıq Qarabağın partiya, sovet, təsərrüfat rəhbərlərinin çoxu separatistləri müdafiə edirdi. Onlar, görünür, bu məsələyə Moskvada bəzi dairələrin müsbət yanaşdığına, məsələnin tezliklə onların istəyinə uyğun həll ediləcəyinə əmin idilər. Lakin Azərbaycan rəhbərliyi bu dairələrin kimlər olduğunu araşdıraraq, separatizmə Moskvadan kimlərin dəstək verdiyini müəyyənləşdirə bilmədi. Azərbaycan hakimiyyəti vəziyyəti sabitləşdirmək üçün inadla səy göstərsə də, Ermənistan Azərbaycanın daxili işlərinə kobud surətdə müdaxilə etməkdə davam edirdi. Belə şəraitdə Azərbaycan hakimiyyəti təşəbbüsü ələ almağı, respublikanın hüdudlarını qorumaq və xalqı böhrandan çıxarmağı bacarmadı.

Həmin ilin mayında Azərbaycan rəhbərliyində dəyişiklik edildi və Azərbaycan KP MK-ın birinci katibi vəzifəsində Kamran Bağırovu Əbdürrəhman Vəzirov əvəz etdi. Lakin bu kadr dəyişikliyi də vəziyyətin dəyişməsinə kömək etmədi. Tamamilə Moskvanın göstərişi ilə hərəkət edən, Azərbaycanın qayğı və problemlərindən uzaq, real vəziyyəti dərk etmək iqtidarında olmayan Ə.Vəzirovun fəaliyyəti Dağlıq Qarabağ məsələsində Azərbaycanın mövqelərinin zəifləməsinə, vilayətin getdikcə Azərbaycan hakimiyyətinin nəzarətindən uzaqlaşmasına, Ermənistanın isə əksinə, Dağlıq Qarabağı ələ keçirmək siyasətinin daha açıq, təcavüzkar xarakter almasına gətirib çıxardı.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev həmin dövrdə Azərbaycanda cərəyan edən neqativ prosesləri təhlil edərək göstərirdi: «Səksəninci illərin sonlarından Azərbaycana qarşı etnik təmizləmə siyasəti aparılmışdır. Azərbaycan çox böyük problemlərlə üzləşmişdir. Əgər Heydər Əliyev o vaxt, xalqımız üçün həlledici məqamlarda Azərbaycanda olsaydı, bir qarış torpağımız işğal altına düşməzdi. Əfsuslar olsun ki, o illərdə hakimiyyətdəki insanlar vəzifə borcunu ləyaqətlə yerinə yetirə bilməmişlər və beləliklə, Sovet İttifaqının dağılması ərəfəsində Azərbaycan böyük çətinliklərlə üzləşmişdir. Bizə qarşı elan edilməmiş müharibə başlamışdır. Torpaqlarımız işğal olunmağa başlamışdır» (26, 27 may).

## 4.2. SSRİ rəhbərliyinin mövqeyi və erməni təcavüzünün genişlənməsi

1985-ci ildən SSRİ-də M.Qorbaçovun «yenidənqurma» siyasətinin həyata keçirilməsində buraxılmış səhvlər ölkədə milli-etnik münasibətlərin gərginləşməsinə səbəb oldu. Bir müddətdən sonra müxtəlif regionlardakı münaqişələr ölkədə daxili milli-siyasi münasibətlərin yeni mərhələyə keçdiyini göstərdi. Milli zəmində baş verən hadisələrin bir mərkəzdən idarə olunması, eyni zamanda qarşıdurmalarda ən müxtəlif, hətta zidd qütblərin maraqlarının üst-üstə düşməsi aydın görünürdü. SSRİ rəhbərliyinin yuxarı eşelonlarında bir-biri ilə mübarizə aparan müxtəlif siyasi qruplar millətlərarası toqquşmalardan öz maraqları üçün istifadə edirdilər. Qorbaçovun dəstəklədiyi yenidənqurma tərəfdarları öz rəqibləri olan DTK-nı ölkədə vəziyyətə nəzarət edə bilməməkdə, DTK isə baş vermiş hadisələrin yanlış «yenidənqurma» siyasətinin nəticəsi kimi ortaya çıxdığını iddia edir və DTK-nın əvvəlki təsir imkanlarını qaytarmağa çalışırdı. Başqa bir səbəb də var idi. Qorbaçov və komandası SSRİ-dəki erməni mafioz qruplaşmaların dəstəyinə arxalanır, Avropa və ABŞ-dakı erməni diasporunun vasitəsilə SSRİ-ni iqtisadi böhran vəziyyətindən çıxarmağa ümid edirdilər. Sovet İttifaqının yenidənqurmaçı rəhbərliyi erməni diasporunun vasitəsilə ABŞ və Fransanın siyasi və iqtisadi dəstəyini almağa çalışırdı. Diaspor isə əksinə, SSRİ rəhbərliyinə öz tələblərini irəli sürürdü. M.Qorbaçovun ətrafı tam erməniləşdirilir və Dağlıq Qarabağın Ermənistana verilməsi onun qarşısında tələb kimi qoyulurdu. Bununla da M.Qorbaçov və komandası, əslində, ermənilərin girovuna çevrilirdilər.

Beləliklə, SSRİ-də yaşayan xalqlar bir-biri ilə mübarizə aparan daxili və xarici qüvvələrin siyasi planlarının qurbanına çevrildilər. XX əsrin iki dünya müharibələrindən sonra ən böyük hadisəsi – SSRİ-nin dağılması səhnəsində ən müəmmalı avantüra-ssenarilərin oynanılmasına başlandı. Həmin müəmmalardan biri də Sumqayıt hadisəsi oldu.

Sumqayıt hadisələri Sovet rəhbərliyində çaşqınlıq yaratdığından dərhal informasiya verilmədi. Yalnız martın 1-də Sumqayıt hadisələri ilə bağlı SİTA-nın kiçik məlumatı verildi. Məlumatda fevralın 28-də Sumqayıt şəhərində bir qrup xuliqanın şuluqluq salması, azğınlıq və zorakılıq hallarının olması qeyd olunur, şəhərdə həyatı normal hala salmaq, intizam və ictimai asayişi təmin etmək üçün tədbirlər görüldüyü, istintaq orqanlarının təhqiqat apardıqları vurğulanırdı (121, 1988, 1 mart).

Ermənilər və onların Moskvadakı tərəfdaşları Sumqayıt hadisələrindən dərhal sonra Qarabağ məsələsində yeni taktikanı müəyyənləşdirməyə başladılar. Sumqayıt hadisələrindən dərhal sonra Azərbaycan əleyhinə siyasi hücum başladı. Moskva Dağlıq Qarabağa dair çıxışların tonunu dəyişdi. DQ məsələsində ictimai rəy Ermənistanın xeyrinə dəyişdikdən sonra artıq müzakirə edilmiş və haqqında qərar çıxarılmış bu məsələyə yenidən qayıtmaq üçün imkan əldə etdilər. **(Yeri gəlmişkən, fevralın 26-da Qorbaçovun köməkçisi Şahnazarov S.Kaputikyan və Z.Balayana 1 ay gözləməyi tövsiyə etmişdi. S.Kaputikyan isə Moskvadan Yerevana qayıtdıqdan sonra kütlə qarşısında çıxışında «biz bu məğlubiyyəti qələbəyə çevirəcəyik» demişdi – İ.M.)** Fevralın 29-da Sumqayıt talanlarının sonuncu günü Siyasi büro üzvü Demiçev Bakıdan Stepanakertə gələrək mitinqdə elan etdi ki, Sov.İKP MK-nın Siyasi bürosu Dağlıq Qarabağ probleminin müzakirəsinə qayıtmaq haqda qərar qəbul edib (233).

Yerevanda bu missiyanı Sov. İKP MK katibi D.İ.Dolgix yerinə yetirirdi, onun sərəncamına daxili qoşunların böyük kontingentini vermişdilər. Hələ Sumqayıt hadisələrindən əvvəl, fevralın 25-də Yerevan şəhərinə 5000 nəfərlik hissə yeridilmiş, sonra isə əlavə qüvvələr cəlb edilmişdi. Buna baxmayaraq, Qarabağa dəstək mitinqləri davam edirdi, bu mitinqlərə hər gün bir milyona yaxın insan toplaşırdı. Sonra isə kütləvi etiraz tətilləri başlandı (229).

Martın 2-də səhər tezdən Ermənistan MR MK-də, birinci katib K.Dəmirçyanın kabinetində M.Qorbaçovun buraya ezam etdiyi partiya funksionerləri Dolgix və Lukyanovun erməni ziyalılarının nümayəndələri ilə görüşü keçirildi. Dolgix Sumqayıt hadisələrini yada salaraq onlara demişdi: «Nəhayət ki, istəyinizə çatdınız? Srağagün Sumqayıtda başlanan iğtişaşlar nəticəsində insanlar həlak olubdur. İyirmiyə yaxın adam öldürülüb, on iki nəfər zorlanıb, 200-ə yaxın mənzil yandırılmış, dağıdılmış və qarət edilmişdir. Yüzlərlə maşın, mağaza, dükan yandırılmışdır».

Görüşdə iştirak etmiş Qarabağ hərəkatının ən nüfuzlu və fəal xadimlərindən biri İqor Muradyan deyib ki, xalqın taleyini «Qorbaçovun portretləri və yenidənqurmanı müdafiə edən şüarlarla dinc mitinqlərə çıxanlara deyil, ancaq talanlar və genosidə qadir, ramedilməz və vəhşi, kortəbii qüvvələrin hökmünə vermək olmaz. Yaranmış vəziyyətdə siz Qarabağı Moskvanın himayəsinə götürməlisiniz (233).

Elə buradaca bir qədər sonra Dağlıq Qarabağda Arkadi Volskinin rəhbərliyi ilə yaradılmış xüsusi idarəçilik rejiminin ideyası ortaya atıldı. Yuxarıdakı sitatdan görünür ki, Mixail Qorbaçovun sonradan həyata keçirdiyi bu ideyanı da elə ilk dəfə İqor Muradyan, Sumqayıt hadisələrindən dərhal sonra səsləndirib. Bu hadisə yalnız Azərbaycanın milli maraqlarının əleyhinə idi və onun düşmənlərinə hücum üçün əlavə arqumentlər verirdi. Sonralar istintaqın gedişi və çox mətləblərin aydınlaşması nəticəsində bu böyük təxribatın gizlinləri açılmağa başladı.

İndiyə qədər hamını düşündürən bir suala hələ də cavab tapmaq mümkün olmamışdır. Birbaşa Moskvaya tabe olan hərbi hissələr bu zaman harada idilər. Axı Sumqayıt ətrafında ittifaq tabeli çoxlu rejim obyektləri var idi, çox sayda hərbi hissələr cəmləşmişdi. Elə Sumqayıtın lap yaxınlığında olan «Nasosnı» qəsəbəsi Cənubi Qafqazda Sovet Ordusunun ən böyük hərbi bazalarından biri idi. Sumqayıtdan 6–7 dəqiqəlik məsafədə yerləşən Pirəküşkül qəsəbəsində isə DTK-ya tabe olan xüsusi hərbi qüvvələr, Əfqanıstandan çıxarılmış desant-hücum briqadası yerləşirdi. Güc strukturlarının baş verənlərə müdaxilə etməməsi talan və zorakılıqların genişlənməsinə və fevralın 28-də davam etməsinə gətirib çıxarmışdı. Maraqlı məqam ondan ibarətdir ki, Sumqayıtda fevralın 26-da sanksiyaya verilməmiş mitinqlər və etirazlar başlayır, 27–28 fevralda dinc sakinlər həlak olurlar. Lakin üç gün ərzində mərkəz faktiki olaraq hadisələrə müdaxilə etməməklə, faciənin miqyasının genişlənməsinə səbəb olur. Şəhərdə talan və qarətlərin qarşısını ala bilməkdə çətinlik çəkən yerli hüquq-mühafizə orqanları vəziyyətə nəzarət etmək üçün şəhərə göndərilmiş general-leytenant Krayevə Sumqayıt yaxınlığındakı Nasosnı qəsəbəsində yerləşmiş hərbi hissələri Sumqayıta yeritməklə talanların qarşısını almaq xahişi ilə müraciət edirlər. General Krayev «beş-on xuliqanın öhdəsindən də gələ bilmirsiniz» deyib köməkdən imtina edir. Halbuki, o, məhz sabitlik yaratmaq üçün Sumqayıta göndərilmişdi.

Erməni müəllifi Armen Manukyan da göstərir ki, Müdafiə Nazirliyi, DİN-in bölmələri Sumqayıta ayın 28-i axşam gəlməyə başlamışlar, ancaq bir sutka sonra və fevralın 29-da axşam da ən azı on erməni öldürülmüş, onlarla mənzil qarət edilmişdi. Bölmələr Sumqayıta girərkən köməksiz insanlar yardım üçün ZTR-lərin qabağına atılırdılar, lakin hərbçilər cavab verirdilər ki, onlara müdaxilə etmək üçün əmr verilməyibdir. Belə halda sual ortaya çıxır: onda nə üçün qoşun yeridilmişdi? (155)

Con Hopkins Universitetinin Mərkəzi Asiya və Qafqaz Tədqiqatları İnstitutunun (ABŞ) Baş direktoru Svante Kornell də yazır ki, «Sumqayıtda Sovet qoşun hissələrinin və daxili qoşunların olması heç nəyi dəyişmədi. Elə gəlirdi ki, ordu ancaq kənardan sakitcə talanları müşahidə edirdi… Sovet hakimiyyət orqanları qan tökülməsinin nəinki qarşısını almaq istəmirdilər, hətta iki etnik icma arasında münaqişə yaratmağa can atırdılar» (192).

Əsgərlər və hərbi maşınlar şəhərdə görünsə də, heç nəyə müdaxilə etmədilər və hətta talanın baş verdiyi gün də hadisələri kənardan müşahidə etməyə üstünlük verdilər və düz fevralın 29-dək bu mövqedə qaldılar. Hətta hazırlıq vəziyyətində olan şəxsi heyəti də buraxmaq haqda əmr verdilər.

O zaman Azərbaycan SSR DTK-nın baş əməliyyat müvəkkili, hazırda istefada olan polkovnik-leytenant Qalasılkin Yuri Stepanoviç bu barədə belə deyir: «Həmin gün şəhərdə baş verə biləcək hadisələrin qarşısının alınması üçün xüsusi qruplar da yaradılmışdı. Saat 11 radələrində əmr aldıq ki: «Hər şey qaydasındadır, şəxsi heyəti buraxın» Amma bir neçə saatdan sonra hadisələr başlandı (14). Hərbçilərin münasibəti də təəccüb doğurmaya bilməzdi. Məsələ ondadır ki, hərbçilər şəhəri nəzarətə götürənə qədər 5–6 adam öldürülmüşdüsə, hərbçilərin şəhəri tam nəzarətə götürməsindən, yerli polis və inzibati qurumların fəaliyyəti dondurulduqdan sonra ölənlərin sayı 32-yə çatdı. O zaman Sumqayıt Şəhər İcraiyyə Komitəsi sədrinin müavini vəzifəsində işləyən Əli Həsənov deyir: «Hərbçilər başladılar şəhəri idarə etməyə. Şəhərin idarəsini tam götürdülər öz əllərinə. Qətllərin 50 faizindən çoxu onların orada olduğu dövrdə baş verdi. Əgər ayın 27-də orada 5–6 nəfər öldürülmüşdüsə, qalan 32 nəfərdən 20–23-ü ayın 28-i öldürüldü. Cəmisi 32 nəfər öldürülmüşdü. Onun da 6 nəfəri azərbaycanlı idi» (14–16).

Sov.İKP MK-nın partiya-təşkilat şöbəsinin müdirinin müavini olmuş Qriqori Xarçenko deyir: «O zaman SSRİ DTK-nın sədrinin 1-ci müavini Filip Bobkovla Sumqayıta gəldik. Biz şəhərə gələndə orada artıq 15 nəfər öldürülmüşdü» (234). Deməli, şəhər Moskvadan gələnlərin nəzarətinə keçdikdən sonra 17 nəfər öldürülmüşdü. Q.Xarçenko da Sumqayıtda 32 nəfərin öldürüldüyünü, onların 6 nəfərinin azərbaycanlı olduğunu təsdiq edir. «O zaman Ermənistanda belə fikirlər səslənməyə başladı ki, guya, Sumqayıtda az qala min nəfər öldürülüb. Amma mən sübut etməyə çalışırdım ki, Sumqayıtda 26–28 fevral hadisələri zamanı 32 nəfər həlak olub, onlardan 6-sı azərbaycanlılar idi. Axı məndə həlak olanların siyahısı da vardı» (234).

Mərkəz Sumqayıtda baş verən hadisələrə çox ləng reaksiya verdi. Sonralar güc strukturlarının rəhbərləri yuxarı komandanlığın əmrinin olmamasına istinad etməyə başladılar. Sanki bu versiyanı M.Qorbaçovun sözləri də təsdiq edir: «Əgər qoşunlar üç saat yubanmasaydılar, faciədən qaçmaq olardı». O vaxt Moskvadan Bakıya ezam edilmiş Q.Xarçenko göstərirdi ki, Qorbaçov üç saat yubandıq deyərkən tamamilə haqsızdır. Heç də belə deyildir. Biz bir sutka yubanmışdıq. Ona görə ki, bütün günü gözləyirdik oraya qoşun göndərilməsi haqqında nə vaxt qərar qəbul ediləcəkdir (207, 63). Yeri gəlmişkən, Q.Xarçenko və DTK-nın sədr müavini F.Bobkov 28 fevralda axşam Bakıdan Sumqayıta gedən ilk sovet rəsmi şəxsləri oldular. Bu zaman artıq şəhərdə vəziyyət nəzarətsiz hala gəlmiş, soyğunçuluq və qarət halları artmışdı. Asayişin bərpa edilməsi üçün onlar şəhərə dərhal qoşun yeridilməsini qərara aldılar. Lakin bunu etmək çox çətin oldu. Yalnız bir neçə saatdan sonra Sumqayıta daxili qoşunların polku və Bakı hərbi məktəbinin kursantları gətirildi. Moskvadan onlara döyüş patronları ilə deyil, boş patronlarla atəş açmaq əmri verilmişdi.

Siyasi büro hadisələrə yalnız fevralın 29-da münasibət bildirdi. Siyasi büronun həmin gün keçirilmiş iclasında Azərbaycan SSR və Ermənistan SSR-də baş verən hadisələrlə əlaqədar yaranmış vəziyyət müzakirə edilmişdi. Büronun artıq dərc olunmuş stenoqramının təhlili göstərir ki, SSRİ-in siyasi rəhbərliyi vəziyyətin hansı istiqamətdə inkişaf etməsindən xəbərsiz idi. Həmin iclasda müdafiə naziri D.Yazovun Sumqayıtda hərbi vəziyyət elan edilməsi, qoşun yeridilməsi yolu ilə asayişi bərpa etmək təklifinə M.Qorbaçov qarşı çıxaraq asayişi pozanlarla mübarizəyə fəhlə sinfini, könüllüləri cəlb etməyi təklif edir və deyir: «Bu bütün xuliqanların və ekstremistlərin qarşısını alacaqdır. Hərbçilər isə hiddətə səbəb olurlar (116). Bütün bunlar rəhbərliyin vəziyyəti nəzarət altına almaq üçün konkret hansı addımlar atmağın lazım gəldiyini bilməməsinin təzahürü idi. Sumqayıtda baş verənlər haqqında iclasda qeyri-dəqiq məlumatların səslənməsi də bunu təsdiq edirdi. Qorbaçovun: «Bu aksiya ermənilərə sərt cavab olaraq düşünülüb. Bir sözlə, biz lazım olan tədbiri görməsəydik, istənilən an qırğın ola bilərdi» sözləri onun hadisələrlə bağlı müfəssəl məlumata malik olmadığını təsdiq edir.

Fevralın 28-də axşam SSRİ Daxili İşlər Nazirliyi V.M.Vlasov M.Qorbaçova mitinqlərin dayandığını, hər şeyin bitdiyini xəbər versə də, talanların davam etdiyini bildirməmişdi. M.Qorbaçov «Qoy Daxili İşlər

Nazirliyi hərəkətə keçsin, əgər əlavə nəsə etmək lazımdırsa, qoy etsin, necə olursa-olsun vəziyyəti ələ almaq lazımdır. Ona görə ki, artıq bir gecəyə 14 ölüm hadisəsi var. Bu Ermənistana gedib çatacaq, dəfnlər başlayacaq. Oradan da reaksiya gələ bilər» (116).

Siyasi büroda Sumqayıtda komendant saatının tətbiq edilməsi və ya şəhərdə fövqəladə vəziyyət elan edilməsi ətrafında müzakirələr aparıldı.

Q.P.Razumovski sonuncunu təkid edirdi. S.Yazov tərəddüd edirdi – əgər komendant saatı tətbiq olunarsa, qoşunlar atəş açmaq hüququ alacaqdılar. Eyni zamanda o komendant saatının tətbiqinin zəruriliyini təkid edirdi. Qorbaçov isə hansısa kompromis tapmağa çalışırdı. Buna görə də silahı hazır saxlamaq, ancaq atəş açmamaq təklif etdi: «Yoxsa təsadüfi adamları vurmağa başlayacaqlar». Yazov patronsuz silah verilməsini, patronların isə zirehli maşınlarda ayrıca yerləşdirilməsini təklif etdi və Qorbaçov bununla razılaşdı. Lakin Qorbaçov qəti tədbirlər görməyə yenə cürət etmədi. «Biz məsələnin siyasi həllinə istinad edirik… Biz Əfqanıstanda heç bir şey həll edə bilmirik, burda vətəndaş müharibəsini başlamalıyıq?» (116)

İclasda müdafiə naziri S.Yazovun Sumqayıtda komendant saatının elan edilməsi, qoşun hissələrinin yeridilməsi təklifi Siyasi büro üzvləri tərəfindən dəstəkləndi.

Fevralın 29-da Sumqayıtda vəziyyəti tam nəzarətə almaq mümkün olmamışdı. Şəhərin 41-ci məhəlləsində talanlar və qarətlər davam edirdi. Yalnız şəhərə Xəzər donanmasının dəniz piyadaları və hava-desant polku gətiriləndən sonra vəziyyət sabitləşdi. Həmin gün saat $23^{00}$-da komendant saatı elan edildi və general Krayev bütün hakimiyyəti ələ aldı. Avtovağzalı kütlədən təmizləmək üçün desantlar hücuma keçərkən də bir neçə nəfər öldürüldü. Bazar ertəsinin sonuna yaxın rəsmi məlumatlara görə ölənlərin sayı 32 nəfər təşkil etmiş və 400-dən çox adam həbs edilmişdi (207, 67).

Beləliklə, yalnız fevralın 29-da gecə, qoşunlar şuluqluqları dayandırmaq əmri aldılar, özü də odlu silahdan istifadə etmədən.

Demək olar ki, hadisə ilə əlaqəli olan bütün şəxslər SSRİ rəhbərliyi tərəfindən qəsdən belə seyrçi mövqe göstərildiyini talanın baş tutmasına əlverişli şəraitin yaradılması kimi izah edirlər. Belə görünür ki, DTK-dan Kremlə real vəziyyəti əks etdirməyən məlumatlar verilirdi. Belə ki, fevralın 28-də Sumqayıtda talanların və qətllərin davam etdiyi faktdır.

Ancaq fevralın 28-də DTK-nın sədri Çebrikov Mixail Qorbaçova zəng edib Sumqayıtda vəziyyətin normal olduğunu demişdi. Bu barədə də Mixail Qorbaçov fevralın 29-da Siyası büronun iclasında məlumat vermiş və məsuliyyəti Çebrikovun üzərinə qoymuşdu. Ancaq bununla belə, Qorbaçov özü də qəti qərar qəbul edilməsində maraqlı deyildi. O, DTK-nı hadisələrin bu istiqamətdə inkişaf etməsində və ümumiyyətlə, ölkədə vəziyyətə nəzarət etməməkdə günahlandırırdı. DTK-nın sədri Çebrikov Brejnevin Dnepropetrovsk qruplaşmasının üzvü idi. Qorbaçov isə özünün yenidənqurma siyasətini həyata keçirərkən Brejnev qruplaşmasına müharibə elan etmişdi. Çebrikov vəziyyətdən istifadə edərək Qorbaçovun yenidənqurma siyasətinin uğursuzluğunu nümayiş etdirməyə çalışırdı. Həmin vaxt Siyasi büro, Qorbaçov onu məlumat verməməkdə ittiham etmişdi. Guya ki, DTK baş verənlər barədə susur, Siyasi büro isə baş verənlərdən xəbərsizdir. F.Bobkov bu barədə məlumat verərək göstərir ki, həmin vaxt Çebrikov mənə zəng edib soruşdu ki: «Axı bu necə baş verib?!» Mən də cavabında: «Nə baş verib ki?! DTK-nın Siyasi büroya göndərdiyi sənədlərə baxın, o sənədlər sizin şəxsi imzanızla göndərilib! Əgər Siyasi büroda bu sənədləri həmin vaxt oxumayıblarsa, qoy heç olmasa, indi oxusunlar!» – dedim. O bütün sənədləri götürüb Qorbaçova məruzə etdi. Qorbaçov Siyasi büronun növbəti iclasında artıq aşağıdakı sözləri deməyə məcbur oldu: «Bilirsiz, mən dünən səhvə yol vermişəm, DTK bizi bu barədə kifayət qədər məlumatlandırmışdı» (Bobkov F.) (F.Bobkovun «Sovet imperiyasının gizlinləri. Qriqoryanın işi» sənədli filminə müsahibəsindən) (14–16). Eyni fikri SSRİ DTK-nın 5-ci İdarəsinin şöbə rəisi Vladimir Lusenko da təsdiqləyir: «Təəssüf ki, bizdə heç nə alınmadı. Ona görə ki, DTK-nın baş verənlərlə bağlı bir mövqeyi vardı, ölkənin rəhbərliyinin isə tamamilə başqa. Bizə heç kim qulaq asmırdı. Bizim məlumatlarımıza fikir verilmirdi. Amma biz əvvəlcədən xəbərdarlıq etmişdik ki, orada proseslər yetişir, hər tərəfdən millətçilik özünə yol açır» (234).

SSRİ DTK-nın yüksək rütbəli əməkdaşları olan Vladimir Lusenko ilə Valeri Xmelyovun dediklərinə görə Siyasi büroda da, Ali Sovetdə də münaqişənin yetişdiyini bilirdilər. «Biz onlara bütün məlumatı verirdik, ancaq Sumqayıtda ilk açıq çıxışlara qədər heç bir tədbir görülmürdü. Axı buna qədər 1987-ci ilin oktyabrında Abovyandan Yerevana qədər təşviş doğuran yürüş olmuşdu. Atom stansiyasının tikintisi və «Naurit» kimya zavodunun istismarına qarşı minlərlə «yaşıl» hərəkat iştirakçısı çıxış

etmişdi. Hələ o zaman Qarabağı Azərbaycandan qoparmaq çağırışları eşidilmişdi. Stepanakertdə insanlar əllərində plakatlar, qırmızı bayraqlar və «Lenin, partiya, Qorbaçov», «Qarabağa azadlıq» şüarları ilə çıxarkən Siyasi büroda köhnə qayda ilə hərəkət etmək qərarına gəldilər: «Problem varsa, adam göndərmək lazımdır» (201, 125).

A.Mostovoy da iğtişaşlar haqqında ilk məlumatların dərhal MK-ya daxil olduğunu təsdiq edir. Bu məlumatlar həm DİN, həm də DTK kanalları ilə daxil olurdu. Hadisə haqqında Baş katib dərhal məlumatlandırılmışdı. Moskvaya verilən məlumatda Sumqayıt şəhərində ölüm halları, kütləvi talanlar, yerli hakimiyyət orqanlarının fəaliyyətinin iflic hala düşməsi kimi faktlar öz əksini tapmışdı. DTK dərhal adekvat tədbirlər görülməsini təklif edirdi. A.Mostovoyun sözlərinə görə, M.Qorbaçov Bakı ilə əlaqə saxlamış və göstərmişdi ki, «Azərbaycandakı yoldaşlar özləri işin öhdəsindən gələrlər. Onların kifayət qədər gücü və vasitəsi vardır» (163).

Hadisələr haqqında növbəti məlumat Kremlə fevralın 28-də çatdırılmış və bildirilmişdi ki, artıq 30-a yaxın ölüm hadisəsi var, yerli hakimiyyət vəziyyəti nəzarətə almaq gücündə deyil. Yalnız bundan sonra M.Qorbaçov nə isə etmək qərarına gəlmiş, DİN-ə «vəziyyəti lokallaşdırmağı və ləğv etməyi» tapşırmış, bunun üçün DTK-nın yerlərdəki qüvvələrindən və vasitələrindən istifadə etməyi tövsiyə etmişdi (201, 171–173; 163).

İğtişaşların dağıdılmasında iştirak etmiş şahidlərin sözlərinə görə (A.Mostovoy) nümayişçilər ucu sivri armaturla silahlanmış və necə hərəkət etməklə bağlı təlimat almışdılar. Əsgərlər hücum edərkən, onlar ucu biz əşyaları aşağıdan yuxarı, zirehli jiletin altına soxurdular. İki gün ərzində polkda 96 yaralanma hadisəsi olmuşdu (163).

Bu sitat bir sıra məqamlardan xəbər verir. Xuliqanlar və ya «azərbaycanlı» adı altında gizlənən professionallar Sumqayıtda necə açıq fəaliyyət göstərə bilirdilər? Sumqayıtlılar kütləni idarə edən hansısa qəribə, «gəlmə» kişilərdən danışırdılar (70). Ç.Sultanov da Sumqayıt fəhlələrinin kütləni hərəkətə gətirən qəribə, yerli adama oxşamayan gənc kişilər haqqında danışdıqlarını yazır (201, 180). «Сосиалистическайа индустрийа» qəzeti yazırdı ki, danışdığımız adamların bir çoxu insanları qəzəbləndirmək, çaşqınlıq, etimadsızlıq yaymaq məqsədilə törədilən bütöv fitnəkar hərəkətlər zəncirindən bəhs edirdilər. Məsələn, bir nəfər meydana toplaşanlara yaşadığı Qafan rayonunda erməni qatilləri tərəfindən öldürülmüş ailəsinin tarixini isterik şəkildə, çığırıb-bağırmaqla danışırmış. Səlahiyyətli orqanlar

onunla maraqlananda məlum olmuşdu ki, o, Qafan sakini deyil, əvvəllər məhkum olunmuş residivist, hazırda tüfeyli həyat keçirən evsiz-eşiksiz və hətta ailəsi olmayan bir şəxsdir (142).

Talançıların əllərində əldəqayırma qumbaralar da var idi. Deməli, onlar əvvəlcədən hazırlanmışdılar. Lakin bu insanlar kim idi? Bəlkə, Ermənistan qaçqınları? Lakin qeyd edildiyi kimi, Sumqayıta qaçqınlar yalnız fevralda, ən tezi yanvarın 25-də gələ bilərdilər. Və onlar belə qısa müddətdə talanlara hazırlaşa bilməzdilər. 22 fevralda Əsgəranda azərbaycanlıların öldürülməsi xəbəri əhaliyə yalnız ayın 27-də bəlli olmuşdu. Deməli, qumbara və digər silahlarla silahlanmaq üçün qaçqınlara və ya sumqayıtlılara bir neçə gün və ya saat kifayət edə bilməzdi. Deməli, cinayətkarlar və bütün cinayət əvvəlcədən hazırlanmışdı. Azərbaycanlılar istəsəydilər belə, bu qısa zamanda həmin silahları hazırlaya bilməzdilər. Bu aksiyanın çox əvvəldən planlaşdırıldığını və hazırlandığını göstərir və aksiya zaman etibarilə (bir il-il yarım) ermənilərin Qarabağ hərəkatına başlamaları ilə üst-üstə düşür (79).

İcraçılar isə narkotiklər və alkoqolun təsiri altına düşmüş ekstremistlərin adı ilə hərəkət edən əsl professionallar idilər. Bu hadisələrdən sonra iğtişaşlarda xuliqan ünsürlərin bıçaq və digər əşyalardan istifadə etdikləri haqqında məlumatlar yayılmışdı. Bir çoxlarının əlində dəmir çubuqlar var idi. Nadejda Bançik adlı amerikalı hüquq mühafizəçisi sual verir: «Onlar bu qədər dəmir çubuğu hardan götürmüşdülər? Necə təşkil olunmuşdular? Bu talançılar Moskvanın, yəni Lubyankanın sanksiyası olmadan həmin dövrdə milçəyin belə uça bilmədiyi sovet məkanında, sovet şəhərində haradan peyda olmuşdular» (86).

A.Mostovoy bir zabitin fikirlərini çatdırırdı: «Müdafiə Nazirliyinin gizli mərkəzinin, iri poladtökmə zavodunun, böyük kimya kombinatının, sərhəd hissəsinin olduğu şəhərdə qarşısını almaq və ya dayandırmaq üçün azacıq cəhd göstərilmədən belə hadisə necə baş verə bilərdi?» (163).

Rusiya təhlilçisi Aleksey Zverev də bu məqama diqqət yetirir. Geniş xəbərçilər şəbəkəsinə malik DTK 1988-ci ildə hələ də öz imkanlarını saxlamışdı və fəaliyyət göstərirdi. Bu o deməkdir ki, Moskvada, DTK-da talanlara hazırlıq kursundan xəbərdar idilər (117). Elə həmin boru-prokat zavodu rejim obyekti kimi ittifaq tabeliyində idi. Deməli, bütün istehsal prosesi müvafiq strukturların kurasiyasında idi və onlardan xəbərsiz burada bircə detal belə hazırlamaq mümkün deyildi (79).

Yalnız 106-cı hərbi-desant diviziyasının 137-ci paraşüt desant polkunun (komandir podpolkovnik V.Xarkeviç) şəhərə gətirilməsi ilə 29 fevralda iğtişaşları lokallaşdırmaq mümkün olmuşdu.

Burada başqa məqam da üzə çıxır. Hərbçilərə professional hücumlar münaqişəni idarə edənlərə iğtişaşların təkcə etnik əsasda olmayıb, həm də orduya qarşı yönəldiyini nümayiş etdirmək üçün lazım idi. Yalnız dövlət maşınının köməyi ilə hadisəni belə dəqiq hesablanmış, ölçü-biçili şəkildə həyata keçirmək mümkün olardı:

- Dağlıq Qarabağda və Ermənistanda əvvəlcə xalq azad şəkildə öz iradəsini ifadə edir;
- sonra Əsgəranda azərbaycanlılar öldürülür;
- Ermənistandan azərbaycanlılar qovulur;
- Sumqayıtda mərkəzi hakimiyyətin laqeyd müşahidəsi ilə zorakılıqlar baş verir;
- və nəhayət, vəziyyət bir-iki saat ərzində nəzarət altına alınaraq lokallaşdırılır. Bu bir daha qanlı hadisələrin dəqiq düşünülərək həyata keçirilmiş ssenari üzrə baş verdiyini təsdiq edir (79).

Talan hadisəsi baş tutduqdan yalnız üç gün sonra mərkəzi hakimiyyət orqanları işə qarışaraq cinayətkarları həbs etməyə başladılar. Moskvadan SSRİ Prokurorluğu yanında xüsusi işlər üzrə müstəntiq Kaliniçenko istintaq prosesinə rəhbərlik etmək üçün Azərbaycana, Sumqayıta gəldi. İlkin istintaq başladı və yüzlərlə şahid və ittiham olunan dindirildi. Tədricən, ilk baxışdan xaotik görünən hadisələrin mərkəzində mütəşəkkil bir qrupun izləri, onların məqsədyönlü hərəkətlərinin konturları cızılmağa başladı. 14–15 nəfərdən ibarət, özünün lideri və daxili iyerarxiyası olan bu qrup əvvəlcədən hazırlaşmaqla, demək olar ki, şəhərin bütün mikrorayonlarında talan prosesinə start verərək kortəbii iğtişaşı stimullaşdırmışdı. Tədricən istintaqçıların gözü qarşısında başlanğıcda təşkil olunmuş, daha sonra isə təsadüfi adamların qoşulması ilə kortəbii mərhələyə daxil olmuş bir təxribat mənzərəsi canlandı.

Hadisələrdən yalnız bir həftə sonra SSRİ rəhbərliyinin mövqeyini əks etdirən rəsmi məlumat verildi. Sovet İttifaqı Teleqraf Agentliyinin (TASS) 1 mart 1988-ci il tarixli məlumatında deyilirdi: «Xəbər verildiyi kimi, fevralın 28-də Sumqayıtda bir dəstə xuliqan şuluqluq salmışdır. Dağlıq Qarabağda və Ermənistanda hadisələr ətrafında fitnəkar şayiələrin təsiri altına düşmüş səbatsız, yetkin olmayan adamlar qeyri-hüquqi hərəkətlərə cəlb olunmuşlar. Cinayətkar ünsürlər zorakılıq hərəkətləri

və talanlar törətmişlər. Onlar 31 adam öldürmüşlər. Həlak olanlar arasında müxtəlif millətlərdən olan adamlar, qocalar və qadınlar vardır. Vəziyyəti normal hala salmaq üçün qəti tədbirlər görülmüşdür. Cinayətlərdə müqəssir olanlar həbsə alınmışlar və sovet qanunlarına ciddi surətdə uyğun olaraq cinayət məsuliyyətinə cəlb edilirlər. Azərbaycan SSR Nazirlər Sovetinin sədri H.N.Seyidov başda olmaqla hökumət komissiyası yaradılmışdır. Şəhər xidmət bölmələrinin fasiləsiz işinin təmin edilməsi, ictimai asayişin qorunması ilə əlaqədar bütün məsələlər həll edilir. Zərərçəkənlərə lazımi yardım göstərilir. Vətəndaşların xahişlərinə və müraciətlərinə baxılır, bunlarla əlaqədar operativ tədbirlər görülür. Şəhər zəhmətkeşləri təmkin göstərir, beynəlmiləlçilik hislərini nümayiş etdirirlər. Əmək ahəngi pozulmamışdır. Sənaye, nəqliyyat, ticarət, ictimai iaşə, məişət xidməti müəssisələri və başqa müəssisələr lazımi rejimdə işləyirlər, məktəblərdə məşğələlər davam edir» (32, 5 mart 1988-ci il).

Mühüm məsələlərdən biri də istintaq işinin aparılması ilə bağlıdır. Məsələ ondadır ki, artıq qeyd edildiyi kimi, 1988-ci il fevralın 27-də şəhər prokuroru İsmət Qayıbov baş vermiş cinayət faktları ilə əlaqədar cinayət işi başlasa da, artıq 3 gün sonra Moskvadan göndərilmiş SSRİ Baş Prokurorluğunun istintaq qrupu cinayət işini öz icraatına götürmüş, Sumqayıtın və ümumiyyətlə, Azərbaycanın hüquq-mühafizə orqanlarının əməkdaşlarını isə istintaq-əməliyyat tədbirlərindən kənarlaşdırmışdılar.

Azərbaycan SSR DTK-nın sabiq sədri Ziya Yusifzadə Azərbaycan Televiziyasına müsahibəsində deyirdi: «Ayın 28-də, ya 29-da SSRİ Daxili İşlər Nazirliyinin Daxili qoşunlarının hissələri Sumqayıta daxil olur. SSRİ DTK-nın, DİN-in, Baş Prokurorluğun, Sovet Orqanlarının nümayəndələri olan onlarla məsul, səlahiyyətli şəxs Sumqayıta gəlir. Onlar gəldikdən sonra İsmət Qayıbov işdən təcrid olunur. Bundan sonra işi yalnız özləri aparırdılar. Azərbaycanlıların rəhbər heyətinə də heç bir məruzə edilmirdi. Tutulan erməniləri «hə, siz əzilmisiz, döyülmüsüz, söyülmüsüz, siz təsadüfi tutulmusuz» adıyla azad buraxırdılar» (14–16).

Göründüyü kimi, hətta Azərbaycan SSR DTK-nın sədri də proseslərdən kənarda saxlanmış və qəsdən Dağlıq Qarabağa göndərilərək orada olması tapşırılmışdı. Belə bir şəraitdə talanda təşkilatçı və icraçı kimi iştirak etmiş bəzi ermənilər səhvən yaxalanmışlar kimi azadlığa buraxılmışdı. Mərkəzi Komitənin milli məsələlər üzrə katibi olmuş, Mixail Qorbaçovun ən yaxın adamı və yenidənqurma siyasətinin ideoloqu Aleksandr Yakovlev istintaqın aparılması ilə bağlı «istintaqın üzdən aparılma-



**ZİYA YUSİFZADƏ**

**1980–1988-ci illərdə Azərbaycan DTK-nın sədri**

sında kim maraqlı idi və istintaqın dərinləşdirilməməsində kim maraqlı idi?» sualına belə cavab verirdi: «DTK! DTK! Mən həmin vaxt Mixail Sergeyeviçə daim deyirdim ki, gəlin, bu məsələni sonadək araşdıraq! Axı niyə həmin vaxt şəhərdə filan-filan adamlar yox idi?! Niyə istintaq işində fasilələr olurdu? Mən başa düşmüşdüm ki, özləri bu işi təşkil etmişdilər, özləri də bunun üstünün açılacağından ehtiyat edirdilər!» (14–16)

Münaqişənin ilk mərhələsində ondan bir-birinə qarşı istifadə etmiş Sov. İKP MK və DTK, sonradan hadisələrin nəzarətdən çıxdığını anlamağa və bəyanatlarının tonunu dəyişməyə başladılar. Məsələn, 1993-cü il mayın 18-də «Голос Армении» yazırdı: «Məhz Aleksandr Yakovlev və onun ətrafındakılar Qarabağ prosesinin stimullaşdırılmasında əsas rol oynadılar və onlar da artıq Sumqayıt, Kirovabad və Bakı hadisələrindən sonra öz mövqelərini kəskin şəkildə dəyişdilər və ermənilərin qanuni tələblərinin əksinə çıxış etdilər. İndi Marqaret Tetçer kimi, onlar da Azərbaycanın ərazi bütövlüyünün xeyrinə çıxış edirlər» (166). Bu, «Голос Армении»də Yakovlev və ətrafı haqda yazılanlardır.

Ermənistanın «Respublika» partiyasının sədr müavini Razmik Zöhrabyan isə 2011-ci ilin iyununda bəyan etdi ki, «Qarabağ» komitəsi formalaşdırılarkən DTK-dan ona xəbərdarlıq etdilər: «Hətta tribunaya da yaxınlaşmayın, orada sizə yer yoxdur, bu bizim hərəkatdır». Razmik Zöhrabyan bildirirdi ki, bu səbəbdən də onlar, yəni sovet dissidentləri «Qara-

bağ» və «Krunk» təşkilatlarından uzaq durmağa çalışırdılar. «Armeniya tudey» və «Armenian report» saytları 2011-ci il iyunun 14-də yazırdı: «Amma problem yalnız bunda deyil. Diqqət yetirin: milli oyanış günlərində DTK və «Milli birlik» partiyasının üzvləri faktiki olaraq təmasda idilər və dialoq aparırdılar. Bundan əlavə, «Milli birlik» partiyası praktik olaraq DTK-nın əmrlərini yerinə yetirirdi və Razmik Zöhrabyanın dediyi kimi, «əlbəttə, biz öz siyasi fəaliyyətimizi «Qarabağ» komitəsindən və Erməni milli hərəkatından» ayrı davam etdirirdik» (224; 225).

«Krunk» təşkilatının Abxaziyadakı şöbəsinin də sovet DTK-nın göstərişlərini yerinə yetirdiyi şübhə doğurmur. Məsələn, gürcü-abxaz qarşıdurmasında «Krunk» birmənalı olaraq Moskvayönlü qüvvələri, separatçıları müstəqilliyə doğru xətt götürmüş, Gürcüstandan ayrılmaq niyyətini elan etmiş abxazları dəstəkləyirdi. DTK Azərbaycanda olduğu kimi, Gürcüstanda da Cənubi Osetiya və Abxaziya separatizmini stimullaşdırmaqla və separatizmi dəstəkləməklə Gürcüstanı SSRİ-dən ayrılmaq niyyətlərindən çəkindirməyə çalışır və müstəqillik tərəfdarlarını gözdən salmağa cəhd edirdi. «Krunk» təşkilatı Azərbaycanda Qarabağ separatizmini, Gürcüstanda isə Abxaziya separatizmini dəstəkləyirdi. Hadisələrin şahidi olmuş Lavrenti Amşentsi yazır: «Artıq gürcülər ermənilərə etibar etmirdilər. Çünki Suxumi «Krunk»u Abxaziyanın Ali Sovetində erməni diasporunun maraqlarını getdikcə daha kəskin müdafiə etməyə başlayır və abxaz fraksiyası tərəfə daha çox yaxınlaşırdı». Ermənilər və ruslar abxazların separatçı şüarlarını birgə dəstəkləyirdilər (72).

«Krunk»un Gürcüstanda da separatizmi dəstəkləməsi haqda sözügedən məqalədə daha sonra yazılır: «Abxazları fəal şəkildə müdafiə edən «Krunk» «Maştos» təşkilatını da öz tərəfinə çəkməyə çalışdı. Qaqradakı ümumi yığıncaqda «Krunk»la «Maştos» təşkilatı arasında toqquşma oldu. «Krunk» təşkilatının birləşərək vahid siyasi xətt aparmaq haqda tələblərinə cavab olaraq «Maştos» nümayəndələri bəyan etdilər ki, gürcülərə qarşı münaqişədə iştirak etməyəcəklər və əgər münaqişədə kiminsə tərəfini saxlamağa məcbur olsalar, onda ermənilərdən savayı heç kimin maraqlarını ifadə etməyəcəklər» (72).

O zaman Azərbaycan SSR DTK-nın əməliyyat müvəkkili olmuş Y.S.Qalasılkin də əldə etdikləri sübutları SSRİ DTK-ya təqdim etdiklərini, amma həmin sübutlara heç bir reaksiya verilmədiyini deyir: «SSRİ DTK-nın birinci müavini F.Bobkov gəldikdə, iclas zalında şəxsi heyətin

görüşü oldu. Burada baş verən hadisələrə qiymət verildi – SSRİ DTK-nın verdiyi qiymət! F.Bobkova müraciət edərək dedim: «Mən Azərbaycan DTK-nın əməkdaşı olaraq, hesab edirəm ki, baş verən hadisələr öncədən təşkil olunub. «Bunu sübut edən materiallarınız varmı?» sualına «əlbəttə, var» cavabını verdim. İclasdan dərhal sonra məni onun qəbuluna çağırdılar. Mən də bütün sənədləri götürərək ona təqdim etdim. Toplanmış materialların sonrakı aqibəti barədə heç bir məlumatım yoxdur» (14–16).

O zaman Sumqayıt şəhər icraiyyə komitəsinin sədr müavini olmuş Əli Həsənov da əldə edilmiş sübutların aparılması və ört-basdır edilməsi haqda bildirib: «Sonra bütün sənədlər, əşyayi-dəlil, sübut, hamısı Moskvaya aparıldı. Hamısı! Əməliyyat kassasından olan o arxiv sənədləri də, sxemləri də, ştativləri də götürdülər, hamısını yox elədilər!» (14–16)

Yeri gəlmişkən, Sumqayıt hadisələri üzrə istintaqa rəhbərlik etmiş və sonra ittiham aktını imzalamış şəxs – Vladimir Qalkin SSRİ Baş Prokurorluğu yanında xüsusi işlər üzrə müstəntiq idi. İşin istintaqı da SSRİ Baş Prokurorluğu tərəfindən aparılırdı. İstintaq qrupunun da bütün üzvləri qeyri-azərbaycanlılar idi. Bu məqam istintaqa, guya, Azərbaycan tərəfinin təzyiqləri haqqında ermənilərin indiyə qədər davam edən iddialarını alt-üst edir. V.Qalkin sonra DTK sistemində öz karyerasında sürətli sıçrayış edərək əks-kəşfiyyat generalı olmuşdu. Bu amil də prosesin DTK-nın nəzarəti altında getdiyini sübut edir.

Eduard Qriqoryanın qrupunun mühakiməsi də tam başa çatdırılmadı. Moskvada keçirilmiş tələsik məhkəmə təşkilatçıların kim olduğunu müəyyənləşdirməkdə maraqlı olmadı və Ə.Əhmədovu təşkilatçı qismində güllələməyə məhkum etdi. Qriqoryanın isə təşkilatçı kimi cinayəti sübuta yetirilmədiyi üçün ona 12 il iş kəsildi. Sonralar Azərbaycanda Sumqayıtda baş verənlərlə bağlı 1989-cu il dekabrın 22-də yenidən keçirilmiş məhkəmə iclasının qərarı vəziyyətə aydınlıq gətirmək üçün tutarlı sənəddir. Qərarda deyilir: «İstintaq zamanı Azərb.SSR CPM-in 19-cu maddəsi pozulmuş, işin halları tam, obyektiv və hərtərəfli istintaq edilməmişdir.

Bununla yanaşı, istintaq orqanı bu barədə istintaqı birtərəfli və yarımçıq apararaq hadisələrin təşkilatçılarını müəyyən etməyə səy göstərməmişdir. Baxmayaraq ki, bu barədə istintaq zamanı müttəhimlər N.S.Səfərov, Q.Q.Məmmədov, E.Ə.Gəncəliyev və qeyrilərinin ifadələrində və sərbəst yazdıqları ərizələrində müttəhim Eduard Qriqoryanın hadisədən əvvəl onlara dərman paylanmasını, sonra ermənilərin yaşadıqları ünvanlar yazılmış

kağız çıxarmasını və həmin kağızda yazılmış ünvanlara aparıb mənzilləri dağıtmasını göstərmişlər. Bunu müttəhim N.Səfərov məhkəmədə də bir daha təsdiq etdi. Lakin istintaq zamanı nədənsə buna əhəmiyyət verilməmişdir. Ona görə də əlavə istintaq zamanı lazım gəlir ki, bu hal geniş və obyektiv istintaq edilib dəqiq nəticəyə gəlinsin» (230).

Məhkəmənin hakimi olmuş Mənsur İbayev göstərir: «Qriqoryana istiqamət verən, onu hazırlayıb göndərən ermənilər var idi. Çünki əvvəlcədən Sumqayıtdakı ermənilərin ünvanını müəyyən etmək, adamlara dərman vermək, əlbəttə, adi məsələ deyildi! Bu, tək Qriqoryanın işi deyildi! Ona görə də məhkəmə buna biganə qala bilməzdi. Məhkəmə birinci növbədə işin təşkilatçılarını müəyyənləşdirməyə çalışmalı idi. Ona görə də işin bu hissəsi məhkəmədə əlavə ibtidai istintaqa qaytarıldı ki, istintaq yoluyla bu işi təşkil edən ermənilər müəyyənləşdirilsin! Qriqoryanın özünə də 12 il ciddi rejimli cəzaçəkmə müəssisəsində icra təyin edildi» (14–16).

Məhkəmə cinayət işinin əlavə ibtidai istintaqa qaytarılması haqda qərar qəbul edir. Göründüyü kimi, hələ sovet dövründə Sovet Azərbaycanı məhkəməsi təşkilatçıların axtarılması və işin daha dərindən araşdırılmasında və bütün halların təhqiq edilməsində maraqlı olduğunu ortaya qoyub. Bu məqam onu göstərir ki, Azərbaycan məhkəməsi, hüquq-mühafizə orqanları və təbii ki, dövlət orqanları bu hadisənin tələm-tələsik ört-basdır edilməsində deyil, onun araşdırılmasında və təşkilatçıların tapılmasında maraqlı olublar və bu gün də maraqlıdırlar.

Bütün sadalanan sənədlər və faktlara əsasən görünür ki, təşkilatçıların gizlədilməsində və ört-basdır edilməsində, cinayətin tam araşdırılmamasında Sov.İKP MK-nın Siyasi bürosu, şəxsən Mixail Qorbaçov, DTK, Ermənistan və Dağlıq Qarabağın elitası maraqlı idilər. Siyasi büro və Qorbaçov fevralın 29-da keçirilmiş iclasda birbaşa və birmənalı olaraq bu talanların xuliqanlıq edən elementlərin işi olduğunu deməklə təşkilatçıları axtarmağa ehtiyac olmadığı haqda siyasi göstəriş vermiş oldu. Fevralın 29-dakı iclasda Siyasi büro üzvləri təcili açıq məhkəmə keçirib günahkarları cəzalandırdıqlarını nümayiş etdirmək qərarı qəbul etdilər.

Bundan sonra hərbi prokuror Katusev Sumqayıt işini araşdıran istintaqçılara: «Eşitmədiniz, Qorbaçov dedi ki, bu, xuliqan elementlərin işidir. Odur ki, işi bitirin və məhkəməyə göndərin» deyir. Bunu Niyazi Vəlixanov da təsdiq edir: «1988-ci ilin, səhv etmirəmsə, dekabr ayında Sumqayıta SSRİ Baş prokurorunun müavini Aleksandr Katusev gəlmişdi. O,



**ALEKSANDR YAKOVLEV**

**1986–1990-cı illərdə Sov.İKP MK-nın milli məsələ üzrə katibi, «Yenidənqurma» siyasətinin əsas ideoloqu, Mixail Qorbaçovun ən yaxın məsləkdaşı**

işlərin vəziyyəti ilə maraqlanırdı və keçirilmiş iclasda belə bir göstəriş verdi ki, həmin hadisələrlə əlaqədar tutulmuş şəxslərin barəsində istintaq tamamlanmalı, qısa müddətdə işləri məhkəməyə göndərilməlidir. Bu da o demək idi ki, digər məsələlər, yəni aydınlaşdırılmalı olan və aydınlaşdırılmayan məsələlər kənarda qalırdı, çünki bütün qüvvə həbsdə olanların barəsində işlərin məhkəməyə getməsinə yönəlirdi» (14–16).

Ermənistan və Dağlıq Qarabağa gəldikdə isə göründüyü kimi, Azərbaycan və SSRİ Prokurorluğu və DTK əməkdaşlarının Ermənistana istintaq üçün dəfələrlə göndərdikləri sorğuların cavabsız qaldığı sənədlərlə sübut olunur.

Qorbaçovun yaxın adamı, 1986–1990-cı illərdə Sov. İKP MK-nın katibi vəzifəsində işləmiş SSRİ-də ən məlumatlı adamlardan biri, ermənilərə xüsusi simpatiyası ilə seçilən, yenidənqurma siyasətinin ideoloqu olmuş Aleksandr Yakovlev Sumqayıt hadisələrindən 4 il keçdikdən sonra bu haqda sensasiyalı bəyanat verdi. «Московские новости» qəzetinə 1992-ci ildə verdiyi müsahibədə A.Yakovlev deyir: «Dnestryanı və Sumqayıt hadisələrini SSRİ DTK-sı təşkil etmişdi» (201, 160). Azərbaycan televiziyasına müsahibəsində isə Yakovlev Sumqayıt hadisələrinin SSRİ HSK və DTK-sı tərəfindən təşkil olunduğunu təkrar edir (14).

«Sumqayıt və Bakıda olan hadisələrə gəldikdə, düşünürəm ki, bu, sırf provokasiya idi – hərbi sənaye kompleksinin provokasiyası! Sumqayıt ha-

disələrində bu, ilk növbədə, Dövlət Təhlükəsizlik Komitəsinin provokasiyası idi. Bu, Qorbaçov hakimiyyəti üçün qurulmuş bir sınaq idi» (14–16). «Xruşşovun zamanında xüsusi xidmətlərin nüfuzu bir qədər azalmışdı. Ancaq Xruşşovun idarəçiliyinin ikinci yarısında rejim güc strukturlarının möhkəmlənməsi yolunu tutdu. Bütün etirazlar zor vasitəsilə yatırılırdı və bu zaman güc strukturları özləri üçün yeni imkanlar qazanırdılar. Bəzi hallarda onlar özləri münaqişəli situasiyalar, qarşıdurmalar yaradırdılar ki, özlərinin vacibliyini sübut etsinlər. Xruşşovun zamanında Novoçerkasskda belə olmuşdu. Yenidənqurma dövründə də Sumqayıtda, Vilnüsdə, Riqada belə oldu» (14–16).

DTK-da isə əksinə, Yakovlevi millətlərarası münasibətləri qızışdırmaqda, münaqişə ocaqları yaratmaqda ittiham edirdilər. Məsələn, SSRİ DTK sədrinin 1-ci müavini Filip Bobkov Aleksandr Yakovlevin rolu haqqında deyir: «O, əsas rolda olan şəxs idi. Əvvəla, ideoloq, ikincisi isə bu həmin o kəs idi ki, hər yerdə milli hisləri alovlandırırdı. Latviya və Litvada münaqişəni kim qızışdırdı? Yakovlev! Yakovlev litvalıları ruslarla toqquşdurdu. Gürcüstanda da eynilə...» (14–16)

Çernenko jurnalist Valeri Bersenevə müsahibəsində mərkəzin roluna aydınlıq gətirir: «Pravda» qəzetinin müxbiri kimi mən SSRİ-nin bütün qaynar nöqtələrində: Alma-Atada, Sumqayıtda, Tbilisidə, Bakıda olmuşdum. Mənə aydındır ki, o vaxtın siyasi rəhbərliyi açıq ictimai proseslərə ultramillətçilərin cəlb edilməsinə şərait yaradırdı» (201, 168).

Ümumiyyətlə, keçmiş SSRİ-nin rəhbərliyinə daxil olmuş əksəriyyət SSRİ-dəki millətlərarası münaqişələrin alovlanmasında, o cümlədən Qarabağ münaqişəsində məhz A.Yakovlevi günahlandırırdılar. SSRİ DTK-nın keçmiş sədri V.Kryuçkov A.Yakovlev haqda belə deyirdi: «Qafqazda o, Ermənistana simpatiya ilə yanaşır, mahiyyətcə erməniləri Azərbaycana qarşı çıxışlara şirnikləndirirdi, Qarabağ ətrafında vəziyyəti gərginləşdirirdi. Ümumiyyətlə, Azərbaycan haqda həmişə ikrahla danışırdı» (201, 169). V.Kryuçkov iddia edirdi ki, A.Yakovlevin bu hərəkətləri onun Mərkəzi Kəşfiyyat İdarəsi (MKİ) tərəfindən ələ alınması ilə bağlı idi və o, MKİ-yə işlədiyi üçün SSRİ-ni dağıtmaq planlarının tərkib hissəsi kimi millətlərarası münaqişələri qızışdırırdı. V.Kryuçkovun fikrincə, o, 1960-cı ildə ABŞ-ın Kolumbiya Universitetində təcrübə keçərkən ABŞ-ın xüsusi xidmətləri tərəfindən ələ alınmışdı.

Bütün bunların – A.Yakovlevin DTK-nı, DTK-nın isə A.Yakovlevi Qarabağ münaqişəsini qızışdırmaqda, Sumqayıtda talanlar təşkil et-

məkdə ittiham etməsinin bir mənası var: bütün bunlara görə Azərbaycan və azərbaycanlılar günahkar deyil. Bütün bu hadisələr Azərbaycanda, Azərbaycanın əleyhinə oynanılmış təxribat ssenariləridir. Bütün sadalanmış faktlar belə deməyə əsas verir ki, Qarabağ ətrafında başlanmış radikal millətçi hərəkat, Sumqayıt talanları və s. Moskvadan qaynaqlanırdı və Azərbaycanın maraqlarının əleyhinə, Ermənistanın isə maraqlarına uyğun ssenarilərlə tətbiq edilirdi.

1983–1988-ci illərdə Rusiya Federasiyası hökumətinə rəhbərlik etmiş, 1988–90-cı illərdə Rusiya Federasiyası Ali Soveti Rəyasət Heyətinin sədri olmuş, keçmiş Siyasi büro üzvü Vitali İvanoviç Vorotnikov da Aleksandr Yakovlev haqqında deyilənləri təsdiqləyir: «Yakovlev qurucu deyildi, dağıdıcı idi. O, harada olurdusa, orada nəticədə mütləq münaqişə başlayırdı. Pribaltikada o, SSRİ-yə qarşı yönəlmiş siyasət aparırdı. Eyni şeyi Sov.İKP Siyasi bürosunun onu Dağlıq Qarabağ ətrafında yaranmış vəziyyətin nizamlanması üçün Ermənistana göndərdiyi zaman da etdi. Oradan qayıdan Yakovlev hamını sakitləşdirirdi ki, guya, orada heç bir qorxulu hadisə baş vermir. Nə olsun ki, azərbaycanlılar və ermənilər bir-iki dəfə bir-birinə güllə atıblar. Narahatlıq üçün heç bir əsas yoxdur və s. və i. Axı o zaman təcili qərarlar qəbul etmək lazım idi. O, Qərbin, ilk növbədə, ABŞ-ın ruporu idi, Qorbaçova təsir imkanları çox böyük idi. Onun siyasəti nəticəsində Sov. İKP Siyasi bürosunda parçalanma baş verdi və həmin qrupun üzvləri: Vadim Medvedyev, Eduard Şevardnadze, Aleksandr Yakovlev Mixail Qorbaçovun xüsusi yaxınları oldular» (234).

Məsələ ondadır ki, Aleksandr Yakovlev, doğrudan da, Ermənistanda olarkən Moskvanın onların hərəkətlərinə anlaşıqlı yanaşdığını bildirmişdi. Məsələn, o zaman SSRİ DTK-nın 5-ci idarəsinin millətçiliklə mübarizə şöbəsinin rəisi olmuş Vladimir Lusenko deyir: «Sumqayıt hadisələrindən sonra Moskvada Sov.İKP Siyasi bürosunun qapalı yığıncağı keçirildi. Bundan sonra Yeqor Liqaçovu Bakıya, Aleksandr Yakovlevi isə Yerevana göndərdilər. Aleksandr Yakovlev Yerevanda bəyan etdi ki, Dağlıq Qarabağ Ermənistanın tarixi ərazisidir, guya, az qala sabah Moskvada Qarabağın sizə verilməsi haqda sənəd imzalanacaq. Eyni zamanda Y.Liqaçov Bakıda inandırmağa çalışırdı ki, sərhədlər pozulmazdır, heç kim Qarabağı Ermənistana verməyə hazırlaşmır» (234).

Siyasi bürodakı 29 fevral 1988-ci il tarixli müzakirələrin stenoqramı göstərir ki, Qorbaçov özü də vəziyyətin gərginləşdirilməsində və dərinləşdirilməsində maraqlı tərəf idi. Ona vəziyyəti nəzarətə götürməyi və qan

tökülməsinin qarşısını almağı təklif etdikdə o, fəhlə sinfinə arxalanmağı, drujinaçılardan istifadə etmək kimi qeyri-real amillərdən danışır. Halbuki Siyasi büroda çıxışı göstərirdi ki, o, hər şeydən xəbərdar idi. Amma Qorbaçov qərar qəbul olunmasını gecikdirməklə praktik olaraq qan tökülməsinə, talanların baş tutmasına şərait yaradırdı. Siyasi büroda isə məhz Çebrikovun ona hadisələrlə, proseslərlə bağlı səhv məlumat verdiyinə işarə edir, günahı Çebrikovun üzərinə qoyurdu. Yeri gəlmişkən, Sumqayıt talanlarından cəmi bir neçə ay sonra, 1988-ci ilin sonunda, Çebrikov DTK-nın sədrliyindən azad edildi. Qorbaçov Brejnevin qruplaşmasının daha bir üzvündən azad olmaq imkanı qazandı.

DTK isə Sov. İKP-nin bütün xəbərdarlıqlara biganə yanaşdığını iddia edirdi. Məsələn, DTK sədrinin 1-ci müavini və siyasi əks-kəşfiyyatın rəisi olmuş Filip Bobkov «Xainləri necə hazırlayırdılar» adlı kitabında yazır:

«Ermənistanla Azərbaycan arasında Dağlıq Qarabağda müharibənin başlanmasına iki il qalmış mən şəxsən Sov.İKP-nin katibi Yeqor Liqaçovu qanlı münaqişə təhlükəsi haqda xəbərdar etmişdim. Qorbaçov da vəziyyətdən heç bir nəticə çıxarmadı və özünün ikimənalı çıxışlarını davam etdirdi. Düşünmədən bir tərəfi alqışladı, o birilərini rədd etdi. Situasiya alovlanırdı, Kreml isə təkrarlamaqda davam edirdi: «Qorxulu heç nə yoxdur, dramatikləşdirməyin». 1988-ci ildə Sumqayıtda talanlar və Dağlıq Qarabağdakı ilk toqquşmalar zamanı Y.K.Liqaçov mənə etiraf etdi və bizim söhbətimizi xatırladı. Təəssüf ki, artıq gec idi» (88, 209–210).

Ziya Yusifzadə xatırlayırdı: «Çebrikov mənə dedi ki, Ziya Mamedoviç, siz çoxlu teleqramlar göndərirsiz, çox da zəng eləyirsiz. Siz mütəmadi olaraq təhlükəsizlik orqanlarını bombalayırsınız! Mən bilirəm vəziyyəti! Hər gün də məruzə eləyirsiz, vəziyyəti bilirəm, teleqramlarınızı oxuyuruq, teleqramlarınızı Mərkəzi Komitəyə məruzə eləyirik! Teleqramlar Siyasi büronun üzvlərinə gedir. Mərkəzi Komitədən bizə deyirlər ki, narahat olacaq bir şey yoxdur! Bu, demokratiyanın və demokratikləşmə prosesinin təzahürüdür! Onun fəsadlarıdır! Narahat olmağa əsas yoxdur! Ancaq nəzarətdə saxlamalısınız ki, qarşıdurma olmasın, iğtişaşlar olmasın, bu məsələlər öz həllini tapacaq» (14).

Mərkəzi Komitənin bu teleqram və hesabatlara heç bir reaksiya verməməsi isə ən müxtəlif mənbələrdən təsdiqlənirdi. Məsələn, A.Krukilin «Литературная газета»da Düşənbə hadisələrinə həsr olunmuş məqaləsində yazırdı: «MK ... hazırlanan iğtişaşlar haqda 20 dəfə xəbərdar edilmişdi! ... İğtişaşı törədən qüvvə – bu çox ciddi qüvvədir, onu yuxarılarda,

ən yuxarılarda axtarmaq lazımdır. Həm də sadəcə axtarmaq yox, aşkara çıxarmaq və tutduğu vəzifədən və rütbəsindən asılı olmayaraq, cəzalandırmaq lazımdır» (201).

Beləliklə, DTK Sov.İKP-ni lazımi qərarları qəbul etməməklə qan tökülməsinə şərait yaratmaqda, Sov.İKP isə DTK-nı yenidənqurma siyasətinə, liberal islahatlara mane olmaq üçün münaqişələr yaratmaqda ittiham edirdi. Amma bu qarşı-qarşıya qoyulmuş xalqların taleyində heç nəyi dəyişmir. Ona görə ki, həm DTK, həm də Siyasi büronun bu münaqişələrdən yararlanmağa çalışdığı göz qabağındadır.

Kaliniçenko da təsdiq edir ki, Qorbaçov fərman imzalamalı idi, lakin bunu etmədi: «Bu məndə sual doğurdu: məgər Kryuçkov Vilnüsə hərbi qüvvələri özbaşına göndərmişdi? Əgər belə idisə, onda Kryuçkova cinayət işi açılmalı, partiya sıralarından xaric edilməli idi. Məhz Sovetlər İttifaqının yuxarı pillələrindəki siyasi xainlik imperiyanın dağılmasına gətirib çıxardı. Düşünürəm ki, onlar nə etdiklərini çox gözəl anlayırdılar. Şəxsən mənim üçün hadisələrin nə ilə nəticələnəcəyini təsəvvür etmək çətin deyildi. Sadəcə, faciənin dəqiq harada baş verəcəyi bəlli deyildi. Haradasa daha ciddi münaqişə yarandı, bir başqa yerdə isə daha zəif. Fərqanə, Sumqayıt, Alma-Ata hadisənin alovlandığı şəhərlərdən oldu. Yeri gəlmişkən, Novoçerkasskda 1962-ci il iyunun 1-də baş vermiş toqquşma və qan tökülməsi də 1964-cü ildə Xruşşovun hakimiyyətdən devrilməsinə hazırlıq işləri idi. Yəni SSRİ-nin güc strukturları özlərinə sərfəli olmayan siyasi rəhbərliyi hakimiyyətdən uzaqlaşdırmaq üçün eyni ssenarini artıq bir dəfə həyata keçirmişdilər. Bu onu göstərir ki, Sumqayıt SSRİ-də daxili siyasi mübarizədə əlverişli səhnə hesab edilirdi» (14–16).

1961–1963-cü illərdəki çıxışlardan sonra Xruşşov DTK tərəfindən hakimiyyətdən uzaqlaşdırıldı. 1988–1990-cı illərdə SSRİ məkanında baş verənlər isə Qorbaçovun istefası ilə nəticələndi. Ancaq 1964-cü il çevrilişindən sonra olduğu kimi SSRİ-ni xilas etmək mümkün olmadı. Güc strukturları da daxildən parçalandıqları üçün QKÇP əməliyyatı uğursuzluqla nəticələndi.

1912-ci ildə Rusiyada liberal islahatçı Stolıpinin zamanında isə Beylisin işi adlı təxribat yəhudilərə qarşı törədilmişdi. Çar Rusiyasının təhlükəsizlik xidmətləri 12 yaşlı uşağın öldürülməsindən 3000 nəfər yəhudinin Kiyevdən köçürülməsi və yəhudi talanları üçün istifadə etdilər. Sonda hər şeyin yalan olduğu üzə çıxsa da, yəhudilərə qarşı siyasət öz işini görmüşdü.

Göründüyü kimi, Sumqayıt talanlarının təhqiqatının izləri Dağlıq Qarabağ və Yerevanda, SSRİ DTK-da, Qorbaçovun yaxın ətrafında itir.

Bütün izlər bu ünvanlara qədər gedir və orada qəflətən yoxa çıxır. Daha doğrusu, izlər Sumqayıtdan Ermənistan və Dağlıq Qarabağa gedir, oradan Moskvaya çatıb yoxa çıxır.

SSRİ-də milli siyasət haqqında məsələ Sov.İKP MK noyabr (1988-ci il) plenumunda müzakirə edildi. Lakin aydın idi ki, müttəfiq respublikalarda müstəqilləşmə meyillərinin qarşısını almaq mümkün deyildir. Sovet cəmiyyəti mərkəzdənqaçma meyillərinə artıq hazır idi. Ayrı-ayrılıqda müxtəlif qüvvələr ölkədə etnik qarşıdurmanı qızışdırmaq yolu ilə SSRİ-nin dağılmasının fəal iştirakçıları oldular.

Həmin dövrdə SSRİ-də siyasi qüvvələrin yerləşməsində daha bir qüvvə öz yerini tutmağa çalışırdı, bu qüvvə şərti olaraq «demokratik ziyalılar» adlanan qrup idi. Partiya daxilindəki liberal qanada başçılıq edən Yakovlev, SSRİ-də Sov.İKP-nin hökmranlığına qarşı çıxış edən «demokratik ziyalılar» qrupunun yaranmasına rəvac verərək, onlardan konservatorlara qarşı istifadə etməyə çalışırdı. Beləliklə, əsl parodoks onda idi ki, 1988-ci ilin əvvəllərində ölkədə vəziyyətin qarışdırılmasında həm Sov.İKP rəhbərliyində bir-biri ilə rəqabət aparan qruplar, həm də «ziyalı demokratların» şəxsində «xalq kütlələri»nin müəyyən hissəsinin də maraqları üst-üstə düşmüşdü (79).

Bu özünü həmin qüvvələrin Sumqayıt hadisələrinə münasibətində də göstərdi. Sov. İKP-dəki məlum qruplaşmalar bu hadisələrdə bir-birini ittiham etməyə başladılar. Yenidənqurmaçılar mühafizəkarları və güc strukturlarını hadisəyə müdaxilə etməməkdə və onların qarşısını almamaqda, mühafizəkarlar isə onları cəmiyyəti liberallaşdırılmaqla neqativ proseslərin, o cümlədən mərkəzdənqaçma meyillərinin, etnik münaqişələrin qızışdırılmasında günahkar sayırdılar. «Demokratik» ziyalılar bu mübarizədə liberalları müdafiə edərək, Qorbaçovun möyqeyindən çıxış etdilər.

O vaxt SSRİ-nin partiya rəhbərliyində iki qruplaşmanın mövcudluğu heç kim üçün sirr deyildi. A.Yakovlevin başçılıq etdiyi liberal-demokratlar və Y.Liqaçovun başçılıq etdiyi yenidənqurma əleyhdarları olan mühafizəkarlar.

Sumqayıt da daxil olmaqla müxtəlif münaqişə ocaqlarının qızışması hər iki qrupa sərfəli idi. Yakovlevin tərəfdarları (V.Medvedyev, E.Şvardnadze, A.Sobçak və b.) açıq şəkildə ifadə etməsələr də, SSRİ-nin mövcud sərhədlərinin, inzibati-ərazi quruluşunun dəyişilməsinə qarşı prinsipial şəkildə çıxış etməməklə ölkədə separatizmin baş qaldırmasına rəvac verirdilər. Sumqayıt hadisələrindən sonra Yakovlevin Yerevana, Liqaçovun

isə Bakıya getməsi təsadüfi sayılmamalıdır. Qeyd edildiyi kimi, Yakovlev ermənilərin tələblərinə loyallıq nümayiş etdirmiş və hətta Yerevanda kütləvi mitinqdə çıxış etmişdi.

Qarabağ məsələsində Siyasi büro üzvləri arasında ciddi fikir ayrılığı olmasını milli məsələlər üzrə mütəxəssisi V.Mixayılov da təsdiq edir: «Siyasi büronun ikili mövqeyi rəsmi sənədlərdə deyil, üzbəüz söhbətlərdə, şəxsi təmaslarda təzahür edirdi. Bütün Siyasi büro üzvləri özlərini belə aparırdılar. Liqaçov Bakıya uçaraq ərazi bütövlüyünün ali prinsip olduğunu deyir. A.Yakovlev hamının ürəyincə (ermənilərin – İ.M.) olan, «ermənilər bu məsələdə düzgün mövqe tuturlar» bəyanatını verir (207, 92–93).

Sumqayıtın ölkədə yarada biləcəyi qeyri-sabitlik elə mühafizəkarlara da sərfəli idi, bununla onlar ictimai rəyin yenidənqurma adı altında həyata keçirilən liberal islahatların hansı fəsadlar törətdiyinə əyani şəkildə əmin olacaqlarını düşünürdülər. Həmin dövrdə bütün güc strukturları mühafizəkarları dəstəkləyirdilər. Qorbaçovun hakimiyyətə gəlməsi ilə onların, xüsusən hərbi müdafiə idarəsinin xaricdə mövqeyi xeyli zəifləməyə başlamışdı. 1988-ci ilin əvvəlində qoşunların Əfqanıstandan çıxarılması, orta mənzilli paketlərin Şərqi Avropada yerləşdirilməsindən imtina, müxtəlif regionlarda nüfuzunu itirmiş rejimlərin sovet hərbi dəstəyindən məhrum olması SSRİ hərbi-sənaye kompleksinin və hərbçilərin nüfuzunun aşağı düşməsinə səbəb olmuşdu.

Rusiyada yaşayan azərbaycanlı müəllif A.Mürsəliyev bu məqama diqqət çəkərək göstərir ki, ziyalıların liberal hissəsi və gələcək demokratlar Qarabağ münaqişəsində, demək olar ki, qeyri-şərtsiz ermənilərin tərəfini tutdular. Səbəb çox sadə idi: ermənilər mövcud qaydalara qarşıdırlar, dəyişikliklər istəyirlər. Deməli, onlar bizim müttəfiqimizdirlər (164). D.Furman da bunu təsdiq edir. «Liberal rus şüuru qəti olaraq erməni tərəfini tutdu. Bu qismən o vaxt populyar olan «xalqların öz müqəddəratını müəyyən etmək hüququ» ideyası ilə bağlı idisə (Ermənistanda da azərbaycanlıların kompakt yaşadıqlarını və nəzəri cəhətdən onların da öz müqəddəratının müəyyənləşdirmək hüquqlarının olmasını əksər ruslar sadəcə olaraq bilmirdilər – D.F.), qismən də status-kvoya qarşı çıxan hər kəsi dəstəkləməyə hazır olmaları ilə bağlı idi (211). L.Borisov soyadlı müəllif də bu məqamı vurğulayır: «O dövrün piar qanunlarına görə azərbaycanlılar kommunist rejiminin dayağı, ermənilər isə azadlıq və demokratiya uğrunda mübarizlər elan olunmuşdu. Azərbaycanlılar mürtəce, ermənilər mütərəqqidirlər. Azərbaycanlılar vəhşi, ermənilər öz müqəddə-

ratını təyinetmək hüququ uğrunda mübarizə aparan nəcib mübarizlərdir. … Azərbaycanlılar haqqında heç kim düşünmək istəmirdi, heç kimin onlarla işi yox idi» (91). Sumqayıt hadisələrindən sonra Moskvada Vaqankovo qəbiristanlığının yanındakı erməni kilsəsinin qarşısında elə həmin «liberal-demokratik» ziyalıların ermənilərin müdafiəsi üçün təşkil edilmiş, açıq-aşkar antiazərbaycan xarakterli mitinqi də bunu sübut edirdi. Nuykin, Starovoytova, Çerniçenko, Voznesenski, Okucava, Bıkov, F.İskəndər, Çilinqarov kimi ziyalıların dilindən azərbaycanlılara qarşı nifrət dolu sözlər, hətta onları Rusiyadan qovmaq çağırışları eşidilirdi.

Bununla da, Sumqayıt ölkədə qeyri-sabitliyin inkişafında mühüm mərhələ olmaqla, SSRİ-nin süqutunu da tezləşdirən amilə çevrildi. Ölkə daxilində, həm partiya rəhbərliyində, həm də cəmiyyətdə mühafizəkarlarla liberallar arasında qəti qütbləşmə baş verdi. Bu mənada Volterin məşhur frazasını dəyişdirərək təkrar etmək lüzumu vardır: «Əgər Sumqayıt olmasaydı belə, onu uydurmaq lazım gələrdi».

Hadisələrin belə istiqamət almasında, SSRİ-də ictimai rəyin antiazərbaycan ruhunda formalaşmasında kütləvi informasiya vasitələrinin də az rolu olmadı. O zaman mərkəzi mətbuat orqanlarında bölgədə gedən proseslər haqqında, demək olar ki, obyektiv məlumat verilmirdi. Ölkə ictimaiyyəti nə Ermənistandan didərgin salınmış azərbaycanlıların taleyi, nə də Dağlıq Qarabağda etnik təmizləmələr haqqında heç bir təsəvvürə malik deyildi. Adicə bir fakt: hadisələr ərəfəsində Sumqayıta Ermənistandan qovulmuş azərbaycanlıların gəlməsi haqqında məlumat heç bir qəzetdə öz əksini tapmamışdı. Ancaq Sumqayıtı tərk etmiş ermənilər haqqında bütün ölkədə bilirdilər. Eləcə də Sumqayıtdan sonra Ermənistan ərazisində azərbaycanlılara qarşı vəhşiliklər, Quqark hadisələri də ittifaq mətbuatında işıqlandırılmamışdı. Bu da münaqişə tərəflərindən birinin dəstəklənməsinə, digərinin isə bütün hadisələrdə günahlandırılmasına gətirib çıxartdı. Antiazərbaycançı qüvvələrin Sumqayıt faciəsindən istifadə edərək azərbaycanlıların vəhşi obrazını yaradılması kimi iyrənc niyyətləri baş tutdu.

Sumqayıt hadisələri Rusiya elitasında Azərbaycan əleyhinə əhvali-ruhiyyənin artmasına təkan verdi. Ümumiyyətlə, tarixən rus ictimai şüurunda azərbaycanlı və erməni obrazı heç də eyni səviyyədə yer tutmamışdır. Bunun bir sıra obyektiv və subyektiv səbəbləri mövcuddur, hər iki millətə münasibətdə mövcud olan stereotiplər müəyyən tarixi amillərlə sıx bağlıdır.

Tarixən Rusiya imperiyasının genişlənərək cənuba doğru irəliləməsi, Türkiyə, İranla mübarizədə erməni amilindən istifadə edilməsi son nəticədə Rusiyada ermənilərin sayının artması ilə yanaşı, onların ölkənin ictimai-siyasi, mədəni həyatında, idarəetmədə rolunun güclənməsi ilə nəticələnirdi. Rusiya ictimai şüurunda, eləcə də elmi dairələrdə çarizmin Qafqazda möhkəmlənməsində ermənilərin müstəsna xidmətləri haqqında stereotiplər hələ də qalmaqdadır. Rusiya müəllifi A.Ovçinnikovun da vurğuladığı kimi, ermənilərin müstəsnalığının, xüsusi rolunun ideoloji əsaslandırılması Azərbaycanla Ermənistana obyektiv münasibətin formalaşmasına mane olur (178), təbii ki, Azərbaycan əleyhinə olan stereotiplərin yaranmasında Rusiyada çoxlu sayda erməni müəlliflərin olması faktoru, onların Rusiya mətbuatına, elmi dairələrə yol tapması da az rol oynamır.

Rusiyada antiazərbaycan ovqatın güclənməsində bu ölkənin yuxarı hakimiyyət eşelonlarında, elmi və iqtisadi strukturlarında möhkəm yer tutan erməni diasporunun gizli və ya açıq fəaliyyətini də mütləq qeyd etmək lazımdır. Azərbaycanlılar isə neft-qaz sahəsi istisna olmaqla keçmiş SSRİ-də yüksək eşelonda təmsil olunmamışlar. Əslində, bu vəziyyət indi də dəyişilməz qalmaqdadır.

Azərbaycanlıların rus şüurunda Osmanlı türkləri ilə eyniləşdirilməsi də erməni-Azərbaycan münaqişəsi, Dağlıq Qarabağ probleminin obyektiv qavranmasına öz təsirini göstərir. D.Furman bu amili nəzərdə tutaraq qeyd edir: «Azərbaycanlılar Sumqayıt talanlarının dəhşətləri ilə birgə Rusiya şüuruna müdaxilə edirlər. Bu, «xalqlar dostluğu» haqqında sovet stereotiplərinə zidd olsa da, rus şüurunun islam dini ilə bağlı dərin stereotiplərinə uyğun gəlirdi. Sumqayıt dözümsüz, fanatik və qəddar müsəlmanlar haqqında təsəvvürləri yenidən canlandırdı. Azərbaycanlılar iki, eyni dərəcədə xoşagəlməz obraza gözəl uyğun gəlirdilər. Ruslar azərbaycanlıları türk kimi qəbul edirdilər. Türklərlə bağlı təsəvvürlər isə onlarda rus-türk müharibələri nəticəsində formalaşmış və xristian qadınları, uşaqları amansızcasına öldürmüş yeniçərlərin obrazı ilə bağlı idi.

Sumqayıtda baş verənlər tamamilə bu sxemə uyğun idi və erməni-azərbaycanlı münaqişəsi kiçik xristian xalqını qıran qəddar, müsəlman obrazında qavranırdı. Birincinin «sülhsevərliy»inə, digərinin isə «qaniçənliy»inə inam sovet vətəndaşlarının beynində möhkəm yer tutmuşdu (211).

Nəticədə, 1988-ci ildən başlayan qarşıdurmada Azərbaycan tərəfi həm tarixən formalaşmış, həm də Sovet ideologiya maşınının yaratdığı

mənfi stereotiplərin təsiri altına düşdü. Sumqayıt, guya, müsəlman azərbaycanlıların xristian ermənilərə qarşı antiinsani hərəkətləri kimi səciyyələndirildi. Çox təəssüf ki, həmin hadisələrin qiymətləndirilməsində bu stereotip indiyə qədər öz mövcudluğunu saxlamaqdadır.

Amerika Birləşmiş Ştatları başda olmaqla Qərb dünyasının SSRİ-ni parçalamaq cəhdləri 80-ci illərin ikinci yarısında, M.Qorbaçovun yenidənqurma siyasətinin həyata keçirilməsi nəticəsində ölkəni bürümüş siyasi, iqtisadi, mənəvi böhran milli münasibətlərin kəskinləşməsi fonunda daha aşkar xarakter almağa başladı. SSRİ-nin süqutunu yaxınlaşdıran əsas faktorlardan biri, Qərb analitiklərinin fikrincə, məhz millətlərarası münaqişələrin qızışdırılması olmalı idi. Məhz Sumqayıt SSRİ-nin süqutunu labüdləşdirən qanlı hadisələr zəncirinin mühüm həlqəsi oldu. Sumqayıtdan sonra Sovet İttifaqının müxtəlif bölgələrində baş verən oxşar hadisə və proseslər bu versiyanın həyatiliyini sübut etdi. Dağlıq Qarabağda cərəyan edən proseslər, Pribaltikada vəziyyətin gərginləşməsi, Tbilisi, Oş, Fərqanə hadisələri azərbaycanlıların Ermənistandan tamamilə qovulub çıxarılması fonunda M.Qorbaçova 1990-cı ildə Nobel Sülh mükafatının verilməsi Qərbin «Qorbi»nin ölkəni dağıtmağa görə xidmətinə verdiyi «qiymət» oldu.

Belə şəraitdə ölkə daxilində dağıdıcı proseslərin, milli münaqişələrin qarşısını ala biləcək yeganə qüvvənin ordu olmasını hamıya sübut etmək zərurəti yaranmışdı.

Ç.Sultanov da Sumqayıt faciəsini SSRİ rəhbərliyindəki liberallarla mühafizəkarlar arasındakı mübarizənin nəticəsi hesab edir və hər iki qanadın ölkədə xaos yaranmasında maraqlı olduğunu vurğulayır: «Qorbaçova idarə olunan xaos ona görə lazım idi ki, Qərbə göstərsin ki, hansı çətinliklərlə o, epoxal lider, öz yenidənqurmasını aparır. M.Qorbaçov ümid edirdi ki, bu idarə olunan xaos onun rəqiblərini aradan çıxaracaqdır. Onun rəqibləri isə ölkədə maksimum xaosun olmasında maraqlı idilər ki, bu xaosda Qorbaçov və onun yenidənqurması məhv olsun. Onlar başa düşürdülər ki, hadisələrin sakit gedişatında onların hamısı ətalətçi damğası ilə siyasi arenadan gedəcəklər» (201, 175). Liqaçovun Qorbaçovu təqsirləndirməsi və onu sabitliyi təmin etmək üçün heç bir şey etməməkdə günahlandırması da bundan irəli gəlirdi.

Sumqayıt hadisələrindən sonra vəziyyət Dağlıq Qarabağı Azərbaycandan ayırıb Ermənistana birləşdirmək və azərbaycanlıları kütləvi şə-

kildə Ermənistandan qovmaq istəyən qüvvələrin xeyrinə dəyişdi. Azərbaycanlılardan günahkar və vəhşi imici yaratdılar.

O zaman Qarabağda olmuş Vladimir Lusenko deyir: «Sumqayıt hadisələrindən sonra psixoloji çatlama baş verdi. Ancaq Sumqayıt hadisələrindən sonra Qarabağ ermənilərində qorxu əmələ gəldi: əgər biz Ermənistana birləşməsək, onda «Qarabağ Sumqayıtı» baş verəcək» (234).

M.Qorbaçov da Sumqayıt hadisələrinin yaratdığı effektdən istifadə edərək dərhal siyasi bəyanatlarının tonunu dəyişdi. Sumqayıt talanından dərhal sonra, fevralın 29-da M.Qorbaçov və A.Yakovlev Stepanakertdə və Yerevanda fasiləsiz mitinq keçirən ermənilərə toxunmamağı və mitinqçiləri dağıtmamağı tələb etdilər (116). Ona görə ki, Sumqayıt hadisələrindən dərhal sonra ermənilərə azərbaycanlıları ittiham etmək üçün geniş meydan və tribuna lazım idi. Qorbaçov və Yakovlev onlara bu meydanı və tribunanı təqdim edirdi və onlara çıxış etmək üçün imkan yaradırdılar. Azərbaycanlılar haqda isə artıq ikrah və hiddətlə danışılmağa başlamışdılar.

Bütün dünyada, o cümlədən Moskvada antiazərbaycan təbliğatı gücləndirildi. Təbii ki, artıq Mərkəzi Komitənin fevralın 21-dəki qərarı öz qüvvəsini itirmiş oldu. Silva Kaputikyanın dedikləri «məğlubiyyətimizi qələbəyə çevirəcəyik» vədi özünü doğrultdu. Artıq fevralın 29-da, Sumqayıt hadisəsindən sonra M.Qorbaçovun çıxışının tonu dəyişdi. O, Yerevandakı mitinqlərin dinc xarakter daşıdığını, antisovet şüarların olmamasından razı qaldığını söyləyir, bununla da ermənilərin etiraz çıxışlarının davam etdirilməsinə yaşıl işıq yandırırdı.

Moskvadakı ermənilərin və ermənipərəst qüvvələrin Sumqayıt hadisələrindən sonra mövqeyi daha açıq antiazərbaycan xarakter almağa başladı. Bu dairələrdən Siyasi büroya daxil olan məktub və müraciətlərdə məsələni ermənilərin xeyrinə həll etməyin, Dağlıq Qarabağı Azərbaycandan qoparmağın vacibliyi öz əksini tapmışdı.

Azərbaycan xalqının kürəyinə növbəti zərbəni Azərbaycana, Bakıya çoxlu şeirlər həsr etmiş, özünü Azərbaycanın «ədəbi dostu» adlandıran, həmin dövrdə SSRİ Ali Soveti Rəyasət Heyətinin üzvü olmuş şair Rəsul Həmzətov vurdu. Qorbaçovdan Sumqayıt hadisələrinin ermənilərin soyqırımı kimi tanımağı tələb edən (201, 194) R.Həmzətov 1988-ci il iyulun 18-də, guya, kompromis variant kimi DQMV-ni RSFSR-i tərkibinə verilməsini təklif etdi.

Yelena Bonner – Əlixanyanın həyat yoldaşı akademik Andrey Saxarov Sumqayıt hadisələrindən dərhal sonra verdiyi bəyanatla Sumqayıt talanlarının təşkilinin məhz nə üçün lazım olduğunu dəqiqliyi ilə ifadə etdi: «Heç bir yarımtədbirlər adamları sakitləşdirə bilməz, xalqlar dostluğu haqda heç bir söhbət gedə bilməz. Əgər bu barədə Sumqayıt hadisələrinə qədər kimsə tərəddüd edirdisə, bu faciədən sonra heç kimdə mənəvi imkan qalmır ki, DQMV-nin Azərbaycanın tərkibində qalmasına təkid etsin» (201, 162).

Erməni diasporunun A.Saxarovun vasitəsilə hücumları da davamlı xarakter aldı. 1988-ci il martın 21-də Andrey Saxarov Mixail Qorbaçova məktub göndərərək ölkə rəhbərliyini Qarabağı Ermənistana birləşdirməyə çağırdı (81).

Deməli, Sumqayıta qədər Dağlıq Qarabağ və Azərbaycanın ərazi bütövlüyü haqda ictimai-siyasi rəy bir cür idisə, Sumqayıt hadisələrindən sonra bu rəy əks istiqamətə ermənilərin xeyrinə, Azərbaycanın isə əleyhinə dəyişdi. Deməli, Sumqayıt hadisələri məhz radikal-millətçi ermənilərin maraqlarına cavab verirdi.

Qorbaçov açıq-aydın erməniləri müdafiə etməyə başladı.

Siyasi büronun fevralın 29-dakı iclasında M.Qorbaçov erməniləri şirnikləndirən daha bir bəyanatını verdi. «Mən şəxsən iki səbəb görürəm. Birincisi, Qarabağın özündə buraxılmış çoxsaylı səhvlərdir. Üstəgəl erməni xalqının daxilində dərinlikdə oturmuş emosional səbəbdir. Bu xalqın tarixi boyu baş verənlər unudulmayıb və bu səbəbdən onların bütün həyəcanları bax belə reaksiyaya səbəb olur» (207, 49). Bununla da, Qorbaçov ermənilərin bütün hərəkətlərinə haqq qazandıran çıxışı ilə onları sonrakı daha radikal hərəkətlərə sövq edirdi. Ermənilər Yerevanda, Stepanakertdə və Moskvada fasiləsiz mitinqlər keçirmək imkanı qazandılar.

1988-ci il martın 9-da Sov. İKP MK-nın iclası keçirildi. İclasda Qarabağ hərəkatını doğurmuş bəzi mədəni və iqtisadi problemlərin olduğu iddia edildi (81). Belə görünür ki, Sumqayıt hadisələrinə qədər heç bir iqtisadi və mədəni problem yox idi, amma Sumqayıt talanlarından sonra Dağlıq Qarabağda iqtisadi və mədəni problemlərin olduğunu etiraf etmək lazım gəldi. Təbii ki, bu məqam da Sumqayıt hadisəsinin yaratdığı siyasi-psixoloji atmosferdən maksimum yararlanmaq məqsədi güdürdü.

Naməlum operatorların Sumqayıt talanları zamanı çəkdikləri kadrlar bütün dünyanın televiziyalarını dolaşdı və ermənilərin Azərbaycanı lə-

nətləyən şərhləri ilə müşayiət olundu. Onların mitinqlərinə nəinki mane olmurdular, əksinə, Moskvada üç gün dalbadal keçirilən mitinqləri Moskva milisi qoruyur və mitinqçilər ərzaqla təmin olunurdular.

Martın 18-də Siyasi büro üzvlərinin Moskvada yaşayan və işləyən Azərbaycan və erməni millətindən olan elm və mədəniyyət xadimləri ilə görüşü də bir nəticə vermədi. Sov. İKP Mərkəzi Komitəsində Y.Liqaçovun DQMV əmək kollektivlərinin bir qrup nümayəndəsi ilə söhbəti haqqında kütləvi informasiya vasitələrində yalnız ümumi informasiya verildi (167, 21–23).

Martın 21-də Siyasi büro Dağlıq Qarabağla bağlı yenidən toplaşdı. İclasda «Dağlıq Qarabağ ətrafında baş verən hadisələrlə əlaqədar Azərbaycanda və Ermənistanda vəziyyətin normallaşdırılmasına dair bəzi təxirəsalınmaz tədbirlər» haqqında məsələ müzakirə edildi.

Münaqişənin dərinləşməsi haqqında məlumat verən M.Qorbaçov etiraf etdi ki, Qarabağ komitəsi Ermənistanda qeyri-formal hakimiyyət mərkəzinə çevrilmişdir. Lakin partiya ritorikasına sadiq qalan M.Qorbaçov bütün problemləri… Lenin milli siyasətinin pozulması ilə bağladı. Halbuki, Dağlıq Qarabağ elə həmin «Lenin milli siyasəti»nin nəticəsi idi ki, bu siyasətin əsasını milli-dövlət bölgüsü, millətlərin ayrılmasına qədər öz müqəddəratını təyinetmə hüququ, SSRİ-nin Lenin modeli təşkil edirdi.

Həmin iclasda Y.Liqaçov qısa zamanda hər iki respublikanın rəhbərliyini dəyişdirməyi təklif etdi: «Belə ki, qorxmadan deyirəm rəhbərlərin özləri milliyyətçi əhvali-ruhiyyəyə mübtəla olublar» (180, 115). M.Qorbaçov həmin iclasda Qarabağ hadisələrinin «SSRİ-də milli münasibətlərə təsiri»nə toxunaraq göstərirdi: «Bu hadisələr Pribaltikadakı siyasətə təsir göstərməyə başlayır. Krım tatarlarının tələblərində özünü göstərir» (180, 126).

Moskvanın SSRİ-nin müttəfiq respublikalarının ali qanunverici orqanlarını da Dağlıq Qarabağ probleminin həllinə qoşmaq səyləri də səmərəsiz oldu. Bütün müttəfiq respublikaların ali sovetləri bir-birinin ardınca bu məsələni müzakirə edərək ümumi frazalarla kifayətlənməyi üstün tutdular (167, 23–40). Respublikaların ali sovetlərinin müraciətini nəzərdən keçirən SSRİ Ali Sovetinin Rəyasət Heyəti «mürəkkəb milli-ərazi məsələlərinin dövlət hakimiyyət orqanlarına təzyiq edilməsi yolu ilə, emosiya və ehtirasların qızışdırılması şəraitində və qeyri-müəyyən nəticələrə gətirib çıxara biləcək, SSRİ konstitusiyasında öz əksini tapmış milli-dövlət və milli-inzibati sərhədlərin yenidən çəkilməsi uğrunda çıxış edən müxtəlif

özbaşına qurumların yaradılması yolu ilə həllini yolverilməz» hesab etdi (184, 1988, 23 mart). Qərarda, həmçinin SSRİ Nazirlər Sovetinə DQMV-in təsərrüfat və sosial-mədəni inkişafında vaxtı çatmış məsələlərin həllinə yönəlmiş tədbirlər planı işləyib-hazırlamaq tapşırılmışdı (82, 1988, 24 mart).

Elə səhəri gün SSRİ Nazirlər Sovetinin «1988–1995-ci illərdə Azərbaycan SSR DQMV-nin sosial-iqtisadi inkişafının sürətləndirilməsinə dair tədbirlər haqqında» Sov. İKP MK və SSRİ Nazirlər Sovetinin məlum qərarı qəbul edildi.

Qərarda DQMV-in sosial-iqtisadi sahədə qazandığı uğurlardan cəmi bir abzas bəhs edildikdən sonra vilayətdə mövcud olan nöqsanlardan danışılır və DQMV-in sosial-iqtisadi inkişafın sürətləndirilməsi ilə bağlı qəbul edilmiş 21 maddəlik tədbirlər kompleksinin məzmunu açılırdı (32, 1988, 27 mart; 19).

Lakin bu qərarın nə vəziyyətin sabitləşməsinə, nə də erməni separatçılarının qanunsuz əməllərinin qarşısının alınmasına heç bir müsbət təsiri olmadı. Hələ qərarın hazırlanması mərhələsində Moskva onun əsas müddəalarını müəyyənləşdirməklə bağlı Bakıya göstəriş vermiş, Bakı isə müvafiq materialları hazırlamaq üçün Dövlət Plan Komitəsinin sədri A.Mütəllibov, Azərbaycan KP MK katibi T.Orucov və şöbə müdiri Z.Səmədzadədən ibarət qrupu Stepanakertə göndərmişdi. Lakin Stepanakertdə onları aqressiv qarşılamış və hazırlanacaq qərara tam etinasızlıq göstərmişdilər. Nəticədə Dağlıq Qarabağın hakimiyyət orqanlarından heç bir təklif alınmamış, vilayət partiya komitəsinin yeni seçilmiş birinci katibi H.Poqasyan açıq bildirmişdi: «Biz iqtisadi deyil, siyasi məsələləri həll edirik. Ümumiyyətlə, biz siyasi cəhətdən müstəqil olmaq istəyirik» (165, 26).

Dağlıq Qarabağ və Ermənistan rəhbərliyi açıq-aşkar separatizm mövqeyinə keçsə də, nə Bakıda, nə də Moskvada adekvat tədbirlərin görülməməsi onların hərəkətlərinin daha da həyasız şəkil almasına gətirib çıxardı. Düzdür, Ermənistan rəhbərliyinin qərarı ilə «Qarabağ» ictimai komitəsinin fəaliyyəti «mövcud qanunvericiliyə və xalqın maraqlarına zidd olduğuna görə» qadağan edilmiş, eyni addım Dağlıq Qarabağda «Krunk» təşkilatı ilə də bağlı atılmışdı. Lakin hamıya aydın idi ki, bütün bunlar gözə kül üfürməkdən başqa bir şey deyildir. Yerevanda mitinqlərin keçirilməsinə qadağa qoyulsa da, 1988-ci il martın sonlarında bir milyonluq mitinqlə yanaşı, ümumi tətil də keçirildi.

O zaman təkcə ölənlərin sayının şişirdilməsi və zorakılığın miqyasının böyüdülməsi ilə iş bitmirdi. Həm də ölənlərin sayının artırılması ilə bağlı məsələnin, sadəcə, şayiə olmayıb sistemli şəkildə təşkil edildiyini sübut edən faktlar var. Məsələn, «Московские новости» qəzetinin 1988-ci il 22 may nömrəsində dərc edilmiş V.Loşakın «Сумгаит. Эпилог трагедии» adlı reportajında təxribat xarakterli dezinformasiya yayılmışdı. Həmin məqalədə Bakıdakı erməni – Qriqorian kilsəsinin rəhbəri David Dilanyanın adından yazılmışdı ki, guya, Bakıdakı erməni kilsəsini yandırmağa cəhdlər olub. «Московские новости» qəzetinin sıradan bir qəzet olmadığı və keçmiş SSRİ-də aparıcı mətbuat orqanlarından biri, Vladimir Loşakinin sonradan həmin qəzetin baş redaktoru olduğunu və mövzu kimi məhz kilsəyə hücumun seçilməsini nəzərə alaraq sözügedən məqalənin heç də təsadüfən ortaya çıxmadığı bəlli olur. Məqalədə yazılırdı:

«Baş verənlərdən sonra (Sumqayıt hadisələri nəzərdə tutulur – red.) qorxu və mağmunluğu kilsə də hissə etməyə başlayıb.

… – Eşidəndə ki, bizim kilsəni yandırmağa cəhd ediblər, çoxları məyus oldu – deyə Bakıdakı müqəddəs erməni Qriqorian kilsəsinin baş keşişi David Dilanyan danışdı» (146). Bununla da ermənilər və onların Moskvadakı tərəfdarları Sumqayıt hadisələrindən sonra dini amili şişirtmək və baş verənləri süni olaraq xristian–müsəlman qarşıdurması kimi təbliğ edərək dünyanın güclü hissəsinin – Avropa və ABŞ-ın dəstəyini almağa çalışırdılar. Bu sonradan da Ermənistanın rəsmi təbliğatının elementinə çevrildi.

Ancaq maraqlı odur ki, «Московские новости» qəzetindəki bu məqalədən dərhal sonra Bakıdakı erməni Qriqorian kilsəsinin baş keşişi David Dilanyan «Azərinform»a müsahibə verərək «Московские новости» qəzetinə belə bir müsahibə vermədiyini bəyan etmişdi. «Azərinform»un bu məsələ ilə bağlı yaydığı məlumatda deyilirdi:

«Bu məsələ ilə bağlı D.Dilanyan bizə məktubla müraciət edərək, kilsənin yandırılmasına cəhdlə bağlı orada yazılanları qətiyyətlə təkzib edib. O yazır: «Təxminən mayın 15-də erməni kilsəsinə bir nəfər gəldi və özünü «Московские новости» qəzetinin müxbiri kimi təqdim etdi. O, kilsəyə gələnlərin təxmini sayı, onların əhvali-ruhiyyəsi haqda soruşurdu. Soruşurdu ki, Sumqayıtdan qaçanlar kilsəyə gəlirlərmi… Guya ki, kilsənin yandırılmasına cəhd edilməsi haqda mən nə isə demişəm. «Московские новости» qəzetinin bu hərəkəti məni hiddətləndirdi. Mən həmin məqa-

lədə qeyd edilmiş faktın rəsmi olaraq təkzib edilməsini tələb edirəm» (83). Bununla da, «Московские новости» qəzetinin yeni münaqişə mənbəyi açmaq niyyəti üzə çıxır. Qəzetin məhz erməni Qriqorian kilsəsinə hücumla bağlı dezinformasiya yayması dini hislərin alovlandırılması ilə Avropa və Amerikanın ictimai rəyinin Ermənistanın xeyrinə yönəldilməsinə xidmət edirdi. Daha bir mühüm məqam isə bunun qəsdən edilməsi faktıdır. Rusiyanın paytaxtındakı aparıcı qəzetlərdən birinin aparıcı əməkdaşı xristian kilsəsinə hücumla bağlı təsdiq edilməmiş informasiyanı yayırsa, deməli, bunun arxasında böyük plan və ciddi qüvvələr var. Əks təqdirdə, dezinformasiyanın yayılmasında məqsəd nə ola bilərdi? Bu məqalə millətlərarası qarşıdurmanı, dinlərarası qarşıdurma müstəvisinə keçirməklə Azərbaycana qarşı beynəlxalq qınağın əhatəsini, miqyasını genişləndirmək məqsədi güdürdü. Son hədəf isə Dağlıq Qarabağın Azərbaycandan ayrılmasının milli, dini və siyasi zəminini hazırlamaq olmuşdu. «Баку» qəzetində dərc edilmiş təkzib yazısı belə adlanırdı: «Bu kimə sərfəlidir?»

«Sumqayıt hadisələri kimə sərfəli oldu?» klassik sualına birmənalı cavab belədir: Ermənistana! Ermənistan Sumqayıt hadisəsindən maksimum yararlandı:

– Məhz Sumqayıt hadisəsindən sonra Ermənistan Dağlıq Qarabağı Azərbaycandan qoparmaq üçün süni arqument formalaşdırdı. Dünya ictimaiyyətinin gözündə Azərbaycanı təcavüzkar, erməniləri isə əzabkeş qismində göstərmək üçün süni siyasi zəmin yarandı;

– Mərkəzi Komitənin sərhədlərin dəyişməməsi haqda 21 fevral qərarı siyasi baxımdan mənasız kağız parçasına çevrildi;

– Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi hərəkatını yenidən, daha təcavüzkar şəkildə canlandırdı. Ermənistan və Dağlıq Qarabağda radikal millətçilərin mövqelərini xeyli möhkəmləndirdi;

– SSRİ rəhbərliyi – konkret olaraq Qorbaçov açıq-aşkar ermənilərin mövqeyindən çıxış etmək imkanı qazandı və çıxış etməyə başladı. Bütün bu siyasi aspektlər Ermənistan Ali Sovetinin silahlı mübarizəyə yol açan qeyri-qanuni qərarı ilə nəticələndi. Ermənistan Ali Soveti 1988-ci il iyunun 15-də «Dağlıq Qarabağ Muxtar Vilayətinin Ermənistan SSR-in tərkibinə keçməsi haqqında» qərar qəbul etdi.

Viktor İlyuxin bu barədə deyirdi: «Bu, Ermənistana, Levon Ter-Petrosyan kimi avantüristlərə sərfəli oldu. Onlar «Sumqayıt kartı»nı Qara-

bağın Azərbaycandan ayrılması məsələsini qoyanda oynadılar. Guya, onları sıxışdırırlar və s. Mahiyyətcə onlar böyük faciə üzərində böyük tamaşa oynadılar» (234).

Azərbaycan Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunun direktoru akademik Ziya Bünyadov 1989-cu ilin yanvarında dərc edilmiş «Nə üçün Sumqayıt?» məqaləsində yazırdı: «Nə üçün Sumqayıt? Ona görə ki, daşnaklarda yenidən, özü də neçənci dəfə, rəssam Vereşşaginin «Müharibənin apofeozu» əsərini «erməni kəllələrilə» müasir fotoqrafiyaya çevirmək istəyi vardı» (93).

Amerika Birləşmiş Ştatlarının Senatı da Dağlıq Qarabağ münaqişəsi üzrə 19 noyabr 1989-cu ildə qəbul etdiyi qətnamədə Sumqayıt hadisələrini xüsusi vurğulayır. Deməк olar ki, düyanın bütün erməni təşkilatlarının sənədlərində öz əksini tapmış bu qətnamədə (S.J.Res.178) qeyd edilir: «Dağlıq Qarabağ Muxtar Vilayətində yaşayan 80 faiz ermənininin əksəriyyətinin narahatlığını, Sovet İttifaqı hökumətinin 28–29 fevral 1988-ci ildə Sumqayıt şəhərində ermənilərin qətlini talan kimi xarakterizə etməsini, ilkin olaraq Sovet İttifaqının xalqı və hökumətinin pozitiv tədbirlərə əl ataraq Dağlıq Qarabağ Muxtar Vilayətində müvəqqəti Xüsusi İdarəetmə Komitəsini yaratmasını, bu Komitənin effektiv olmamasını nəzərə alaraq Sovet İttifaqı ilə ikitərəfli diskussiyaların gedişində Dağlıq Qarabağ münaqişəsinin region xalqlarının baxışlarını əks etdirən ədalətli həllinə təsir etməli» (201, 141; 229).

Beləliklə, Sumqayıt təxribatı ABŞ Senatının Qətnaməsində öz əksini tapmaqla, eyni zamanda həm erməni diasporunun, Ermənistanın millətçi dairələrinin və həm də ABŞ-ın maraqlarına cavab verən məzmunda rəsmiləşdi. Maraqlıdır ki, ABŞ Senatının bu qətnaməsində Arkadi Volskinin rəhbərlik etdiyi Xüsusi İdarəetmə Komitəsinin yaradılması alqışlanır, amma onun qeyri-effektiv olması vurğulanırdı. Diqqəti cəlb edir ki, Xüsusi İdarəetmə Komitəsi haqda ilk təklifi məhz qatı millətçi, Dağlıq Qarabağın Azərbaycandan ayrılması hərəkatını təşkil edənlərdən biri olmuş İqor Muradyan səsləndirmiş, Qorbaçov məhz Sumqayıt hadisəsindən sonra onu həyata keçirmək üçün əlverişli siyasi imkan əldə etmişdi.

Məhz Sumqayıt hadisələrindən sonra SSRİ Elmlər Akademiyasının Dünya iqtisadiyyatı və beynəlxalq münasibətlər İnstitutunun əməkdaşları 1988-ci il martın 18-də Sov. İKP MK-nın Siyasi bürosuna məktub göndərdilər. Məktubda «muxtar vilayətin birbaşa Moskvanın tabeliyinə ve-

rilməsi və yaxud Rusiya Federasiyasının tərkibinə daxil edilməsi» təklif olunurdu (166). Əks halda proseslərin arzuolunmaz istiqamətdə inkişaf edəcəyi ilə bağlı proqnoz verilmişdi. Bu isə açıq-aşkar təhdid idi. İqor Muradyanın və o zaman birmənalı olaraq xüsusi xidmət orqanlarının nəzarəti altında olan SSRİ Elmlər Akademiyasının Dünya İqtisadiyyatı və Beynəlxalq Münasibətlər İnstitutunun Dağlıq Qarabağı Azərbaycanın tabeliyindən çıxarmaq haqda təkliflərinin eyni bir mənbədən qaynaqlandığı və məhz Sumqayıt talanından sonra aktuallaşaraq səsləndirildiyi danılmaz faktdır. Sumqayıt talanı ermənilərə əsas verməli idi ki, Dağlıq Qarabağı Azərbaycanın tərkibindən çıxarsınlar. Daha sonra isə onu Ermənistana birləşdirmək elə ciddi bir hüquqi problem yaratmamalı idi. Qarabağı Azərbaycandan alıb Ermənistana birləşdirmək isə ərazi iddiası kimi meydana çıxırdı ki, bu da ərazi toxunulmazlığı və sərhədlərin dəyişməzliyi kimi fundamental prinsiplərə ziddir.

Xüsusi İdarəetmə Komitəsinin nəticəsiz qalması isə ABŞ-a münaqişənin həllinə müdaxilə etmək üçün əsas verməyə başladı. Yuxarıda qeyd edilmiş ABŞ Senatının qətnaməsi məhz SSRİ-ni təşkil etmiş iki millətin arasındakı münaqişəyə belə bir müdaxilənin rəsmiləşdirilməsində ilk addımlar idi.

Qarşıdurma şiddətləndi və Ermənistanda yaşayan 200 mindən artıq azərbaycanlının Ermənistandan qovulması prosesi başlandı. Bu məqam xüsusilə diqqət tələb edən, geosiyasi aspektdən qiymətləndirilməli olan bir məqamdır. Ona görə ki, azərbaycanlıların Ermənistandan qovulması və xaricdən ermənilərin Ermənistana köçürülməsi çar Rusiyasının 1828-ci ildən əsasını qoyduğu bir siyasətdir. İndi həmin siyasət sovet dövründə davam etdirilirdi. Qorbaçovun hakimiyyətə gəlməsindən dərhal sonra 20 iyun 1985-ci ildə SSRİ Nazirlər Soveti «1985–1986-cı illərdə xaricdən ermənilərin SSRİ-yə repatriasiyasının – köçürülməsinin davam etdirilməsi haqqında» qərarı təsdiq edildi. Ermənistan Kommunist partiyasının o zamankı birinci katibi Karen Dəmirçyanın Mərkəzi Komitəyə ünvanladığı bu sənəddə həmin qərarın 1990-cı ilədək uzadılması xahiş olunurdu. Dəmirçyanın Mərkəzi Komitəyə ünvanladığı və məxfi qrifi ilə işarələnmiş məktubunda deyilir:

***Tam məxfi:***

*«Ermənistanda Sovet hakimiyyəti qurulmasının ilk günlərindən müxtəlif xarici ölkələrdən ermənilərin köçürülməsinə başlanmışdı. Ermənistan SSR-ə*

*xaricdən 230000 erməni köçürülüb. Daxil olan məlumatlara əsasən Yaxın və Orta Şərqdən (İran, Suriya, Livan, İraq, İordaniya) Ermənistan SSR-ə köçmək istəyənlər var. Köçürmənin vacib siyasi əhəmiyyətini nəzərə alaraq, Ermənistan KP MK xahiş edir ki, 20 iyun 1985-ci il tarixli SSRİ Nazirlər Sovetinin «1985–1986-cı illərdə xaricdən ermənilərin SSRİ-yə repatriasiyasının–köçürülməsinin davam etdirilməsi haqqında» qərarının vaxtı 1990-cı ilə qədər uzadılsın».*

Ermənistan KP MK-nın katibi Karen Dəmirçyan (8).

Bu sənəd göstərir ki, hələ çar Rusiyası dövründə başlanmış xaricdən ermənilərin Ermənistan ərazisinə köçürülməsi və əksinə, azərbaycanlıların Ermənistandan qovulması siyasəti Qorbaçovun hakimiyyətə gəlməsi ilə 1985-ci ildə aktuallaşmışdı. Bu proses Türkiyənin türkdilli sovet respublikaları ilə coğrafi əlaqələrini kəsmək məqsədi daşıyırdı. Yeri gəlmişkən, Silva Kaputikyan və Zori Balayan Mixail Qorbaçovla fevralın 26-dakı görüşündə məhz məsələnin geosiyasi aspektini də müzakirə etmişdilər. Tomas de Vaal öz kitabında Zori Balayanın Qorbaçovla görüşünü təsvir edən yazısından sitat gətirir. Balayan yazır: «O bizi 1 saatdan artıq dinlədi. Biz hər şey haqqında danışırdıq. Silva Sovet İttifaqının Türkiyədə çap olunmuş xəritəsini çıxardı. Bu xəritədə Sovet İttifaqının bütün ərazisi, mən Cənubi Qafqazı, Volqaboyunu, Şimali Qafqazı, Orta Asiyanı, Yakutiyanı, muxtar respublikaların çoxunu nəzərdə tuturam, yaşıl rəngə boyanmışdı. Türkiyədə bu xəritə üzrə orta məktəbdə uşaqlara dərs keçirlər, onlara deyirlər ki, Ermənistan da daxil olmaqla bütün bunlar türk əraziləridir. Biz xəritəni onun stolunun üstünə sərib Qorbaçova göstərdik. Qorbaçov onu kənara çəkdi, daha sonra bizim tərəfə qoydu və dedi: «Bu ki, sayıqlama, sərsəmlikdir». Mən ona cavab verdim: «Mixail Sergeyeviç, sərsəm ideyalar bəzən həyata keçirilir» (207, 51).

Xaricdəki ermənilərin Ermənistana köçürülməsi sovet rəhbərliyi və Ermənistan üçün ciddi problem deyildi. Ancaq onların yerləşdirilməsi və azərbaycanlıların qovulması problemi var idi. Bu iki problem bir-birindən asılı idi. Köçürülən erməniləri yerləşdirmək üçün azərbaycanlıları qovmaq, onları kütləvi şəkildə qovmaq üçün isə ermənilərlə azərbaycanlılar arasında qan davası salmaq lazım idi. Dağlıq Qarabağ münaqişəsi və Sumqayıt talanı bunun üçün əlverişli atmosferi təmin edirdi. Bu hər iki tərəfin maraqlarına cavab verirdi. Moskva Azərbaycanla Türkiyə ara-

sında azərbaycanlıların kompakt yaşadıqları ərazini ləğv edir və həmin ərazini Türkiyəyə düşmən ermənilərlə məskunlaşdırır, eyni zamanda münaqişə ocağı yaratmaqla Azərbaycanın qərbə, avroatlantik məkana doğru ən qısa yolunu bağlayırdı. Ermənilər isə Dağlıq Qarabağı Ermənistana birləşdirmək imkanı qazanırdılar. Ancaq SSRİ rəhbərliyi azərbaycanlıların Ermənistandan qovulmasında qazandıqlarının sərhəd dəyişiklikləri nəticəsində uduzmalı olacaqlarını kompensasiya edə bilməyəcəyini başa düşürdü. Odur ki, Dağlıq Qarabağ münaqişəsini Ermənistanın xeyrinə birdəfəlik həll etmək fikrindən də uzaq idi. Bunun SSRİ-ni sürətli dağılmağa apardığını bildikləri üçün Qorbaçov və komandası bu missiyanı açıq-aşkar yerinə yetirməkdən imtina etdilər.

Başqa tərəfdən, xaricdən köçüb gələn ermənilər Ermənistanda torpaq istəyir, daha yaxşı həyat tələb edirdilər. Problem onda idi ki, onlar torpaq və yaxşı həyatı Dağlıq Qarabağın Ermənistana birləşdirilməsində, rəhbərlik isə azərbaycanlıların qovulmasında görürdülər.

1946-cı ildə o zaman Azərbaycan Dövlət Təhlükəsizlik naziri olmuş Yemelyanov tamamilə məxfi qrifi ilə işarələnmiş hesabatında DQMV-də erməni ziyalılarının neqativ ovqatı haqda yazırdı ki, Azərbaycan Pedoqoji İnstitutunun müəllimi Qurgen Antonyan deyib ki, Suriyadan gələn ermənilər orada hər şeylərini sataraq bütün kapitallarını bura gətiriblər və onlar bütün vəsaitlərini 50 gün ərzində xərcləyəcəklər. Əgər onlar bilsəydilər ki, bizdə həyat necədir, onlar heç bir halda gəlməzdilər və başa düşərdilər ki, onları aldadıblar. Onun hesabatında habelə erməni ziyalılarının DQ-ın Ermənistana birləşdirilməsi nəticəsində həyatın yaxşılaşacağına inamı əks olunub.

Ermənilərin torpaq ələ keçirmək arzuları haqda Filip Bobkov da yazır: «Sumqayıtdakı dəhşətli gecədən sonra mən bir erməni qadınla söhbət etdim. O dedi: «Siz elə bilirsiniz orada Ermənistandakı ziyalılar bizim haqqımızda düşünürlər? Onlar torpaq haqda düşünürlər. Qarabağ onlara bu məqsədlə lazımdır» (89, 297).

Filip Bobkov yazır: «Mən Moskvaya gəlmiş Ermənistan Nazirlər Soveti sədrinin keçmiş 1-ci müavini Armen Kirokosyanla görüşdüm. Kirokosyan uzun-uzadı Qarabağ məsələsini ermənilərin xeyrinə həll etməyin vacibliyi haqda danışaraq əsas arqumentini səsləndirdi: «Bizə torpaq çox vacib lazımdır. Torpaq az olduğuna görə ermənilər Ermənistanı tərk edirlər». Bobkovun «bunun nəyi pisdir ki?» sualına Kirokosyan cavab ver-

mişdi: «Bəs necə, millət dağılıb gedir. Ermənilərin Sovet İttifaqının digər rayonlarına köçməsinin qabağını almaq üçün bizə torpaq lazımdır» (89, 298). Belə görünür ki, azərbaycanlıların Ermənistandan qovulması Moskvanın ikiəsrlik köçürmə və geosiyasi problemləri həll etmə siyasəti ilə ermənilərin torpaq əldə etmə marağı üst-üstə düşürdü. Ancaq təkcə Moskva ilə Yerevanın maraqları üst-üstə düşmürdü. Ermənistanın kommunist partiyası ilə millətçi «Daşnaksütyun»un da maraqları üst-üstə düşürdü. Həmin dövrdə bütün xaricdəki və daxildəki ermənilər və Moskva Azərbaycana qarşı birləşmişdilər. Filip Bobkov yazırdı ki, Dağlıq Qarabağa dair «partiya təşkilatlarının qərarı Ermənistan kommunistlərini Qarabağ komitəsindən olan millətçi elementlərlə birləşdirmişdi (89, 295). Bu birliyi təcavüzkar separatçı təşkilat olan «Qarabağ» komitəsinin koordinatoru İqor Muradyan da bütün çıxışlarında təsdiqləyirdi.

Sumqayıtda məlum təxribatı törətməklə ermənilər Azərbaycanın əzəli torpağı olan Dağlıq Qarabağı ələ keçirmək və azərbaycanlıları öz ata-baba torpaqlarından qovaraq Ermənistanı monoetnik dövlətə çevirmək kimi uzunmüddətli strateji məqsədlərinə nail oldular.

Sumqayıt hadisələrindən sonra Sovet rəhbərliyinin loyal münasibətindən ruhlanan Ermənistan Dağlıq Qarabağın ilhaqını həyata keçirmək üçün bir sıra hüquqazidd siyasi qərarlar qəbul etdi. Təbii ki, Azərbaycan da buna etiraz edərək müəyyən addımlar atmağa məcbur oldu. Bununla da, Tomas de Vaalın yazdığı kimi «qanunlar müharibəsi» başlandı. 1988-ci il iyunun 15-də Ermənistan SSR Ali Soveti DQMV-nin Ermənistan SSR-in tərkibinə daxil edilməsi haqqında qərar qəbul etdi. Öz növbəsində Azərbaycan SSR Ali Soveti iyunun 17-də SSRİ Konstitusiyasının 78-ci və Azərbaycan SSR Konstitusiyasının 70-ci maddələrinə əsaslanaraq Ermənistan SSR Ali Sovetinin bu qərarını qanunazidd və yolverilməz adlandırdı. 1988-ci il iyulun 12-də DQMV-in Xalq Deputatları Sovetinin birtərəfli qaydada Azərbaycan SSR-in tərkibindən çıxmaq haqqında qərarını da Azərbaycanın ali qanunvericilik orqanı qeyri-qanuni və hüquqazidd adlandıraraq ləğv etdi. SSRİ Ali Soveti Rəyasət Heyəti iyulun 18-də keçirilmiş iclasında milli-ərazi bölgüsünün dəyişilməsinin mümkünsüzlüyünü təsdiq etsə də, on gün sonra – iyulun 28-də vilayətdə fövqəladə vəziyyət tətbiq etməklə, orada yaşayan azərbaycanlıların qovulmasının əsasını qoydu. SSRİ ali rəhbərliyi bir müddətdən sonra Azərbaycanın ərazi bütövlüyünə qarşı daha bir addım ataraq, 1989-cu il yanvarın 12-də

Arkadi Volskinin başçılığı ilə DQMV-də Xüsusi İdarəetmə Komitəsi yaratdı. Bununla muxtar vilayət faktik olaraq Azərbaycanın nəzarətindən çıxmış oldu.

Həmin il dekabrın 1-də Ermənistan SSR Ali Soveti DQMV-in Ermənistan SSR-ə birləşdirilməsi haqqında qərar verdi, 9 yanvar 1990-cı ildə isə muxtar vilayəti respublikanın iqtisadi planına daxil etdi. SSRİ Ali Sovetinin Rəyasət Heyəti Ermənistanın bu qərarlarının qanunazidd olması haqqında yanvarın 10-da qərar versə də, bu qərar da digər qərarlar kimi kağız üzərində qaldı. 1989-cu ilin sonlarında Ermənistan Respublikasının rəhbərliyi burada yaşayan sonuncu azərbaycanlını da qovmaqla etnik təmizləmə siyasətini başa çatdırdı. Bununla da «türksüz Ermənistan» haqqında daşnakların proqramının birinci hissəsi tam həyata keçirildi. Bundan sonra proqramın ikinci mərhələsinə – Azərbaycan ərazilərinin işğalına başlanıldı. 1988-ci ilin fevralından 1994-cü ilin mayına qədərki Qarabağ müharibəsində ermənilər Azərbaycan ərazisinin 20 faizə qədərini işğal etmiş, 946 yaşayış məskənini ələ keçirmiş, 20000 vətəndaşımızı qətlə yetirmişlər. İndiki Ermənistan Respublikasının ərazisindən və işğal edilmiş ərazilərdən 1 milyondan çox əhali qaçqın düşmüşdür. Azərbaycanın iqtisadiyyatına, sənayesinə, sosial-mədəni həyatına çox ciddi ziyan vurulmuşdur (103, 143–144). Bütün bunlar Sumqayıt fitnəkarlığının real siyasi-hərbi nəticələridir.

## NƏTİCƏ

Azərbaycanlılara qarşı müntəzəm olaraq həyata keçirilən bədnam soyqırımı siyasətinin tarixi yüz illərlə ölçülür. XIX əsrin əvvəllərindən başlayaraq Rusiyanın Cənubi Qafqazı işğal etməsi ilə ermənilər kütləvi şəkildə Azərbaycan torpaqlarında məskunlaşdırılmağa başlamış, azərbaycanlıların öz qədim torpaqlarından, ata-baba yurdundan qovulması, deportasiyası prosesi məqsədyönlü şəkildə həyata keçirilmişdir. Sərsəm «Böyük Ermənistan» ideyasını gerçəkləşdirmək üçün saxta ideoloji tezislər formalaşdırılmış, terrorçu təşkilatlar qurulmuşdur. Erməni əhalisi türk və Azərbaycan xalqına qarşı daim millətçilik, şovinizm ruhunda tərbiyə olunmuşdur. Ermənilərin yaratdıqları dövlət – Ermənistan Respublikası da qədim Azərbaycan torpağında – İrəvan quberniyası ərazisində təşkil olunmuşdur (4, 33 cild, 249).

Soyqırımı və deportasiya siyasəti sovet hakimiyyəti illərində daha incə və məkrli şəkildə davam etdirilmişdir. Tarixi Azərbaycan torpaqları olan Göyçə, Vedibasar, Zəngəzur və digər ərazilər o zamankı sovet rəhbərliyi tərəfindən Ermənistana verilmiş, bununla da, Azərbaycanın qədim ərazisi olan Naxçıvan blokada vəziyyətinə düşmüşdür. Yuxarı Qarabağda ermənilər üçün muxtariyyətin – qondarma Dağlıq Qarabağ Muxtar Vilayətinin yaradılması sovet rəhbərliyinin Azərbaycana qarşı xəyanətkar planının tərkib hissəsi olmuşdur. Bununla da, ermənilərin Azərbaycana qarşı ərazi iddiaları üçün zəmin yaradılmışdır.

1980-ci illərin ortalarında M.S.Qorbaçovun həyata keçirdiyi «yenidənqurma» siyasəti erməni şovinizminin yenidən dirçəlməsinə və daha həyasız xarakter almasına rəvac verdi. Ermənilər daha fəal və təhlükəli şəkildə ekstremizm və separatizm siyasəti yürütməyə başladılar. Çox təəssüf ki, erməni separatizmi o dövrdə SSRİ-nin ən yüksək dairələrində siyasi və mənəvi dəstək alır və qızışdırılırdı. Sonradan Azərbaycan əleyhinə genişmiqyaslı müharibəyə çevrilmiş bu avantürist separatizm nəticəsində azərbaycanlılar Ermənistan SSR-dən, öz tarixi torpaqlarından tamamilə deportasiya edilmiş, Azərbaycan torpaqları işğal edilmiş, on minlərlə insan faciəli şəkildə məhv edilmiş, yüz minlərlə soydaşımız qaçqın və köçkün ömrünü yaşamağa məhkum edilmişdir.

Ermənilərin öz havadarlarının dəstəyindən bəhrələnərək həyata keçirdikləri antiazərbaycan təbliğatına o zamankı Azərbaycan rəhbərliyinin vaxtında layiqli qiymət verməməsi onların daha da həyasızlaşmasına, mövqelərimizi tədricən itirməyimizə səbəb oldu. Sovet imperiyasının dağılacağını əvvəlcədən bilən ermənilər, bundan istifadə etmək, bəhrələnmək, Azərbaycanın yeni ərazilərini ələ keçirmək üçün ideoloji-siyasi, eləcə də hərbi hazırlıq görmüşdülər.

Soyqırımı, deportasiya Azərbaycan xalqına böyük siyasi, maddi və mənəvi zərbələr vurmuşdur. Bütövlükdə XIX əsr ərzində iki milyona yaxın azərbaycanlı bu siyasətin ağır nəticələrini öz üzərində hiss etmişdir.

1990-cı ilin yanvarında SSRİ-nin o zamankı rəhbərliyi erməni separatçılarının fitnəkarlığına uyaraq xalqımıza qarşı qanlı qırğın törətmişdi. 1992-ci ilin fevralında isə sovet qoşunlarının köməyi ilə erməni hərbi birləşmələri Xocalı şəhərinə hücum edərək bəşər tarixində görünməmiş qəddarlıqla heç bir hərbi zərurət olmadan minlərlə dinc sakinə qarşı soyqırımı həyata keçirmişlər.

Azərbaycan xalqının böyük oğlu, görkəmli dövlət xadimi Heydər Əliyev göstərirdi ki, erməni millətçiləri və şovinistləri «Böyük Ermənistan» xülyalarını həyata keçirmək üçün lap əvvəlcədən xalqımıza və ölkəmizə qarşı ustalıqla və davamlı surətdə informasiya və təbliğat müharibəsi aparmışlar. Həmin qarayaxma kampaniyası, çirkin təbliğat bu gün də davam edir. Ən müxtəlif üsul və vasitələrdən istifadə edən erməni şovinistləri dünya ictimaiyyətinin fikrini qarışdırır, Azərbaycanın, ümumiyyətlə, bütün Qafqazın tarixini saxtalaşdırır, azərbaycanlılara qarşı məkrli təcavüz kampaniyası aparır, dünya ictimaiyyətinin nəzərində «əzabkeş, məzlum erməni xalqı» obrazı yaradırlar. Erməni işğalçıları, erməni lobbisi bu istiqamətdə on illər boyu ardıcıl iş aparır. Nəticədə, ermənilərin Azərbaycan xalqına qarşı bu gün törətdiyi işğal və soyqırımı faktlarına biganə qalan dünya dövlətlərinin parlamentləri, guya, yüz il əvvəl baş verdiyi iddia edilən hadisələr barədə yanlış siyasi konyukturaya uyğunlaşdırılmış qərarlar qəbul edir, faktiki olaraq öz hərəkətləri ilə təcavüzkarları şirnikləndirirlər. Öz müvəqqəti və aldadıcı uğurlarından vəcdə gələn erməni siyasətçiləri və ideoloqları, bütöv xalqlara nifrət ideologiyasının açıq və maskalanmış daşıyıcıları beynəlxalq hüquq normalarına meydan oxuyur, planetimizdə bərqərar olmuş sivil birgəyaşayış normalarını kobudcasına pozurlar (24, 33-cü cild, 250–251).

Bu hadisələri, onların dərslərini unutmağa bizim haqqımız yoxdur, çünki unutqanlıq yeni faciələrin törənməsi ilə nəticələnir. Tarixi yaddaşsızlıq və unutqanlıq xalqımıza baha başa gəlmiş və gəlir. Azərbaycanlılara qarşı zaman-zaman törədilən bu ağır cinayətləri unutmamaq, gələcək nəsilləri bədnam qüvvələrə və onların məkrli niyyətlərinə qarşı ayıq-sayıq ruhda tərbiyə etmək mühüm milli vəzifədir.

Sumqayıt hadisələrinin tədqiqi, çoxsaylı sənədlərin və materialların təhlili sübut edir ki, bu hadisələr erməni millətçiliyinin Azərbaycana qarşı incəliklə həyata keçirdiyi təxribatıdır. Bu təxribatı həyata keçirməklə, onlar Azərbaycan torpaqlarının işğalı üçün ideoloji-siyasi zəmin yaratdılar. Məqsəd də aydın idi – bütün dünya ictimaiyyətində azərbaycanlıların vəhşi obrazını yaratmaq, «dünyanın ən mədəni xalqlarından» olan xristian ermənilərin onlarla birgə yaşamasının mümkünsüzlüyü haqqında rəy formalaşdırmaq. Elə bu məqsədlə də erməni vandalları ən antibəşəri üsullardan istifadə etmiş, hətta öz soydaşlarının qanını tökməklə, öldürülmüş ermənilərdən siyasi-milli ambisiyaları üçün yararlanmağa çalışmışlar.

Faktlar sübut edir ki, iğtişaş və talanların qarşısını elə ilk gündən almaq mümkün olsa da, bunu etmək üçün heç bir addım atılmamış, bununla da, faciənin miqyasının genişlənməsinə şərait yaranmış, azərbaycanlıları fakt qarşısında qoymuşlar. Bu faciəni təşkil edənlər də, ən fəal şəkildə həyata keçirənlər də, məhz ermənilərin özləri olmuşlar. İstintaq materiallarından birmənalı şəkildə aydın olur ki, cinayəti həyata keçirməkdə əsas rollardan birini oynamış Eduard Qriqoryan bu cinayətləri xeyli əvvəl planlaşdırmış və bu barədə yaxın adamlarına bildirmişdir. Araşdırmalar zamanı müəyyən edilmişdir ki, Sumqayıtda baş verən hadisələr dövründə ermənilər öz soydaşlarına qarşı qəsdən və xüsusi məqsədlə təxribatlar törədib, sonradan həmin cinayətlərdə azərbaycanlıları ittiham etməyə çalışmışlar. Lakin bu hadisələr Azərbaycan xalqının müdrikliyinin, insanpərvərliyinin əsl təzahürü oldu. Həmin günlərdə yüz minlərlə azərbaycanlı öz həyatlarını təhlükəyə ataraq erməni millətindən olan vətəndaşları xilas etmişlər.

Sumqayıt hadisələrindən sonra ermənilər dünya və SSRİ miqyasında geniş antiazərbaycan kampaniyasına başlamaqla həmin hadisələrin arxasında hansı niyyətlərin durduğunu bir daha təsdiq etmiş oldular. Çox təəssüf ki, həmin şəraitdə dünya birliyində Azərbaycan haqqında obyektiv məlumatların, lobbiçilik, diaspor dəstəyinin olmaması müəyyən mənada Azərbaycan haqqında neqativ ictimai rəyin formalaşmasının qarşısını ala bilmədi.

Bu hadisələr zamanı Azərbaycanın o zamankı rəhbərliyi də milli maraqlara uyğun cəsarətli mövqe nümayiş etdirə bilmədi. Hadisələrin yedəyində sürünərək ermənilərin antiazərbaycan təbliğatına və separatist hərəkətlərinə lazımi reaksiya verə bilmədi. Bunun əsas səbəblərindən biri də rəhbərlikdə milli maraqları hər şeydən üstün tuta bilən, milləti birləşdirmək iqtidarında olan liderin olmaması idi.

Sumqayıt hadisələrinin baş verməsinin əsas səbəblərindən biri də o zamankı SSRİ rəhbərliyində mövcud olan qarşıdurmalar, nüfuz davası idi. Nəticədə, həm yenidənqurma tərəfdarı olan liberallar, həm də köhnə qaydaların qaytarılmasına çalışan mühafizəkarlar Sumqayıt hadisələrindən öz mənafeləri üçün istifadə etməyə səy göstərmiş, bu fitnəkarlığın araşdırılmasında, həqiqətin üzə çıxarılmasında maraqlı olmamışlar. İstintaqın birtərəfli və qərəzli aparılması cinayətin əsl təşkilatçılarının üzə çıxarılmasında istintaq rəhbərliyinin maraqlı olmamasını bir daha təsdiq edir. Nəticədə, Sumqayıt bütün ölkədə qeyri-sabitliyin inkişafında

mühüm mərhələ oldu, SSRİ kimi böyük imperiyanın süqutunu tezləşdirən amilə çevrildi. Mərkəzdəki ermənilərin və ermənipərəst qüvvələrin Sumqayıt hadisələrindən sonra antiazərbaycan mövqeləri daha da sərtləşdi. Məhz Sumqayıt hadisələrindən sonra Ermənistan Dağlıq Qarabağı zəbt etmək üçün açıq fəaliyyətə başladı. Ermənistan və Dağlıq Qarabağda radikal millətçilərin mövqeləri də xeyli möhkəmlənmiş oldu. Dünyanın iri dövlətlərinin, birinci növbədə ABŞ-ın erməni lobbisinin təsiri altında açıq-aşkar Azəbaycan əleyhinə yönəlmiş bir sıra qərarlar qəbul etməsi də Sumqayıtın yaratdığı əks-səda idi.

Beləliklə, Sumqayıt təxribatı ermənilərin Azərbaycan torpaqlarını ələ keçirmək, azərbaycanlıları öz doğma yurd-yuvalarından deportasiya etmək kimi strateji məqsədlərini həyata keçirməkdə həlledici məqam oldu. Azərbaycan torpaqlarının işğalı, milyonlarla insanın qaçqın düşməsi Sumqayıt hadisələrinin real nəticəsidir. Ermənilər bu gün də məqsədlərinə nail olmaq üçün bütün mümkün və qeyri-mümkün vasitələrdən istifadə edir, tarixi hadisələri saxtalaşdırmaqda davam edirlər. 1988-ci ildə baş vermiş Sumqayıt hadisələri bu gün də erməni faşist təbliğatının ən «sevimli» mövzularından biri olaraq qalmaqdadır. Erməni millətçiləri xalqımıza qara yaxmaq, onun imicinə zərər yetirmək üçün Sumqayıt amilini «fırlatmaq»da davam edirlər. Ermənistan hakimiyyəti, erməni lobbisi hər il Sumqayıtda erməni xalqının genosidə məruz qalması haqqında məsələni gündəmə gətirir, dünya ölkələrinin parlamentlərində bu məsələyə münasibət bildirməyi tələb edirlər. Bu, Azərbaycan elminin, publisistikasının nümayəndələrindən daha ayıq-sayıq olmağı, həqiqəti üzə çıxarmaq və yaymaq üçün daha səylə fəaliyyət göstərməyi tələb edir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin qeyd etdiyi kimi, artıq informasiya müharibəsində müdafiədən hücuma keçməyin vaxtı çatmışdır. Dağlıq Qarabağ, Sumqayıt hadisələri haqqında həqiqətlərin dünya ictimaiyyətinə çatdırılması üçün bütün imkanlardan istifadə edilməlidir. Bu, Azərbaycanın dövlət, qeyri-dövlət qurumlarının, ideoloji institutlarının, kütləvi informasiya vasitələrinin, diplomatik nümayəndələrinin, bir sözlə, hər bir kəsin ümdə vəzifəsi olmalıdır. Sumqayıt hadisələri göstərdi ki, milli birliyin, hakimiyyətlə xalqın həmrəyliyinin olmaması, hamını milli ideya və maraqlar ətrafında birləşdirən liderin olmaması milləti ən ağır faciələrə gətirib çıxarır. Sumqayıt hadisələrinin ən böyük ibrət dərsi məhz bundan ibarətdir.

## ƏDƏBİYYAT


1. **Abdullayev Ə.İ.** Ermənistanın Azərbaycana qarşı təcavüzkarlıq siyasəti (XIX əsrin sonları – XX əsr). Bakı, «Elm», 1998-ci il, 472 s.
2. **Alıyev H.A.** Sumqayıt şəhərinin tarixi. Bakı, «Elm və təhsil», 2011-ci il, 544 s.

2a. **Axundova E.** Şəxsiyyət və zaman. Bakı, «Ozan», 2007, 784 s.

3. Azərbaycan qəzeti.
4. Azərbaycan beynəlxalq aləmdə. 3 cilddə, III cild. Bakı, 1998-ci il, 776 s.
5. Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası. 2 cilddə, Bakı, «Lider», 2004–2005-ci illər.
6. Azərbaycan KP MK-nın «Sumqayıt şəhər partiya komitəsi bürosunun əhali arasında təşkilatçılıq işində böyük nöqsanları, siyasi naşılığı və şəhərdə faciəli hadisələrin qarşısını almaqda fəaliyyətsizliyi haqqında» qərarı. «Kommunist» qəzeti, 1988-ci il 19 mart.
7. Azərbaycan Respublikası. 1991–2001-ci il. Bakı, «Elm», 1991-ci il, 145 s.
8. Azərbaycan Respublikası MTN arxivi. Sumqayıt hadisələrinə dair sənədlər.
9. Azərbaycan Respublika Prezidentinin İşlər İdarəsinin Siyasi Sənədlər tarixi (ARPİİASSA). F. 1, s. 83, iş. 59.
10. ARPİİASSA. F. 1, s. 83, iş. 65.
11. Azərbaycan Respublikası Prokurorluğunun arxivi, 18/55461-88 №-li cinayət işinin materialları.
12. Azərbaycan tarixi, 7 cilddə, VII cild. Bakı, «Elm», 2008-ci il, 605 s.
13. Azərbaycan tarixi sənədlər və nəşrlər üzrə. Bakı, «Elm», 1990-cı il, 381 s.
14. Azərbaycan Televiziyası və Radiosu Qapalı Səhmdar Cəmiyyətinin (Azteleradio QSC) videoarxivi. «Sovet imperiyasının gizlinləri – Qriqoryanın işi» sənədli film – I hissə. Qovluq 301099, rulon 4500.
15. «Azteleradio» QSC-nin videoarxivi. «Sovet imperiyasının gizlinləri – Qriqoryanın işi» sənədli filmi – II hissə. Qovluq 301100, rulon 4506.
16. «Azteleradio» QSC-nin videoarxivi. «Sovet imperiyasının gizlinləri – Qriqoryanın işi» sənədli filmi – III hissə. Qovluq 301100, rulon 4506.
17. Azərbaycanlıların soyqırımı haqqında Azərbaycan Respublikası Prezidentinin fərmanı, 26 mart 1998-ci il. «Azərbaycan» qəzeti, 27 mart 1998-ci il.
18. Dağlıq diyarın iqtisadiyyatı. «Kommunist», 1988-ci il 24 fevral.
19. Dağlıq Qarabağ. Zəka qalib gələcək. Bakı, «Azərnəşr», 1973-cü il, 464 s.
20. Dağlıq Qarabağ Muxtar Vilayəti 50 ildə. Bakı, «Azərnəşr», 1973-cü il, 102 s.
21. Dağlıq Qarabağdakı hadisələrə dair. Sov. İKP MK-nın Siyasi bürosunun 21 fevral 1988-ci il tarixli qərarı. «Kommunist», 1988-ci il 24 fevral.
22. Dağlıq Qarabağ hadisələrinin xronikası. Azərbaycan Respublikası DİN, Bakı, 2005-ci il, 175 s.

23. Ermənilərin Xəzəryanı vilayətlərdə məskunlaşması, onların mehriban qarşılanması yerlərdə onlara torpaqların ayrılması haqqında. Ali fərman, 10 noyabr 1724-cü il (Ruscadan tərcümə).
24. **Əliyev H.** Müstəqilliyimiz əbədidir. Çıxışlar, nitqlər, bəyanatlar, məktublar, müraciətlər. 34 cilddə. Bakı, «Azərnəşr», 1997–2012-ci illər.
25. **Əliyev İ.H.** 2012-ci il mayın 10-da Bakıda Heydər Əliyev Mərkəzinin açılışında, ulu öndərin anadan olmasının 89-cu ildönümü və Heydər Əliyev Fondunun fəaliyyətə başlamasının 8 illiyi münasibətilə təntənəli mərasimdə çıxış. «Azərbaycan» qəzeti, 2012-ci il 11 may.
26. **Əliyev İ.** Respublika günü münasibəti ilə təntənəli mərasimdə çıxış, 25 may 2012-ci il. «Azərbaycan» qəzeti, 2012-ci il 27 may.
27. **Həsənli C.Q.** Azərbaycanda milli-siyasi rəhbərlik və ziyalılar, 1954–1959. Bakı, «Adiloğlu», 2008-ci il, 542 s.
28. **Xəlilzadə F.** Təşkilatçılar və icraçılar erməni olmuşdur. Sumqayıt hadisələri // «Azərbaycan» qəzeti, 2005-ci il 1 mart.
29. **İmanov R.S.** Azərbaycanın ərazi bütövlüyünə qəsd – qondarma DQMV-i. Bakı, «Adiloğlu», 2005-ci il, 259 s.
30. **İsmayılov A.** Sumqayıt – SSRİ-nin süqutunun başlanğıcı. Bakı, «Çaşıoğlu», 2010-cu il, 204 s.
31. İstintaq aparılır // «Kommunist», 1988-ci il 11 mart.
32. «Kommunist» qəzeti.
33. **Köçərli T.K.** Erməni saxtakarlığı. Bakı, «Şərq-Qərb», 2002-ci il, 80 s.
34. **Köçərli T.K.** Qarabağ: Qarabağ tarixinin saxtalaşdırılması əleyhinə. Bakı, «Elm», 2000-ci il, 472 s.
35. Qarabağnamələr. Bakı, «Şərq-Qərb», II kitab, 2006-cı il, 286 s.
36. **Qaffarov T.** Azərbaycanın ən yeni tarixi XX əsrin sonları – XXI əsrin əvvəlləri. Bakı, GİSO Enterpise, 2005-ci il, 275 s.
37. Qafqazda erməni məsələsi. Rusiya arxiv sənədləri və nəşrləri üzrə.
38. **Qasımov Ə.** Heydər Əliyevin inkişaf strategiyası və Naxçıvan Muxtar Respublikası (XX əsrin 70-80-ci illəri). Bakı, «Təhsil», 2009-cu il, 320 s.
39. **Qaziyev Y.** Erməni məsələsi. Bakı, Qafqaz Universiteti, 2009-cı il, 343 s.
40. **Qeybullayev Q.** Qarabağın etnik və siyasi tarixinə dair. Bakı, «Elm», 1990-cı il, 248 s.
41. **Qəhrəmanov N.F.** Sumqayıt hadisələri: həqiqətin bir üzü var // «Respublika» qəzeti, 2001-ci il 1 mart.
42. **Qəhrəmanov N.F.** Sumqayıt hadisələrinə siyasi qiymət verilməlidir // Sumqayıt hadisələri: həqiqəti indiki və gələcək nəsillərə. Konfrans materialları. // Sumqayıt, 2001-ci il, s. 4–10.
43. **Mahmudov Y.M., Şükurov K.K.** Qarabağ: Real tarix, faktlar, sənədlər. Bakı, «Təhsil», 2005-ci il, 380 s.
44. **Mehdixanlı T.** Qarabağı işğala aparan yol // Sumqayıt hadisələri. Azərbaycan, 2003-cü il 20 fevral.
45. **Mehdiyev R.** Azərbaycanlılara qarşı soyqırımı gerçəklikləri. Bakı, 2000-ci il.
46. **Məmmədov E.** Erməni təxribatı. Faktlar və mülahizələr. Bakı, «Mütərcim», 2005-ci il, 64 s.
47. **Məmmədov E.** İkinci paralel. Sumqayıtın tarixinə dair. Sumqayıt, 2000-ci il, 116 s.

48. **Məmmədov E.** 28-29-na keçən gecə 1988-ci il fevral ayında Sumqayıtda baş vermiş hadisələr haqqında. Sumqayıt, 1998-ci il, 141 s.
49. **Məmmədov E.** Sumqayıtda törədilən iğtişaş mətbuat səhifələrində // Azərbaycan, 2011-ci il 23 fevral.
50. **Məmmədov İ., Əsədov S.** Ermənistan azərbaycanlıları və onların acı taleyi. Bakı, «Azərbaycan», 1992-ci il, 72 s.
51. **Məmmədov N.** Azərbaycan SSR-in Dağlıq Qarabağ Muxtar Vilayətinin tarixi (1923-1991) tarix elmləri doktoru elmi dərəcəsi olmaq üçün təqdim olunmuş dissertasiyanın avtoreferatı. Bakı, 2011-ci il, 63 s.
52. 1948-1953-cü illərdə azərbaycanlıların Ermənistan SSR ərazisindəki tarixi torpaqlarından kütləvi deportasiyası haqqında Azərbaycan Respublikası Prezidentinin Fərmanı, 18 dekabr 1997-ci il. «Azərbaycan» qəzeti, 1997-ci il 19 dekabr.
53. **Mustafa N.** Sumqayıt hadisələri M.Qorbaçovun razılığı və SSRİ DTK-nın nəzarəti altında törədilmişdir // «Xalq» qəzeti, 2003-cü il 28 fevral.
54. Naxçıvan statistika güzgüsündə. Tarixi-statistik məcmuə. Bakı, «Səda», 1999-cu il, 128 s.
55. **Paşayev A.Ə.** Açılmamış səhifələrin izi ilə. Bakı, «Azərbaycan», 2001-ci il, 536 s.
56. **Pompeyev Y.** Qarabağ qan içində. Bakı, AEA nəşriyyat, 1996-cı il, 158 s.
57. Rusiyanın Van və Ərzurumdakı baş konsulu Mayevskinin xatirələri. Bakı, «Şərq-Qərb», 1994-cü il, 38 s.
58. **Sadıqov H.S., Məmmədov R.S.** Sumqayıt milli əsarət və ya milli səxavət? Sumqayıt, «Şirvannəşr», 2004-cü il, 160 s.
59. **Süleymanoğlu R.** Sumqayıtdakı təxribat erməni ssenarisi əsasında baş verdi. // Azərbaycan, 2006-cı il 1 mart.
60. **Sultanov O.** 80-ci illərin sonu – 90-cı illərin əvvəllərində Azərbaycanda siyasi mübarizə. Bakı, «Maarif», 1995-ci il, 232 s.
61. Sumqayıt: prokurorluq istintaqı davam etdirir // «Kommunist», 1988-ci il 19 avqust.
62. Sumqayıt hadisələri: həqiqəti indiki və gələcək nəsillərə / Elmi-praktik konfransın materialları. Sumqayıt. SDU, 2001-ci il, 66 s.
63. Sumqayıtda məhkəmə // Sosialist Sumqayıt qəzeti, 1988-ci il 12 may.
64. Sumqayıtda vəziyyətə dair (Dağlıq Qarabağ hadisələri ilə əlaqədar Sumqayıt şəhərində baş verən qeyri-hüquqi hərəkətlərin aradan qaldırılması haqqında). «Kommunist», 1988-ci il 3 mart.
65. Yeni yollar axtarmalı, ləngitmə mexanizmini ləğv etməli. Sumqayıt şəhəri partiya komitəsinin plenumundan. «Kommunist» qəzeti, 1988-ci il 20 yanvar.
66. **Аббасов А., Селимзаде Р.** Город братства. Баку, «Гянджлик», 1987, 91 с.
67. **Абегян М.** История древнеармянской литературы. Ереван, Изд-во АН Арм. ССР, 1975, 601 с.
68. **Авдеев М.Н.** Миграция населения Закавказья за время революции // Жизнь национальностей. Тифлис, 1932, 22 марта.
69. Азербайджан в цифрах в 1990 г. Баку, Госкомстатиздат, 1991, 210 с.
70. **Ализаде З.** Азербайджанская элита и массы в период распада СССР (статьи, мемуары о бурном времени). http: Sakharov.center.ru
71. **Алиев И.Г.** Нагорный Карабах. История, факты и события. Баку, «Элм», 1989, 103 с.
72. **Амшентци Л.** Армянский акцент грузино-абхазского конфликта. http: //abkhazia.narod.ru

